*Bu kitab "**Şah İsmayıl Xətayi**. Keçmə namərd körpüsündən. Şeirlər və poemalar" (Bakı, Yazıçı, 1988) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edənlər: Əliyar Səfərli
Xəlil Yusifli

**Ön sözün müəllifi: Xəlil Yusifli**
**894.3611 - dc 21**
**AZE**

**Şah İsmayıl Xətayi. Əsərləri.** Bakı, "Şərq-Qərb", 2005, 384 səh.

Ulu klassik şairimiz və böyük dövlət xadimi Şah İsmayıl Xətayinin adı XVI əsr Azərbaycan varlığının bütün taleyüklü məsələləri ilə bağlı olaraq iftixar hissi ilə çəkilir. Onun müstəsna qabiliyyəti və ardıcıl qayğısı sayəsində milli dilimizin yad dillərin təsirindən təmizlənməsi və qədim mədəniyyətimizin dirçəlişi başlanmışdır.

Xətayinin ölümsüz poeziyası arıdılmış Azərbaycan dilinin duruluq çeşməsi kimi klassik irsimizin möhtəşəm abidəsidir. Şairin əvəzsiz nəfəs yanğıları öz təmkini, bütövlüyü və sənətkarlıq cilası baxımından söz xəzinəmizin zirvə örnəkləridir.

Kitabda ulu şairimizin əsrlər boyu oxunmuş və təravətini itirməmiş əsərləri toplanmışdır. Başı üstündən əsrlərin acı rüzgarları əsmiş Xətayi poeziyası, inanırıq ki, oxucularına yenə böyük sənət doğmalığı gətirəcək.

ISBN 9952-418-43-1

Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

# ŞAH İSMAYIL XƏTAYİNİN HƏYATI VƏ SƏNƏT DÜNYASI

Görkəmli dövlət xadimi, ana dilində yaranan şerin inkişafına xüsusi qayğı ilə yanaşan, özü bu dildə ölməz sənət inciləri yaradan Şah İsmayıl Xətayi Azərbaycan xalqının ictimai-siyasi və mədəni yüksəlişində müstəsna xidmətləri olan nadir şəxsiyyətlərdəndir. Xalqımızın inkişafının ən mühüm mərhələlərindən biri onun adı ilə bağlıdır. Xətayi doğma zəminə möhkəm bağlı olan bir adam kimi ozan – aşıq sənətinə rəğbətlə yanaşmış, klassik şeir formaları ilə yanaşı xalq şerinin müxtəlif şəkillərində dillər əzbəri ola biləcək əsərlər yaratmışdır.

Bir yandan yazılı ədəbiyyatın, başqa bir yandan xalq yaradıcılığının zəngin ənənələrindən bəhrələnən bu sərkərdə şair ədəbi fəaliyyətində məzmunla formanı həmişə vəhdətdə götürmüş, hər formadan, janrdan, vəzndən yerinə görə istifadə etmişdir. Sadəlik, aydınlıq, səmimilik, həyata, onun tələblərinə dərindən bağlılıq Xətayi poeziyasının səciyyəvi keyfiyyətləridir.

Bu poeziya saf mənəvi aləmin, aydın məfkurənin, sabaha dərin inamın, hər cür şərə odlu nifrətin parlaq ifadəsidir.

Xətayi 1487-ci il iyulun 23-də Ərdəbil şəhərində kökü, izi tarixin çox-çox uzaq çağlarına gedib çıxan nüfuzlu, şöhrətli bir azərbaycanlı ailəsində anadan olmuşdur. Şah İsmayıl ın iyirmi beşinci babası Əbülqasım Həmzənin, on beşinci babası Qızılbörk Firuzun qəbirləri Ərdəbil yaxınlığındakı Şeyx-Kəhrəlan kəndində indi də durur. Yerli əhali bu qəbirlərə bir ziyarətgah kimi baxır.

XIII–XIV əsrlərin sərhədində yaşayan Şeyx Səfiəddin İshaq Ərdəbilinin dövründən fəaliyyətə başlayan Ərdəbil Darül-irşadı nəinki təkcə Azərbaycan miqyasında, bəlkə bütün Yaxın Şərq aləmində gedən elmi, fəlsəfi döyüşlərin ən güclü mərkəzlərindən biri kimi tanınmışdır. Bir yandan xürrəmilik və məzdəkilik, bir başqa yandan sufizmlə bağlı olan, bir çox hallarda qızılbaşlıq adı ilə tanınan səfəviyyə fikri cərəyanı burada formalaşmış, burdan Şərqin bir çox ölkələrinə yayılmışdır. Darül-irşad adi bir təriqət xanəgahı olmaqdan çox zamanın tələblərindən irəli gələn bir fikir və ideologiya ocağı idi. Bu ocağa inamla gələn fədakar sufilər, müridlər vaxtilə Şah İsmayıl ın babası Sultan Cüneydə və atası Sultan Heydərə dayaq olmuş, onlara yeni bir dövlətin bünövrəsini qoymaqda yaxından kömək etmişdilər. Şah İsmayıl ın çox gənc yaşlarında hakimiyyət uğrunda döyüşlərə atılması, istədiyinə nail olub qüdrətli bir Azərbaycan dövləti yaratması onun ulu babalarının çoxəsrlik mübarizə və ənənələri ilə bağlı idi, onların uzun müddət davam edən ardıcıl mübarizələrinin uğurlu nəticəsi və yekunu idi. Bu dövrdə Azərbaycan dövlətinin sərhədləri Qaraqoyunlular və Ağqoyunlular dövründəki sərhədləri aşıb keçsə də, çoxmillətli bir dövlətə çevrilsə də, qaynaqlarda yazıldığı və araşdırmalarda

etiraf olunduğu kimi, “Qızılbaş-Midiya dövləti” kimi tanınırdı. Bu qeyd və etiraflar Şah İsmayıl la başlanan Səfəvilər dövlətinin Azərbaycan torpağında Midiyadan sonra yaranan ən güclü dövlət olduğunu bir daha təsdiq edir.

Bu dövlətin Səfəvilər adlanması isə Xətayinin ulu babalarından olan və çox vaxt sadə şəkildə Şeyx Səfi adlandırılan Şeyx Səfiəddin Ərdəbilinin (1252–1335) adından götürülmüşdür. Hələ XIV əsrdə yaşayıb-yaratmış Azərbaycan şairi Arif Ərdəbili Şeyx Səfidən qürurla danışır, onu “din və millət hamisi” adlandırır, onun qəbrinin Ərdəbil şəhərində olmasını bu şəhər üçün əlçatmaz bir məziyyət kimi qeyd edir.

Xətayi ana tərəfdən də dövrünün hakim və köklü bir ailəsinə mənsub idi.

Onun anası Aləmşah bəyim Ağqoyunlu hökmdarı Uzun Həsənin qızı, Sultan Yəqubun bacısı idi. Ağqoyunluların Səfəvilərlə qohumluq əlaqələri yaratmaları bu sülalənin get-gedə artan nüfuzu ilə əlaqədardır. Ağqoyunlular Səfəvilərlə qohum olmaqla onlardan gələ biləcək təhlükənin qarşısını almaq, yeri gələndə onlardan istifadə etmək məqsədini izləyirdilər. Bu axırıncı cəhət Şeyx Heydərin apardığı uğurlu döyüşlərlə bir daha təsdiq olunurdu. Lakin

Ağqoyunluların Səfəvilərə münasibəti sabit qalmır. Səfəvilərin get-gedə artan güc və qüdrəti onları qorxuya salır. Şeyx Heydər xəyanətlə öldürülür, onun arvadı Aləmşah bəyim isə iki oğlu – Ibrahim və İsmayıl la birlikdə Istəxrdə həbsdə saxlanılır. Sultan Yəqubun ölümündən sonra hakimiyyət uğrunda gedən vuruşmalarda Rüstəm Mirzə Səfəvilərdən istifadə etmək məqsədilə Şeyx Heydərin övladlarını həbsdən azad edir. Ağqoyunlular səhv etdiklərini anladıqları vaxt artıq gec idi. Onlar İsmayıl  və Ibrahimi bir də ələ keçirə bilmirlər.

Şah İsmayıl  Gilan hakimi Həsən xanın himayəsi altında Lələ Hüseyn bəy tərəfindən tərbiyə olunur, qorxmaz bir sərkərdə və həssas düşüncəli bir ziyalı kimi yetişdirilir.

1499-cu ildə Şah İsmayıl  və onun tərəfdarları belə qərara gəlirlər ki, hakimiyyəti ələ almaq uğrunda qəti döyüşlərin vaxtı çatmışdır. Ağqoyunlu şahzadələri arasında hakimiyyət uğrunda gedən didişmələrin kəskinləşməsi bunun üçün əlverişli şərait yaratmışdı. Şah İsmayıl  və onun tərəfdarları bu yaranmış əlverişli vəziyyəti nəzərə alaraq 70 nəfərdən ibarət bir dəstə ilə Ərdəbilə doğru hərəkət edirlər. Yolboyu onların ətrafına ustaclı, təkəli, varsaq, zülqədr, qacar, əfşar tayfalarından çoxlu adamlar toplaşırlar. Dəstə Ərdəbilə daxil olub Şeyx Səfi məqbərəsini ziyarət edir, gələcək döyüşlərə hazırlıq haqqında danışırlar. Bir çox ölkə və şəhərlərə səpələnmiş səfəviyyə təriqətinin ardıcıllarını baş verəcək hadisələrlə əlaqədar xəbərdar etmək üçün elçilər göndərilir.

Əsas dəstə Gəncə, Qarabağ və Göycədəniz istiqamətində yola düşür, Çuxursəddən keçərək Sarıqaya yaylağına gəlib çıxır. “Cənnət bağını xatırladan və quşlar oylağı olan” Sarıqaya yaylağı öz gözəlliyi ilə onları valeh edir. Qızılbaş dəstələrinin Ərzincanda toplanması qərara alınmışdı. Şah İsmayıl ın dəstələri hər yandan axışıb Ərzincana gəlirdilər.

Tarixi qaynaqlarda qızılbaş dəstələrinin Ərzincanda toplanması, Şah İsmayıl ın tərəfdarlarının böyük bir məhəbbətlə onun yanına axışıb gəlməsi bir sıra təfərrüatlarla qeydə alınmışdır. Bu qeydlərdən anlaşılır ki, Şah İsmayıl ın tərəfdarlarının Ərzincanda toplanması işi bir ilə qədər çəkir. Ancaq bundan sonra Şirvan üzərinə yürüş başlanır. Bu yürüş zamanı Kür-Araz qovşağının "Qoyunölümü" adlanan yerində keçid olmalı imiş. Payız daşqını ordunun yolunu kəsir.

Gözləmək, qayıqlar hazırlamaq üçün vaxt itirmək Şirvan üzərinə hücumun gözlənilməzliyini əldən vermək demək idi. Bu vaxt suyu necə keçmək, nə etmək ətrafında mübahisələr xeyli uzanır. Vaxt itirməyin yaxşı olmadığını dərindən anlayan Şah İsmayıl əlverişli bir yer seçib suyu keçməyə başlayır.

Qızılbaş sərkərdələri və əsgərləri əvvəlcə bu işə heyrət edirlər, sonra onlar da atlarını suya salıb heç bir tələfat vermədən çayı keçirlər. Bu hərəkət cavan sərkərdənin kəramət və möcüzəsi kimi qarşılanır və orduda Şah İsmayıl ın nüfuzunu daha da artırır.

1500-cü ildə Şah İsmayıl ın yeddi minlik ordusu ilə Şirvan şahı Fərrux Yasarın iyirmi min atlı və altı min piyada ordusu üz-üzə gəlir. Şamaxı yaxınlığında Cəbani adlanan yerdə baş verən bu döyüşdə Fərrux Yasar məğlub olur və Biğurd qalasına pənah aparmaq istəyir. O, yolda Lələ Hüseyn bəyin cilovdarı Şahgəldi ağa tərəfindən təsadüfən tutulub öldürülür. Onun Fərrux Yasar olduğunu ancaq bir qədər sonra əsirlər söyləyirlər. Elə həmin ildə Bakı qalası alınır və Şirvanşahların xəzinəsi ələ keçirilir. Bakı qalasının alınmasında da Şah İsmayıl böyük müdriklik və rəşadət nümayiş etdirir. Şah İsmayıl bundan sonra ordusu ilə birlikdə Şamaxıya qayıdır, Biğurd, Gülüstan və Sürxab qalalarını ələ keçirməyə hazırlaşır. Lakin bu vaxt Əlvənd Mirzənin Culfaya qoşun çıxartması onun planını dəyişdirir.

Şah İsmayıl la Əlvənd Mirzə arasında əvvəlcə bir neçə məktub mübadiləsi olur. Ağqoyunluların ayrı-ayrı istiqamətlərdə hərəkət edən dəstələri ilə vuruşmalarda qızılbaş dəstələri mühüm qələbələr qazanırlar. Əlvənd Mirzə ilə Şah İsmayıl arasındakı əsas toqquşma Naxçıvan yaxınlığındakı Şərur düzündə başlayır. Ağqoyunluların ordusunda top və tüfənglərin olmasına baxmayaraq onlar məğlub olurlar. Əlvənd Mirzə zorla canını qurtarıb Ərzincana sarı qaçır. Bu qələbədən sonra Şah İsmayıl Təbrizə doğru hərəkət edir. Təbrizdə Şah İsmayıl şah elan edilir və onun adına xütbə oxunur. Bir qədər sonra

Ağqoyunlular dövlətinin ikinci qolu üzərində də qələbə çalan Şah İsmayıl yeni Səfəvilər dövlətinin sərhədlərini xeyli genişləndirir. 1503-cü ildə Mazandaran, 1504-cü ildə Yəzd, Kirman, Fars, Kaşan, 1506-cı ildə Mərəş, Diyarbəkr, 1508-ci ildə Bağdadla birlikdə bütün Iraq fəth olunur.

Şah İsmayıl ın ordusunun yaxınlaşması xəbərini eşidən Bağdad hakimi əhali tərəfindən müdafiə olunmadığını görüb gecə ikən qaçıb aradan çıxır.

Qızılbaş ordusu hələ Bağdada çatmamış şəhərin came məscidində Şah İsmayıl ın adına xütbə oxunur. "Cahanarayi-Şah İsmayıl Səfəvi" adlı tarix əsərində

Şah İsmayıl ın Bağdada daxil olması belə təsvir edilmişdir: "Şah İsmayıl  ayulduz bayrağı altında Bağdada yaxınlaşdı. Iraq əhalisi sürətli addımlarla onu qarşılamağa çıxdı. Sadə camaat Bağdad və başqa şəhərlərdən gəlib şadlıq içində qeyri-adi qələbələr və ilahi təyinatla bağlı hökmdarı qarşılayırdı. Onlar sevinc və bəxtiyarlıq içində idilər. Iraqlıların adətincə çoxlu qurbanlıq buğalar gətirilmişdi. Alqış və dua edərək buğaları kəsir, başlarını Şah İsmayıl ın atlılarının ayaqları altına atırdılar. Şah İsmayıl  "Çaharbağ"a düşdü və Bağdad əhalisinə dərin mehribanlıq, mərhəmət və səxavət göstərdi".

Şah İsmayıl  Bağdadda qaldığı müddətdə ziyarətgahlara böyük qayğı göstərir, əhalinin xahişi ilə quldurluqla məşğul olan bədəvilərin hərami dəstələrini darmadağın edir. O, bu vaxt bir neçə dəfə Mədain xərabələrinə tamaşa etməyə gedir. Bu çağlarda böyük Füzulinin 14-15 yaşı olardı. Ətrafında baş verən hadisələr onun da qəlbində dərin iz buraxmış, bir qədər sonra yazdığı əsərlərdə əksini tapmışdır.

Şeybani xan və Sultan Səlimlə müharibələri də Şah İsmayıl ın həyat və fəaliyyətində mühüm yer tutur. Məlum olduğu kimi, Teymur və onun övladlarının dövründə Azərbaycanın bir çox elm və mədəniyyət xadimləri Səmərqənd, Herat və Buxara şəhərlərinə aparılmışdı. Şah İsmayıl ın Şeybani xan üzərindəki qələbəsi bu axının istiqamətini dəyişdirdi. Vətənindən ayrı salınmış bir çox sənətkar və yaxud onların varisləri yenidən doğma yurda qayıtmağa başladılar.

XVI əsrin ilk illərində Orta Asiyada vəziyyət o qədər də yaxşı deyildi.

Sultan Hüseyn Bayqara bir yandan öz övladları, başqa bir yandan Şeybani xan tərəfindən sıxışdırılırdı. Belə bir vəziyyətdə Sultan Hüseyn Bayqara öz düşmənləri ilə haqq-hesab çəkmək üçün Şah İsmayıl la yaxın dostluq əlaqələri yaradır, onun sarayına elçilər, ozanlar göndərir. Şah İsmayıl  onun bu dostluq təşəbbüslərinə dostluqla cavab verir. Sultan Hüseyn Bayqaranın 1505-ci ildə ölməsi və Şeybani xanın onun varisi üzərində hiylə və namərdliklə qələbə qazanması vəziyyəti xeyli dəyişdirmişdi. Şeybək xan, Şeybani xan adları ilə tanınan Məhəmməd Şahbəxt xan (1500–1510) Xorasan və Heratı ələ keçirdikdən sonra imperatorluq xülyalarına qapıldı, Şah İsmayıl a təhqir və təhdidlərlə dolu eyhamlı məktublar göndərməyə başladı.

O, Şah İsmayıl a özünün əmirlərindən biri kimi müraciət edərək Məkkəyə gedəcəyini bildirir, keçəcəyi yolları sahmana salmaq, adına sikkə vurdurmaq, məscidlərdə xütbə oxutdurmaq, layiqli töhfələr hazırlamaq, pişvazına çıxmaq barədə iddialı göstərişlər verirdi.

Müdrik və ağıllı bir dövlət başçısı olan Şah İsmayıl  onun sifarişlərinə hörmətlə cavab verir, münasibətləri kəskinləşdirmək istəmirdi. Iki dəfə Şeybani xanın sarayına elçilər göndərib münasibətləri qaydaya salmağa çalışır. Şah İsmayıl ın sülh, dostluq münasibətləri yaratmaq təşəbbüsləri Şeybani xan tərəfindən qorxaqlıq və zəiflik əlaməti kimi qiymətləndirilir. Şeybani xan Şah

İsmayıl a əsa və kəşkül göndərərək ona meydan oxumağa başlayır. Ata-babadan şah nəslinə mənsub olmayan Ağqoyunlularla qohumluğuna arxalanaraq şahlıq eşqinə düşən Şah İsmayıl ın hərəkətini, niyyətini qeyri-mümkün bir iş sayır.

Şeybani xanla münasibətlərin dinc yolla nizama salınması işinin çətin olduğu gənc Səfəvi hökmdarı üçün bütün aydınlığı ilə məlum olur. Onda o, 1510-cu ildə Şeybani xana eyhamlarla dolu bir məktub yazıb, Məşhədə nəzir verməyə gəlməyə hazırlaşdığını bildirir və sürətlə Xorasan üzərinə yürüş edir.

Qızılbaş ordusunun qəfildən Xorasana yetişdiyi xəbərini alan Şeybani xan çaşbaş qalır, qorxusundan Heratdan Mərvə qaçır. Şah İsmayıl hərbi hiylə ilə onu qaladan bayıra çıxarır və ağır məğlubiyyətə uğradır. Şeybani xan öldürülür.

Xorasan və Heratdan başlamış Bədəxşan, Kabul və Qəndəhara qədər böyük bir ərazi Şah İsmayıl ın əlinə keçir. Herat Səfəvilər dövlətinin ikinci mühüm mərkəzinə çevrilir. Şah İsmayıl ın böyük oğlu Təhmasib Mirzə Herat mərkəz olmaqla Orta Asiyaya vali təyin edilir. Şah İsmayıl 1510-cu ilin qışını yaza qədər Heratda keçirir. Bu vaxt o, elm və mədəniyyət xadimləri ilə maraqlanır, onları ətrafına toplayıb məclislər düzəltdirir, onların bir qisminə Xorasan, Bəlx, Mərv, Herat şəhərlərində yüksək vəzifələr verir, bir qismini isə Təbrizə göndərtdirir.

Şah İsmayıl ın Heratda “Bağicahanara” sarayında keçirdiyi günlər, qurduğu tarixi məclislər haqqında tarixi qaynaqlarda ətraflı məlumat verildiyi kimi, bunlar müxtəlif sənət əsərlərində də öz parlaq əksini tapmışdır.

Səfəvilər dövlətinin sürətli inkişafı, qısa bir müddətdə Şərqin ən qüdrətli dövlətlərindən birinə çevrilməsi, qızılbaşlıq ideologiyasının başqa dövlətlərin əhalisi arasında da geniş yayılması həmin dövlətlərin Şah İsmayıl a və onun ölkəsinə qarşı qorxu, ehtiyat, qibtə, hətta düşmən münasibəti bəsləməsinə səbəb olurdu. Çaldıran müharibəsi bu hisslərin və münasibətin nəticəsi idi. Bu döyüş istər Osmanlı qaynaqlarında, istərsə də Səfəvilərə aid əsərlərdə bütün təfərrüatı ilə təsvir olunmuşdur. Bu qaynaqlardan aydın olur ki, Şah İsmayıl həmin müharibənin baş verməsinə tərəfdar deyilmiş.

Şah İsmayıl hakimiyyət uğrunda müharibələr apardığı çağlarda, Çaldıran döyüşünə qədər şah olduğu dövrdə Türkiyə sultanlığı ilə ehtiyatla davranmışdır.

Sultan Bəyazid əvvəllər Şah İsmayıl a düşmən münasibət bəsləmiş, “qızılbaş yağı tayfalarının fitnə alovunu yüksəlmədən söndürməyə” çağırmışsa da, sonralar Şah İsmayıl la onun arasında mehriban dostluq münasibətləri yaranmışdır.

Sultan Bəyazid qüdrətli Səfəvi dövləti ilə hesablaşmağa başlamışdı. Münasibətlərin yaxşılaşmasında Şah İsmayıl ın xidməti daha böyük idi. Müdrik və uzaqgörən Səfəvi hökmdarı ümumi vəziyyəti nəzərə alır və Türkiyədəki çoxsaylı tərəfdarlarına xətər toxunmasını istəmirdi. Bu çağlarda Trabzon hakimi olan, Yavuz ləqəbini almış Səlim, Bəyazidin Şah İsmayıl a münasibətilə razı deyildi. O, Türkiyədə gündən-günə güclənən, ətrafında çoxlu tərəfdarlar toplayan qızılbaşlıq hərəkatına imperiya üçün təhlükəli bir qüvvə kimi baxırdı. O, həssaslıqla duyurdu ki, bu qüvvə gec-tez Osmanlı dövlətini ələ keçirəcəkdir.

Məhz buna görə də qəti tədbirlərə əl atmaq tərəfdarı idi. Həmin dövrdə Osmanlı imperiyası daxilində qızılbaşlığa zidd olan qüvvələr Sultan Səlimə kömək edərək Sultan Bəyazidin hakimiyyətinə son qoydular.

Bu hadisələri qaynaqlar əsasında təhlil edən M.Abbaslı yazır: "Həmin illərin tarixi hadisələrindən aydın olur ki, həqiqətən də, əgər Yavuz Sultan Səlim tək hakimi-mütləq, qarşıdakı maneələri aradan qaldırmaqda cəsarətli, fikrindən dönməyən, möhkəm iradəli, eyni zamanda rəhmsiz, qəddar bir şəxsiyyət olmasaydı, hakimiyyət gec-tez Şah İsmayıl tərəfdarlarının əlinə keçəcəkdi."[1]

Sultan Səlim hakimiyyət başına keçən kimi ölkəni daxilən möhkəmləndirməyə başladı, yeniçərilərin etirazlarına baxmayaraq qızılbaşların siyahısını tutdurub qırx mindən çoxunu işgəncə ilə öldürtdü, ibrət olmaq üçün bəzilərinin alnına qızmar dəmirlə damğa vurdurdu. Bundan sonra isə din nümayəndələrini toplayıb qızılbaşlar əleyhinə fitva hazırlatdırdı. Həmin hazırlıq işlərindən sonra Sultan Səlimin iki yüz minlik odlu silah və toplarla silahlanmış ordusu hərəkətə başladı.

Maku yaxınlığındakı Çaldıran düzündə iki qoşun üz-üzə gəlir. Döyüş üç gün davam edir. Şah İsmayıl bu döyüşlərdə qeyri-adi rəşadət göstərir, özünü dönə-dönə qoşunun qəlbgahına vurur, qılıncı ilə topların bağlandığı zəncirləri doğrayır, hətta əsasında müəyyən həqiqət dayanan bir rəvayətə görə qılıncı ilə bir topun lüləsini vurub yaralayır. Şah İsmayıl ın, onun sərkərdələrinin və əsgərlərinin qeyri-adi bir cəsarətlə vuruşmasına baxmayaraq döyüşdə Sultan Səlim qalib gəlir. Bunun əsas səbəblərindən biri onun öz gücünə həddindən artıq inanması, özünü məğlubedilməz sayması, ağıllı məsləhətləri eşitməməsi və bir sıra taktiki səhvlərə yol verməsi ilə əlaqədardır. Bundan əlavə Şah İsmayıl bu müharibəyə lazım olduğu şəkildə hazırlaşmamışdı, döyüş təzə başlanan zaman bu vuruşa əhəmiyyət vermədiyini bildirmək üçün bildirçin ovuna getmişdi.

Səfəvilərin Çaldıran müharibəsində məğlubiyyətinin acı və ağır nəticələri tədriclə üzə çıxır. Diyarbəkr, bir az sonra Ərzincan Şah İsmayıl hakimiyyətindən qoparılıb Osmanlı torpaqlarına qatılır. Çaldıranda Şah İsmayıl ın ömründə birinci və axırıncı dəfə məğlub olması ona çox güclü şəkildə təsir etdi, əsərlərinə faciəli, iztirablı motivlər gətirdi. Şair hökmdarın həyat sevinci bir də özünə qayıtmadı, üz-gözünə əbədi bir tutqunluq və kədər çökdü. Bu hadisə onun üçün adi bir məğlubiyyət deyildi, ən böyük arzu və istəklərinin puça çıxması demək idi. O, tutduğu işdəki, yoldakı müəyyən yanlışlıqları ancaq bu məğlubiyyətdən sonra bütün aydınlığı ilə dərk etməyə başladı.

Çaldıran müharibəsinin təfərrüatı, tarixi qaynaqlarda əks olunduğu kimi, bədii ədəbiyyatda da müəyyən izlər buraxmışdır. Bu müharibədən aldığı təəssüratı Məhəmməd Füzuli "Bəngü Badə" poemasında dərin ürək ağrısı ilə

---

[1] M.Abbaslı. Şah İsmayıl Xətayinin ömür yolu miniatürlərdə, "İşıq", Bakı, 1981, s.30.

qələmə almış, iki hökmdarın qürur və mənəmliyi ucbatından törənən Çaldıran müharibəsi ona bu ilk böyük əsərini yaratmaq üçün əsas təkanverici hadisə olmuşdur. Füzuli 1514-1524-cü illər arasında yazdığı bu poeması Şah İsmayıla ithaf etmiş, onu səmimi, ürəkdən gələn misralarla alqışlamışdır.

Məclisəfruzi-bəzmgahi-Xəlil,
Cəmi-əyyam Şah İsmayıl .
Ondan asudədir ğəniyyü gəda,
Xələdəllahü mülkəhü əbəda.

Çaldıran məğlubiyyətindən sonra Şah İsmayıl on il yaşasa da, heç bir ciddi hərbi səfər etmir. Onun ölümü ilə bağlı qaynaqlarda belə bir qeyd vardır ki, Şah İsmayıl ölümündən bir qədər əvvəl yorğunluq hiss etdiyindən ova çıxır.

O, sağalmaq ümidilə Şəki mahalına gəlib çıxır. Şahdağda ov edir. Ona Şahdağda çox qədim zamanlardan qalmış bir çox ev heyvanlarının, vəhşi at ilxılarının olduğunu xəbər vermişdilər. Şah İsmayıl ova çıxmazdan əvvəl yerli əhali ona həmin yerdə ov etməyin, Şahdağdakı heyvanları ovlamağın sınaqlı olduğunu, yaxşı nəticələr vermədiyini bildirirlər. Şah İsmayıl bu sözlərə əhəmiyyət vermir və öz adamları ilə cərgə ovu təşkil edir. Ov şənliyi qurtararqurtarmaz o, ağır şəkildə xəstələnir və dərhal Ərdəbilə qayıdır. Burda da onun halı yaxşılaşmır. Tələsik Təbrizə yola düşürlər. Yolda Sarab yaxınlığındakı Mənqutay adlı yerdə halı o qədər ağırlaşır ki, düşərgə salmalı olurlar. Həkimlərin səyi, müalicəsi bir fayda vermir. Hökmdar şair 1524-cü ildə iyunun 23-də vəfat edir. Cəsədini Ərdəbilə gətirib Şeyx Səfi türbəsinin yanında dəfn edirlər.

Şah İsmayıl Xətayi 38 yaşında, həyatının, yaradıcılığının, arzularının ən qaynar bir çağında dünyadan köçür, lakin qısa ömrü müddətində gördüyü işlər ona ölməzlik qazandırmış, onu Azərbaycan xalqının siyasi və mədəni tarixinin ən parlaq səhifələrindən birinin yaradıcısı kimi tanıtdırmışdır.

Şah İsmayılın apardığı müharibələr onun vahid Azərbaycan dövləti yaratmaq arzu və istəyindən irəli gəlirdi. O, Azərbaycan dilini dövlət və şeir dilinə çevirmiş, ölkənin siyasi, ictimai, iqtisadi və mədəni inkişafı üçün ölçüyəgəlməz dərəcədə böyük işlər görmüşdür.

Xətayi barədə ilk məlumatı oğlu Sam Mirzə “Töhfeyi-Sami” əsərində vermişdir. Təəssüf ki, bu farspərəst ziyalı böyük atasının zəngin irsindən ancaq farsca yazdığı bir beyti nümunə gətirməklə kifayətlənmişdir. Halbuki Xətayi yaradıcılığında ana dilinə üstünlük vermiş, bizə çatan əsərlərini, demək olar ki, büsbütün ana dilində yazmışdır. Bununla bərabər Sam Mirzənin nümunə gətirdiyi beyt özü də müəyyən cəhətdən diqqəti cəlb edir. Burda Şah İsmayıl Xətayinin qəhrəman, əyilməz, məğlubedilməz şəxsiyyəti ifadə olunmuşdur:

Bisütun naləvü zarəm çü şənid əz ca şod,
Kərd fəryad ke Fərhade-degər peyda şod.

(Bisütun nalə və iniltimi eşitdi, yerindən oynadı, fəryad etdi ki, yeni bir Fərhad peyda olmuşdur.)

Xətayi irsinin ümumi məzmun istiqamətinə uyğun olan bu beytin təsdiq etdiyi həqiqət budur ki, şair yeni bir Fərhaddır. Bisütunları yerindən oynada bilən yeni bir hünər sahibidir. Sam Mirzədən sonra Xətayidən bəhs edən təzkirəçilər onun yazdıqlarını təkrar etmişlər. A.Bakıxanov və S.Ə.Şirvani də onun haqqında maraqlı qeydlər etmişlər. Avropa alimlərindən J.HamperPurqştal, Ş.Ryo, E.Gibb, E.Braun, F.Babinger, V.M.Minorski, T.Gənceyi, rus şərqşünaslarından A.E.Krımski, türk alimlərindən M.F.Köprülü, S.N.Ərgün, Ə.Gölpinarlı və başqaları Xətayinin həyat və yaradıcılığının öyrənilməsi ilə əlaqədar xeyli iş görmüşlər. Bu alimlərin heç də hamısı onun irsi ilə eyni dərəcədə dərindən məşğul olmamışlar. V.Minorski, S. N.Ərgün və T.Gənceyinin bu sahədə xidmətləri daha çoxdur.

Azərbaycanda Xətayi irsinin öyrənilməsi 1920-ci illərdən başlamışdır.

Azərbaycanın tarixçi və ədəbiyyatşünas alimləri Xətayinin dövrü, həyatı və ədəbi irsinin öyrənilməsi sahəsində bir sıra qiymətli tədqiqat yaratmışlar.

S.Mümtaz, H.Araslı, M.Quluzadə, Ə.Məmmədov, O.Əfəndiyev, M.Abbaslı kimi mütəxəssislərin bu yöndə apardıqları araşdırmalar və yürütdükləri mülahizələr xüsusilə diqqəti cəlb edir.

Şah İsmayıl Xətayi az yaşamasına, vaxtının çoxunu dövlət işlərinə sərf etməsinə baxmayaraq zəngin və çoxcəhətli bir irs yaratmışdır. O, həm əruzla, həm də heca vəznində, həm epik, həm də lirik janrlarda qələmini işlətmiş, yaddaqalan, nümunə, örnək ola bilən əsərləri ilə ədəbiyyatımızı zənginləşdirmişdir.

Onun səmimi, ürəkdən qopub gələn, zamanın qarşıya qoyduğu tələblərə cavab kimi meydana çıxan poeziyası çox vaxt siyasi-ictimai fəaliyyəti ilə birləşmişdir. Bu poeziya gah qılıncla bərabər döyüş meydanlarına getmiş, gah müdrik el ağsaqqalının, təriqət şeyxinin öyüdlərinə çevrilmiş, gah da dünyaya və insana məhəbbətlə dolu bir qəlbin tərcümanı olmuşdur. Bu poeziya qəhrəmanlığa, gözəlliyə, mənəvi saflığa məhəbbətlə, şərə, eybəcərliyə, əqidəsizliyə, dönüklüyə, sədaqətsizliyə, cılızlığa nifrətlə doludur. Bu poeziya, hər şeydən əvvəl, mənəvi azadlığı təsdiq edir. Dünyagörüşü etibarilə panteist olan şair Mənsur Həllac və Nəsimi kimi "ənəlhəq" ("Mənəm Allah") şüarına, ideyasına tərəfdar çıxıb özünü "vəhdət gülzarının bülbülü" adlandırır:

Çün Xətayidir bu gün gülzari-vəhdət bülbülü,
Dəxi ol zaği-siyəh gülzarə söylən gəlməsün.

Bütün kainatı ilahi, mütləq varlıqla bir sayan, yaradıcı ilə yaradanı, insanla Allahı eyniləşdirən və bu eyniliyi vəhdət gülzarı, özünü isə bu vəhdət və birlik

gülzarının bülbülü, şairi adlandıran Xətayi özünü “mütləq həqiqət” (“həqqimütləq”) deyə vəsf edir:

Ənəlhəq sirri uş könlümdə gizli
Ki, həqqi-mütləqəm, həq söylərəm mən.

Şair çox yerdə “ənəlhəq” deməsi ilə fəxr edir, bunu özü üçün ən yüksək məziyyət sayır. “Mənəm Allah”, yaxud “mənəm həqiqət” deməyi qəhrəmanlığa bərabər bir hərəkət kimi qiymətləndirir:

Mən Xətayi çəkmənəm ğəm, çün ənəlhəq demişəm,
Çəkmişəm Heydər təki meydanda hu mərdanə mən.

Böyük mütəfəkkir şair Nəsimi kimi Xətayi də görünən hər şeydə, o cümlədən insanın simasında ilahi varlığı görməyə çağırır:

Yəqin bil əhli-iqrarın yanında
Yerü gög cümlə həqdir, olma gümrah...
Ta səni gördü Xətayi valehi şeydayidir,
Xansı gözdür həq yüzün görgəc ki, bidar olmadı?

Bu misallar aydın göstərir ki, Xətayi dünyagörüşü baxımından panteist olmuşdur. Nəsimiyə böyük hörmət bəsləyən, Həllac Mənsuru məhəbbətlə xatırlayan, sufi şeyxi kimi tanınan şairin panteist olması onun poeziyasına da güclü təsir göstərmiş, ona daha cəsarətli humanist ruh vermişdir. Lakin bu cəhət Xətayinin yaradıcılığını sırf təriqət poeziyasına çevirməmişdir. O, bütün məqamlarda real həyat və real insan haqqında düşünmüş, real insana müraciətlə yazıb-yaratmış, real insandan və onun hisslərindən, qayğılarından söhbət

açmışdır. Şairin panteizmi onun fikirlərinə daha geniş və dərin humanist məzmun gətirmişdir. Bir çox qabaqcıl panteist sənətkarların əsərlərində olduğu kimi, Xətayinin şeirlərində də hər şey insanı, onun hisslərini, arzularını, ideallarını müdafiə etməyə, ucaltmağa, hər cür müqəddəsatdan daha müqəddəs göstərməyə, həm də real, insani mənada müqəddəs göstərməyə xidmət edir. Onun şeirlərindəki panteizm qabaqcıl, müasir fikir və düşüncələrlə nəfəs alan bir panteizmdir:

Sirri eşqindən sənin hər kim ki agah olmadı,
Qaldı məhrum ta əbəd məqbuli-dərgah olmadı.
Biməyən kəndi vücudin, həqqi bilməz, lacərəm,
Kim ki, bildi nəfsini, aləmdə gümrah olmadı.
Güzgüsü pak olmayanın çarə yoxdur pasinə,

Qaldı məhrum ta əbəd fəzl anə həmrah olmadı.
Hər nə qılsan nikü bəd, axır sana ol tuş olur,
Çəkmədi şərməndəlik, hər kim ki, bədxah olmadı.
Zirqinə aldanmagil, məkri yüküşdür dünyanın,
Xansı gün xoş keçdi ki, sonu qəmü ah olmadı.

Panteizm bu şeirdə Xətayiyə məxsus bir şəkildə ifadə olunmuşdur. Həqqi bilmək, onun eşqinin sirrindən agah olmaq, şaha layiq olmaq kimi ifadələr aydın şəkildə şerin fəlsəfi əsasına işarə edir, onun vəhdəti – vücud fəlsəfəsi ilə, panteist dünyagörüşü ilə bağlı olduğunu təsdiqləyir. Bu fəlsəfi zəmin üzərində isə yeni insan idealı irəli sürülür. Bu yeni insan əvvəlcə özünü dərk etməlidir.

Özünü dərk edən, anlayan insan isə nəfsini də biləcək, tamah, nəfs ucundan səhvlərə, büdrəmələrə, cinayətlərə yol verməyəcəkdir. Mənəvi saflıq uğrunda mübarizə bütün dövrlərin qabaqcıl adamlarını məşğul etmişdir. Xətayi dövründə də insanın ucalmasına mane olan əsas amillərdən biri nəfs, tamah əsiri olmaq idi. O da ən qabaqcıl sələfləri və müasirləri kimi insandan nəfsə qul olmamağı, şəxsiyyətini, ləyaqətini nəfs çirkabından qorumağı tələb edir. İnsan mənən saf olmalıdır, mənən saf olmayan, Xətayi demişkən, "güzgüsü pak olmayan" insan şairə görə ən yaramaz insandır, onun yaxşılığına, insan adını doğrultmasına heç bir ümid yoxdur. Şairin "güzgüsü pak olmayanın çarə yoxdur pasinə" fikri indi də müasir və aktual səslənir. Belə adam o dövrdə olduğu kimi indi də insanlıq və gözəllik anlayışlarından uzaq bir varlıqdan başqa bir şey deyildir.

Nümunə gətirdiyimiz şeirdə diqqəti cəlb edən fikirlərdən biri də xeyir və şər anlayışları ilə bağlıdır. Bu məsələdə Xətayi Nizami ilə həmfikirdir. O da belə hesab edir ki, insan yaxşı-yaman nə iş tutsa, onun bəhrəsini görəcək, pis əməl sahibi öz əməlləri üçün xəcalət çəkəcəkdir. Ancaq xeyir işlər, əməllər arxasınca gedənlər hər cür xəcalət və peşmanlıq, üzüqaralıq və şərməndəlik hisslərindən uzaq olarlar.

Şerin sonunda Xətayi həyatın mürəkkəblik və ziddiyyətlərinə diqqəti cəlb edir, dünyanın aldadıcı hiylələrindən söhbət açır. İnsanın öz-özünə nəfs əsiri olmadığına, güzgüsünün təmizlikdən uzaq düşməyinin həyati səbəbləri olduğuna toxunulur. Xoş günlərlə qəmli günlərin həmişə bir-birini əvəz etdiyi xatırlanır. Bütün bunları nəzərə almağa, aldanmamağa, güzgüsünü, başqa sözlə, mahiyyətini, qəlbini saf saxlamağa çağırış şairin əsərində əsas mütərəqqi qayəni təşkil edir. Xətayi insanın mənəvi təkamülü, yeni insanın əsas keyfiyyətləri barədə bir silsilə fikirlər yürüdür. Şair bu fikirlərə bəzən mistik fəlsəfi don geyindirirsə, bu onun öz qənaətlərini daha təsirli, daha müasir ifadə etmək cəhdindən irəli gəlir. Mistik boya özü donuq, ehkam şəklində qəbul edilən baxışlara zidd olan bir dünyagörüşünün ifadəsi kimi meydana çıxır. Bu fikirlər oxucuları ucalığa, gözəlliyə, kamilliyə, saflığa səsləyir, insanın ağıl və qüdrətini təsdiq edir.

Xətayinin şeirlərində insan, lirik qəhrəman məğrur, azad fikirli, öz qüdrətinə inanan bir varlıq kimi tərənnüm olunur, onun ölməzliyi, əbədiliyi, ən ağıllı bir şəxs olması, düşmənlərin canına vəlvələ salmağa qadir olduğu dönədönə nəzərə çatdırılır. "Gəldim imdi" rədifli şerində şair panteist mistik boyalardan istifadə edərək əsrin rəngarəng şərinə qarşı bu yeni insandakı güclü nifrəti əks etdirir.

Mən ol məsti-liqayəm gəldim imdi,
Həmişə ba xudayəm, gəldim imdi.
Cahan içində bir aqil məni bil,
Mən ol sidqü səfayəm, gəldim imdi.
Məni, zinhar, sən bir qeyri bilmə,
Haman ol dilrübayəm, gəldim imdi.
Münafiq canına ba zərbi-şəmşir,
Bu gün həqdən bəlayəm, gəldim imdi.

Xətayi yaradıcılığındakı panteist fəlsəfi düşüncəni, mistik örtüyü onun məhdudluğu, dindarlığı yox, əksinə, dövrünə görə qabaqcıl, cəsarətli keyfiyyəti saymaq lazımdır. Şairin lirik qəhrəmanı hər cür şərə dərindən nifrət edən, ona qarşı əlində qılınc vuruşmağa hazır olan, düşmənin canına vəlvələ salan qabaqcıl, qəhrəman bir şəxsiyyətdir. Bu adam şairin dediyi kimi, haman dilrübadır, yəni haman saflıq, etibar, sədaqət simvolu olan, gözəllik, həqiqət yolundan zərrə qədər kənara çıxmayan nəcib şəxsdir. O, hər cür dönüklüyə, çirkaba amansız düşməndir.

Xətayi həyat və insan haqqındakı düşüncələrini bəzən mistik boyalar işlətmədən də ifadə edir. Belə şeirlərdə onun sufi panteist görüşləri hissolunmaz dərəcədə unudulmuş kimidir:

Hər gələn dünya mənim der, sən qədim bünyadsən,
Cümlənin könlün alıbsan, nə əcəb səyyadsən?
Hər kəsə bir yüz ilə verdin muradın dünyada,
Xızr olan buldu həyatı, bildi kim zülmatsən.
Hər kiminlən oynadın, çəkdin, çevirdin çərxini,
Hiç arif nəqşini duymaz, əcəb nərradsən.
Dünyanın malıvü mülkü gəncinə aldanma kim,
Əvvəli zərqü nişatdır, axiri şəhmatsən.
Ey Xətayi, sən cahanın cövrünə şad ol müdam,
Çünki sevgin dust iləndür, eşq ilə ustadsən.

Bütünlükdə bu şeir dünya və insan haqqındakı dialektik düşüncələrdən ibarətdir. Dünyanın kəşməkəşləri, ziddiyyətləri, hərə ilə bir cür davranışı, in-

sanın onun oyunlarını dərk edə bilməməsi, "dünya mənim" deyənlərin boş iddiaları, əvvəli sevinc, axırı şahmat olan həyat haqqındakı bu kiçik sənət incisində şair öz sualları, hökmləri ilə düşündürür, ibrətləndirir.

Hələ XII əsrdə Nizami Gəncəvi sufizmə rəğbətlə yanaşmış, sufiləri ürəkdən xəbərdar olan adamlar kimi təqdim etmişdir. Şairin "Sirlər xəzinəsi" əsərində müxtəlif xarakterlərə malik sufi surətləri yaradılmışdır. Nizami əqidə və məsləyindən dönən, əmanətlə xəyanət edən sufilərin olduğunu göstərdiyi kimi, tutduğu yolun doğruluğuna inanan və ondan dönməyən sufilərin olduğunu da təsdiq edir. Şah İsmayıl Xətayinin əsərlərində də vəziyyət belədir. O da sufiləri halal və haram yola gedənlər adı ilə iki yerə bölür. Xətayi də ən yüksək insani keyfiyyətləri əsl sufilər arasında axtarır, lakin insanlıq adına ləkə olan sufilərin də olduğunu danmır. Özü sufi şeyxi olan şair müridlərini əsl sufi kimi hərəkət etməyə, sufi – insan adını uca tutmağa çağırır. Aşağıdakı dörd misralıq şeir parçasında onun mövqeyi bütün aydınlığı ilə nəzərə çarpır:

Sufi isən, alıb-satma,
Halalına haram qatma,
Yolun əyrisinə getmə,
Doğru yola nəzər eylə.

Şairin nəzərində həqiqi sufi əsl insandır. Onda alıb-satmaq, harama meyl etmək, əyri yola getmək kimi hərəkətlər, sifətlər ola bilməz. Əgər hər hansı bir sufi bu sifətlərə malik deyildirsə, o, sufilikdən də, insanlıqdan da uzaq bir adamdır. Xətayi belə sufiləri rədd edir.

Xətayinin poeziyasında ehkamçılığa, mövhumatçılığa, insan mənəviyyatını buxovlayan zəncirlərə qarşı güclü bir etiraz vardır. Mənəvi əsarəti təcəssüm etdirən zahidlərin, nasehlərin tənqidi bu baxımdan xüsusi məna kəsb edir. Zahid klassik şerimizdə aşiqin ziddidir. Xətayinin şeirlərində isə o həm də sufinin əksidir. Zahid mənən özünü əsarətə, zəncirə bağlayan, insani hisslərdən uzaq olan mövhumatçıların ümumiləşmiş obrazıdırsa, aşiq, eyni zamanda sufi, hər cür əsarət buxovlarından azad olmuş insandır. Aşiqin və sufinin əməlləri, düşüncələri nə qədər insanidirsə, zahidin işi və fikri bir o qədər qeyri-insanidir. Özünü Allahın, dinin müdafiəçisi kimi təqdim edən, guya insanları şərdən qorumaq istəyən zahid Xətayinin şeirlərində ən qorxunc bir şər qüvvə kimi təqdim olunur. Özünü, deməli, həm də Allahı dərk etməyən zahid şairin əsərlərində əsas tənqid hədəfidir. Çünki o, insanı Allah səviyyəsində görə bilmir, gözəlin ilahi nurdan başqa bir şey olduğunu anlamır.

Zahid insanları məscidə, daşa, divara səcdə etməyə çağırırsa, aşiq və sufi onun yerinə insanı qoyur, insana səcdə etməyi üstün tutur. Ona görə də şairin əsərlərində daim aşiqlə zahid qarşı-qarşıya qoyulur, zahidlik rədd edilir, sufilik və aşiqlik isə ən doğru yol və məslək kimi təqdim olunur. İnsanı ucaldan, ila-

hiləşdirən şair onun üzünü aşiq üçün əsl Quran sayır. Quranı insanın üzündə görmək, onu insanın üzü ilə əvəz etmək dolayısı ilə də olsa, bu müqəddəs kitabın və onunla bağlı bir çox ehkamların şübhə altına alınması kimi səslənir.

Zahidlə aşiqin, ehkamçı dünyagörüşü ilə mənəvi azadlığın bu şəkildə qarşılaşdırılmasına aid Xətayinin əsərlərindən külli miqdarda nümunələr gətirmək olar.

Ta camalın müshəfin gördüm, əya nuri-illah,
Zikri-eşqin dildə daim virdi-Qur'andır mana.
Məscidə varmaq nə hacət, dedim, ey zahid, mana? –
Ruy ilə zülfi anın küfr ilə imandır mana...
...Ögmə, ey zahid, mana rizvanü cənnət bağini,
Kim onun yarım yüzü tək bir güli-həmrası yox...
...Səni sevmən deyənlər kafər oldu,
Yüzünü kim sevər, iman anındır...
...Behişt istərsən, ey zahid, biya dər məclisi-rindan,
Həqin didarı, ey aşiq, nə cənnətə müyəssərdir.

Müxtəlif şeirlərdən gətirilmiş bu beytlərdə zahidliyin güclü inkarı ilə qarşılaşırıq. Mənən azad olmuş insan zahidin məscidini, Quranın, imanın cənnətini rədd edir, bəyənmir. Xətayinin lirik qəhrəmanı özünü mənasız, boş xəyallarla yormağın əleyhinədir. Özünü dərk etmiş insan bu xülyalarla, zahidliklə kifayətlənə bilmir. Daşa və divara məhəbbəti insana məhəbbətlə əvəz edir. İnsana, həyata bu münasibət öz xarakteri etibarilə intibah dövrünə məxsus bir münasibət kimi diqqəti cəlb edir.

Xətayi şerinin əsas obyekti insan, əsas qayəsi insana məhəbbətdir. İstər fəlsəfi örtüyə bürünmüş şəkildə ifadə edilsin, istər səmimi real insani duyğular kimi qələmə alınsın, bu şeirlərdəki fikirlər, duyğular, qənaətlər yeni insane idealını əks etdirir. Xətayi dövründə islam dininin insan idealı ilə humanist ziyalıların insan idealı bir deyildi. Dindar insan, yəni zahid hər cür istək və arzularını buxovlayıb cənnət xəyalı ilə yaşayırdısa, humanist ziyalıların ideal insanı əsl cənnəti bu dünyada axtarır və tapırdı. İnsansız dünyanı və cənnəti barsız bağa bənzədir, insansız cənnəti istəmirdi:

Neylərəm ol cənnəti, içində dildar olmasa?!
Qoy anı viranə qalsın – bağçada bar olmasa.

Şairin bu misralarındakı azad ruhu, fikir sərbəstliyini izah etməyə ehtiyac yoxdur. Xətayi də insanı yer üzünün ən qiymətli gövhəri saydığından insansız olan, insana zidd olan, insanın səadətinə mane, buxov, əngəl olan hər şeyi rədd edir. Insana və dünyaya bu şəkildə yanaşan mütəfəkkir şair eşqi şerinin baş mövzusuna çevirir. Onun şeirlərində gah real insani sevgi tərənnüm olunur,

gah da məhəbbətdən geniş fəlsəfi bir kateqoriya kimi söhbət açılır. Hər iki halda məhəbbətin tərənnümü onun humanizmi, fikir sərbəstliyi ilə bağlıdır.

İnsanın gözəlliyinin, arzularının, istəklərinin poetik sözün bu şəkildə predmetinə çevrilməsi orta əsrlər şəraiti üçün mütərəqqi bir haldır.

Yüzün gördüm sənin, ey yari-məhru,
Könüllər afəti, ya yüzmüdür bu?

Dodağın həsrətindən xəstə haləm,
Axıtdı gözlərim yaşı bəhər su.

Həbəşdir kim, müsafir Rumə düşmüş
Yüzün səfhindəki ol xali-hindu.

Gözündən ahu tək dağlara düşdüm,
Nə sehr etdi mənə ol iki cadu?

Xətayi dər yüzün xurşidə nisbət,
Sözü rövşən dedim yüzünə qarşu.

İnsan gözəlliyi bu şeirdə romantik bir dillə, heyranlıqla qələmə alınmışdır. Buradakı bədii suallar, bənzətmələr aşiqin qəlbindəki təlatümləri, həyəcanları təbii, səmimi şəkildə oxucuya çatdırır. Şeirdə sevən nəcib bir qəlbin hərarəti duyulur. Artıq burada heç bir mistika, panteist fəlsəfi örtük yoxdur.

İnsan real cizgiləri ilə canlandırılır. Burada, hər şeydən əvvəl, şairin mövqeyi diqqəti cəlb edir. Şair bu cür heyranlıqla ilahi varlığı deyil, insanı vəsf edir.

Xətayinin məhəbbət poeziyası güclü kədərdən, qəmdən bir qayda olaraq uzaqdır. Burada dərin tragizm yoxdur. Onun aşiqanə lirikasında sabaha, xeyirin qələbəsinə dərin inam vardır. Şair tez-tez vüsal sevincindən danışır. Bu nikbinlik daha çox şairin şəxsi həyatındakı uğurlarla bağlıdır. Lakin şairin nikbinliyini ancaq şəxsi həyatı ilə bağlamaq da yanlış olardı. Xətayinin poeziyasındakı bu cəhəti çox doğru başa düşən M.Abbasov yazır: "Vüsal sevincinin belə tərənnümünə qədim və orta əsrlər şəraitində heç də dar, məhdud mənada baxmaq olmaz. Bu cəhət Xətayi lirikasında obyektiv olaraq daha geniş ictimai məna və əhəmiyyət kəsb etmiş, hər cür tərki-dünyalıq və bədbinliyə, nəfsini öldürmək və dünyəvi ləzzətlərdən meylini küsdürməklə məşğul olanlara, axirət xülyaları ilə yaşayanlara qarşı çevrilmiş, insanın yaxşı yaşamaq, sevinc və fərəhlə dolu bir həyat sürmək haqqındakı romantik arzularını əks etdirmiş, güclü həyat eşqinin ifadəsinə çevrilmişdir"[1].

Xətayinin bir çox şeirləri, o cümlədən aşağıdakı qəzəli, elə bil ki, məhz bu fikri bir daha təsdiq etmək üçün yazılmışdır:

---

[1]M.Abbasov. Şah İsmayıl Xətayi. Seçilmiş əsərləri, Azərnəşr, Bakı, 1964, s.12.

Növcavan ol pir ikən dövran ki, canan dövridir,
Şad ol, ey xəstə könül, kim, dərdə dərman dövridir.

Zülməti-hicranə söylən hökmini tərk eyləsin,
Bir günəş doğdu arayə, mahi-taban dövridir.

Lal oturma, söylə, ey can mürği, gəldi növbahar,
Getdi qış vəqti aradan, uş gülüstan dövridir.

Aşiqə mehr etdi dilbər, qalmadı cövri-rəqib,
Küfr aralıqdan arındı, şimdi iman dövridir.

Naümid olma cahanda, ey gədayi-binəva,
Dərgəhi-sultanə gəl kim, lütfü ehsan dövridir.

Möhnəti-dünyadən, ey dil, fariğ ol, sürgil murad,
Xürrəm ol, qəm çəkməgil kim, zilli-sübhan dövridir.

Xeyirin, gözəlliyin, vüsalın qələbəsini, aşiq insanın sevincini əks etdirən bu parça Xətayi şerinin nikbin xarakterini göstərmək baxımından səciyyəvidir.

Lirik qəhrəmanın köks dolusu sevinci, şadlığı şerin hər bir parçasında, sözündə dolğun, inandırıcı və səmimi bir dillə qələmə alınmışdır. Bu, Xətayi dövrünün həyatından doğan bir nikbinlik idi. Şairin təbiət təsvirinə həsr edilmiş şeirlərində də eyni şux, şad əhval-ruhiyyə hökm sürür.

Bahar oldu ki, aləm gülşən oldu,
Gözün aç, gör cahan nə rövşən oldu.

Bəzəndi hər bir ağac bir gül ilə,
Ağaclar cümlə gül pirahən oldu.

Açıldı yazlar, bitdi çiçəklər,
Gül ilə şol bənövşə susən oldu.

İrişdi və’dəsi badi-baharın,
Behər su gül hezaran-xərmən oldu.

Ümumi nikbinlik Xətayinin bütün şeirlərinə hakimdir. Hətta ayrılıqdan, yarın zülmündən danışdığı qəzəllərdə də dərin fəcilik yoxdur. Təsadüfi deyil ki, onun “Dəhnamə” poemasında da uğurlu bir eşq təsvir olunmuşdur.

Xətayinin məhəbbət lirikası məzmunca rəngarəng, formaca əlvandır. Sufi panteist məhəbbətlə real insani sevginin gah birlikdə, gah ayrıca insani sev-

ginin tərənnümü, nikbin əhval-ruhiyyənin ifadəsi, aşiqin heyranlığı, giley və şikayətləri, gözəlin romantik vəsfi və başqa mövzular hər dəfə yeni-yeni şəkillərdə qələmə alınır. Şair hansı şəkildə hisslərini ifadə edirsə-etsin, onda real gözəlliyi mövhumi gözəlliklərə qarşı qoymaq möhkəm bir ənənə, prinsip şəklindədir. Onun şeirlərində insana fərqli bir münasibət vardır.

Gərçi gün xoşdur, vəli rüxsarın ondan yaxşıdır,
Ay dəxi tabandurur, didarın ondan yaxşıdır.

İstəmən firdövs bağinin güli-xoşbusini,
Dünya bağında güli-rüxsarın ondan yaxşıdır.

Bu tipli qarşıqoymaları adi bənzətmə və müqayisə kimi qiymətləndirmək çətindir. Şair konkret gözəli və gözəlliyi də təsvir etmir. Onun izlədiyi qayə burada daha geniş və mürəkkəbdir. Ən başlıcası isə budur ki, şair real həyatı, real hissləri mövhumi vədlərdən üstün tutur, onlara qarşı qoyur.

Xətayinin aşiqanə qəzəllərində sevgi duyğuları bir çox hallarda o qədər səmimi, təbii verilir ki, boyalarının, ifadələrinin əlvanlığı və sadəliyi ilə insanı heyran edir, tilsimləyir. “Qızıl gül, bağü bustanım, nə dersən?” misrası ilə başlanan məşhur qəzəli yada salaq. Bu qəzəldəki hər beyt, hər parça saf, həssas bir qəlbdən qopan sevgi harayı kimi səslənir:

Qızıl gül, bağü bustanım, nə dersən?
Fəda olsun sənə canım, nə dersən?

Qərarü səbrü aramım tükəndi,
Kəsildi külli-fərmanım, nə dersən?

Əridi iliyim, qaldı sümüyüm,
Bu təni tərk edər canım, nə dersən?

...Əgər yatsam min il topraq içində
Dürüstdür əhdü peymanım, nə dersən?

Xətayi can ilə çün səni sevdi,
Sevən ölsünmü, sultanım, nə dersən?

Real insanın, real insani hisslərin, arzuların, düşüncələrin romantik şəkildə tərənnümü, həm də Xətayiyə məxsus bir tərzdə tərənnümü XVI əsrin birinci rübü üçün qiymətli və yeni bir hadisə idi. Nəsiminin, Kişvərinin, Həbibinin, Hamidinin poeziyasından qidalanan bu şeirlərdə yeni, orijinal, ancaq Xətayiyə

məxsus cəhətlər də çoxdur. Xətayinin çoxcəhətli poeziyasında epik əsərlər də mühüm yer tutur. Onun "Nəsihətnamə" məsnəvisi və "Dəhnamə" poeması epik şerin qiymətli nümunələridir. "Nəsihətnamə", adından da göründüyü kimi, nəsihətamiz fəlsəfi poemadır. Burada süjet, daha doğrusu, ardıcıl nəql edilən hadisə yoxdur. Bir çox nəsihətamiz fəlsəfi şeirlərində olduğu kimi, şair bu əsərində də vəhdəti-vücud fəlsəfəsinin müddəalarından çıxış edir. Həqqimütləqi bir dəryaya, dünyanı onun bir damlasına bənzədir, sonra da bu dərya ilə damlanın bir şey olduğu fikrini irəli sürür. Şairin fikrincə, mövcud dünya Allahın, yaxud bütöv varlığın güzgüyə düşmüş əksidir. Görən də, görünən də bir şeydir. Biri vəhdət, birlik, bütövlük aləmi, o birisi isə kəsrət, yəni bütövün zərrələrindən ibarət olan çoxluq aləmidir. "Günəş zərrəvü həm zərrə günəşdir" deyən şair Allahla mövcud aləmi eyniləşdirir, birini bütöv vücud, digərini isə onun zərrələri sayır. Zərrə bütövə ancaq eşq ilə qovuşa bilər.

Olur bu eşq ilə can həqqə vasil
Ki, eşqi olmayan candan nə hasil?

– deyən şair insanı ilahiləşdirərək onu sevməyə çağırır. Burda insanın ilahiləşdirilməsi daha çox insanı ucaltmağa xidmət edir, onun sevilməyə layiq olduğunu sübut edən dəlilə, fakta çevrilir. Belə bir fəlsəfi müddəanı əsas götürən Xətayi dünya və insan barədə öz humanist düşüncələrini şərh etməyə çalışır. Mövcud həyat və insanlar şairə div sifətində görünür. Bu, dünyanın tərsinə dönməsi deyildirmi? Nikbin bir sənətkar olan Xətayi bunu mənasız sayır və elə düşünür ki, bu xam xəyallar düz ola bilməz, gözlər həqiqəti görürlər.

Xətayi şərin, eybəcərliyin, divin üstün tutulacağına, qələbə çalacağına inanmır. Şərin hər yanı bürüdüyünü görsə də, sabaha inamla baxır.

Cahan əksinə döndü, ey bəradər,
Dilər div ola insana bərabər.

Xaçan dürüst ola bu xam xəyallar?
Yaxışmaz yol içində uş bu hallar.

Xətayiyə görə, insan gülşəndəki gül kimi saf və ətirli olmalıdır. Bunun üçün zülm yükünü atmaq, dünya qəmini vəhdətlə dəyişmək lazımdır. İnsan hər şeyə könül gözü ilə baxmalı, kamal sahibləri ilə oturub durmalıdır ki, özünü və həyatın həqiqətini görə bilsin. Şair saf qəlbi əsl Allah evi adlandırır, könül yıxmağı yox, könül tikməyi məsləhət görür.

Budur sözüm sənə məndən əmanət:
Könül yıxma, vəli eylə imarət.

Dəxi yoldaş ilə qonşunu gözlə,
Ki, xalqın eybini sən açma, gizlə.

Xamu əməldən əfzəldir bir insaf,
Həqin öz evidir, olsa könül saf.

"Nəsihətnamə" sufizmin panteist müddəalarını şərh edən fəlsəfi bir əsər olmaqla bərabər, insan haqqında qabaqcıl humanist düşüncələri də əks etdirir.

Bəlkə də bu ikinci daha əsasdır. Ona görə o da böyük sələfi Nizami kimi dinləyicilərini birinci növbədə zülmdən uzaq olmağa çağırır. "Yükün zülm isə arxandan buraxgil" deyən şair zülmkarlığı ən eybəcər bir sifət kimi rədd edir.

Xətayinin bu məsnəvidə irəli sürdüyü fikirlər dərin insanpərvərliyi ilə seçilir.

Bu fikir və nəsihətlər yeni dövlət, yeni cəmiyyət, yeni düşüncə tərzi yaradan hökmdar şairin proqram sözləri kimi qarşılanır. Onlarda odlu, hərarətli bir çağırış ruhu duyulur.

"Dəhnamə" Xətayinin həcm, fikir və sənətkarlıq baxımından ən mühüm əsəridir. Bir yandan klassik ədəbiyyatdan, bir yandan da xalq yaradıcılığının zəngin xəzinəsindən, nağıl və dastanlardan istifadə ilə yaradılan bu poema başqa "Dəhnamə"lərdən forma və məzmun əlvanlığı ilə seçilir. Rəngarəng təbiət təsvirləri və qəzəllər əsəri təkcə həcmcə yox, həm də fikir və bədii təsir baxımından xeyli gücləndirmişdir. Xətayinin özünəməxsusluğu; hissləri səmimi, inandırıcı, təbii ifadə etmək, təbiəti duymaq, məhəbbətin həyəcanlarını dolğun əks etdirmək, xalq ədəbiyyatından şüurlu şəkildə bol-bol faydalanmaq keyfiyyətləri bu əsərdə də göz qabağındadır.

Sufi panteist məhəbbət burda da vardır, lakin real insani hiss və duyğuların arxasında onlar görünməz olmuşdur. Poema, hər şeydən əvvəl, real insane məhəbbəti dilə gətirən bir əsər kimi diqqəti cəlb edir.

Dəhnamə on məktub deməkdir. Zahirən əsər on məktubdan ibarətdir.

Ancaq burada məktubların təkcə adı vardır. Poemanın məzmununu məktublar yox, daha çox həmin məktublarla əlaqədar hadisələr təşkil edir. Bu məktubların yazılmasına gətirib çıxaran hadisələr, onların yazılması zamanı qəhrəmanın keçirdiyi hallar, məktubu göndərmək üçün qasid axtarılması, qasidə yalvarışlar, məktubların sevgili tərəfindən necə qarşılanması, nə deməsi, aşiqin keçirdiyi intizarlı duyğular, nəhayət, sevgililərin qovuşması poemanın süjetini təşkil edən əsas epizodlardır.

Əsərdə göstərilir ki, eşqə biganə olan, eşq dərdinə tutulanlara əbləh deyən bir şəxs bir dəfə bağda yatarkən yuxuda bir gözəl görüb ona vurulur.

Qəmli, dərdli günlər keçirir. Sevgilisinin kim və harada olduğunu bilmir. Allaha yalvarıb ondan kömək istəyir. Hatifdən gələn səs məşuqənin yerini bildirir.

Məlum olur ki, aşiqin sevdiyi qız pəridir, yeri isə pərilər bağıdır. Hatifdən gələn göstəriş əsasında pərilər bağına gələn aşiq sevdiyi gözəli görür və daha

dərindən sevir. Pərilər bağının bağbanı onu əvvəlcə sərt qarşılayır, döyür, dərdini bildikdə xeyirxah məsləhətlər verir. Öz yerinə qayıdıb Səba vasitəsilə məktub göndərməyi söyləyir. Səba bir neçə dəfə Aşiqlə Məşuqə arasında vasitəçilik edib məktub aparır və sevgilinin sifariş və hərəkətləri haqqında Aşiqə xəbər gətirir. Sonra Ah, Huş, Göz yaşı işə qarışır, onlar da sevgililərin qovuşması üçün əllərindən gələni edirlər. Məşuqə əvvəlcə qəzəblənir, elçiləri danlayır, incidir, onların eyiblərini üzünə deyib utandırır. Aşiq on dəfə məktub göndərir, sevgisinin sabit olduğunu sübut edir. Aşiqi dözümlü, vəfalı görən sevgili ona vüsal vədəsi verir, sevgililər qovuşurlar. Poema səbrin tərənnümü ilə bitir.

Xətayi mövzunun imkanlarından bacarıqla istifadə edib rəngarəng təbiət lövhələri, insan duyğularının təbii, səmimi ifadəsi üçün müxtəlif boyalar tapıb işlədir. Sıx-sıx, lakin yerli-yerində verilmiş qəzəllər poemadakı lirizmi daha da gücləndirir. Şairin yaratdığı ən maraqlı təbiət təsvirlərindən biri poemanın başlanğıc hissəsində verilmişdir. 122 misradan ibarət olan bu təsvir müşahidələrin dəqiqliyi, rəngarəngliyi, təzəliyi, təravətli olması ilə indi də insanı heyrətə salır, şən əhvali-ruhiyyə oyadır. Bu təsvirlər o qədər dəqiqdir ki, rəssamlar onun əsasında heç bir çətinlik çəkmədən çoxlu lövhələr yarada bilərlər. Ədəbiyyatşünaslığımızda bahariyyə adlı janra bir qayda olaraq Xətayinin həmin təsviri ən səciyyəvi nümunə kimi göstərilir. Etiraf etmək lazımdır ki, ədəbiyyatımızda çoxlu təbiət təsviri yaradılmasına baxmayaraq Xətayinin yaratdığı həmin təsvir bu tipli olanlar içərisində müstəsna yer tutur. İlk misralardan başlayaraq bu təsvir insanı valeh edir:

Qış getdi, yenə bahar gəldi,
Gül bitdivü laləzar gəldi.

Quşlar qamusu fəğanə düşdü,
Eşq odu yenə bu canə düşdü.

Sərvin yenə dutdu damənin su,
Su üstə oxudu faxtə gu-gu.

Qönçə dəhəni çəməndə xəndan,
Gülməkdən ənar açıldı dəndan.

Durna uçuban həvayə düşdü,
Laçın aluban ovayə düşdü...

Bu təsvirdə təbiət insandan təcrid olunmur. Şən, şad bir qəlbin təbiətdən aldığı həzz, sevinc addımbaşı özünü hiss etdirir. Şair quşların fəğana düşməsini deyən kimi insan həyatı barədə araya tez bir söz atır, “Eşq odu yenə bu

canə düşdü" deyərək təbiətlə insan həyatını vəhdətdə götürdüyünü nəzərə çatdırır. Təbiətdə gül açıb quşlar nəğmə oxuyanda insan qəlbində də sevgi duyğularının oyandığını söyləyir.

Təbiət təsvirləri ilə yanaşı, poemada Aşiqin mənəvi iztirablarını əks etdirən qəzəllər də əsərin bədii təsir gücünü artırmağa xidmət edir. Aşiqin keçirdiyi müxtəlif xarakterli mənəvi hallar daha çox qəzəllər vasitəsilə açılır.

Aşiqin həsrəti, kədəri, gileyi, şikayəti bu qəzəllərdə əlvan boyalarla qələmə alınır. Bədii suallar, xitablar, təkrirlər xalq danışıq dilinin xüsusiyyətlərinə uyğun şəkildə elə məharətlə qurulur ki, səmimi səslənir, cəlb edir.

Ey yar, noleydi dilbər olsan,
Ey mah, noleydi mehtər olsan.
Bədtərdir işim, ləbim dəxi xüşk,
Tər qılsan oları, behtər olsan.

Qəhr ilə cəfanı xeyrə döndər,
Kim dutar əlin, əgər tər olsan?

Rəhm eyləgil indi bir müsəlman,
Bütsüz nə əcəb ki, kafər olsan.

Gümrahdurur könül qəmindən,
Vəslin saru anə rəhbər olsan.

Bu kiçik parçada Aşiqin güclü vüsal həsrəti qəzəl janrının imkanlarından istifadə edilərək çox dəqiq qələmə alınmışdır. Vüsal sevincini əks etdirən qəzəllərdə isə güclü bir fərəh və şadlıq əhval-ruhiyyəsi duyulur. Aşiqin də, Məşuqənin də dediyi qəzəllər burada boyalarını dəyişir, daha parlaq və oynaq olur. Bu şeirlərdəki sevinc və fərəh yaz seli kimi aşıb-daşır, yaz çiçəkləri kimi gülür:

Bəh, bəh ki, mənəm o cismi-bican
Kim, nagah ona ulaşdı bir can.

Bəh, bəh ki, mənəm o Xızra nisbət
Kim, ana yoluxdu abi-heyvan.

Bəh, bəh ki, mənəm şikəstə Yə'qub
Kim, buldu vüsali-xubi-Kən'an...

"Dəhnamə" mövzusunda Xətayidən əvvəl də əsərlər yazılmışdır. Hümam Təbrizinin, Marağalı Əvhədinin "Dəhnamə"lərini xatırlatmaq olar. Bu

ənənəvi süjeti Xətayi vəziyyət və hadisələrə uyğun olaraq yaratdığı lövhələr və başqa poetik tapıntılar vasitəsilə yeniləşdirə bilmişdir. Onu da nəzərə alaq ki, Xətayinin "Dəhnamə"si ana dilində yaranan ilk epik əsərlərdəndir. Epik əsərdə lirik janrlardan, o cümlədən qəzəllərdən istifadəyə Füzulidən, hətta Həqiridən əvvəl Xətayi poemasında rast gəlirik. Xətayi bu poemanı hakimiyyət uğrunda mübarizələrinin ən gərgin çağlarında, 1506-cı ildə, iyirmi yaşında olanda yazmışdır. O, həyatının bu gənc çağlarında təkcə Azərbaycan Səfəvi dövlətinin əsasını qoymaqla məşğul olmamış, həm də epik şerimizə "Dəhnamə" kimi orijinal keyfiyyətlərə məxsus bir əsər bəxş etmişdir.

Xətayi ədəbi irsinin mühüm bir hissəsini heca vəznində xalq şeri formalarında yazılmış əsərlər təşkil edir. Hökmdar şairin bu sahədəki xidmətləri xüsusilə təqdirəlayiqdir. Burada bircə bunu demək kifayətdir ki, heca vəznli şerimizin tarixi Xətayi ilə başlayır. Düzdür, bu forma xalq arasında Xətayidən əvvəl də olmuşdur, lakin onu yazılı ədəbiyyata gətirən, ona yazılı ədəbiyyatımızda yaşamaq vəsiqəsi verən Xətayidir. Şairin xalq şeri formalarına müraciət etməsi həyatın tələbindən irəli gəlirdi. Hökmdar və mürşid şair fikirlərini daha çox xalq şeri ənənələri əsasında tərbiyələnən, nisbətən az savadlı olan və ya tam savadsız olan geniş kütlələrə, müridlərə, qızılbaş əsgərlərə çatdırmaq üçün doğma janrların daha əlverişli olduğunu duymuş, onların sevdiyi, anladığı, başa düşdüyü formalardan istifadə etməyi özünə borc bilmişdir. Bu şeirlərdə xalq ruhuna və zövqünə yaxınlıq xüsusi yer tutur. Xətayinin siyasi, əxlaqi, estetik baxış və görüşləri bu şeirlərdə son dərəcə aydın və sadə bir tərzdə ifadə olunur. Ümumiyyətlə, Xətayi şerinə xas bir keyfiyyət olan sadəlik və aydınlıq onun heca vəznli şeirlərində daha qabarıq şəkildə nəzərə çarpır.

Xətayinin heca vəznində yazdığı qoşma, gəraylı, varsağı, bayatı, nəfəs və ilahilər indi də öyrənmək, ibrət almaq üçün nümunə olmaq dərəcəsindədir. Bu şeirlərdə mürəkkəb, ziddiyyətli bir dövrün hərarətli səsi duyulur. Şair özünün fəlsəfi düşüncələrinə işarə edərək oxucularını diqqətli, ehtiyatlı olmağa, əqidə, məslək yolunda sədaqətlə yürüməyə çağırır:

Dərindir bizim dəryamız, boylanmaz,
Min bir kəlam desəm, biri anlanmaz.
Kişi iqrarsız yollara bağlanmaz,
Yolları qoynunda yürüyüb gedər.

Bu parçalarda şairin və kamil bir mürşidin zamanın tələbindən irəli gələn ağıllı nəsihətlərini eşidirik. Şair oxucusunu, dinləyicisini doğruçu və cəsarətli olmağa, orda-burda qeybətlə, dedi-qodu ilə məşğul olmaqdan əl çəkməyə çağırır, həqiqət yolundan azmış insanlara qarşı dərin nifrətini bildirir. Xətayi bu tipli şeirlərinin mühüm qismini nəsihət, öyüd məqsədilə yazdığına özü də dönə-dönə işarələr etmişdir.

Gəl öyüd verəyim, öyüd alırsan,
Xidmət eylə genə gülü bulunca.
Karvan gedər, saqın, geri qalırsan,
Haman əldən qoyma yolu bulunca.

Sil-süpür qəlbini süddən bəyaz et,
Öldür nəfisini, şeytandan arıt,
Doxsan doqquz yerə çıxdı Bayəzid,
Halına münasib yeri bulunca.

Əgər diqqətlə yanaşsaq, görərik ki, Xətayi təkcə həyat və insan barədə real, ağıllı, humanist nəsihətlərlə kifayətlənmir, öz təriqət görüşlərinin təbliğinə də ayrıca diqqət yetirir. Yuxarıda misal gətirdiyimiz parçalardakı işarələr, oxucularına sufi deyə müraciət etməsi, məşhur sufi şeyxi Bayəzid

Bistamini nümunə göstərməsi fikrimizə ən yaxşı sübutdur. Mütəfəkkir şair öz humanist fikirləri ilə sufi baxışlarını heç yerdə bir-birindən ayırmır.

Bədii söz haqqında danışmaq, ona münasibətini bildirmək orta əsrlərdə yaşamış sənətkarlarımızın yaradıcılığında pozulmaz bir ənənə kimi yayılmışdır.

Nizaminin, Füzulinin, Saibin, Qövsinin, Vaqifin və başqa sənətkarlarımızın söz haqqındakı şeirləri, fikirləri bu həqiqəti bir daha təsdiq etməkdədir. Burada Xətayi də borclu qalmamışdır. Onun "Bir söz" rədifli gəraylısı Füzulinin "Söz" rədifli qəzəli kimi yadda qalan qiymətli sənət əsərlərindən biridir. Xətayi də Füzuli kimi sözün insan həyatındakı müstəsna rolundan, mahiyyətindən danışır, eyni zamanda özünü daim narahat edən məsələlərə toxunur:

Sözünü bir söyləyənin
Sözünü edər sağ bir söz.
Pir nəfəsin dinləyənin
Yüzünü edər ağ bir söz.

Söz vardır kəsdirər başı,
Söz vardır kəsər savaşı,
Söz vardır ağulu aşı
Bal ilən edər yağ bir söz.

Xalq şerinin bayatı şəkli də Xətayinin məhəbbətlə, məharətlə müraciət etdiyi formalardandır. Xalq şerinin bu sahədəki təcrübəsindən səmərəli şəkildə istifadə edən şair onların axıcılığına, yığcamlığına, atalar sözləri və xalq məsəlləri kimi aforistik məna daşımasına da xüsusi diqqət yetirmişdir.

Xətayi, işin düşər,
Gəlib-gedişin düşər.
Dişləmə çiy loğmanı,
Yerinə dişin düşər.

Xətayinin heca vəznində, xalq şeri formalarında yazdığı əsərlər yeni bir istiqamətin başlanğıcı olmuş, bu meylin get-gedə güclənib aparıcı mövqe qazanmasına gətirib çıxarmışdır. Onun istər heca, istərsə də əruz vəznində yazdığı əsərlər klassik yazılı ədəbiyyatımızın ən qiymətli nümunələrindən biri sayılır. Şairin irsi sonrakı dövrlərin ədəbiyyatı üzərində dərin izlər buraxmışdır.

Füzuli kimi dahi sənətkar Xətayinin bir sıra şeirlərinə cavab yazmış, ilk böyük əsəri olan "Bəngü Badə"ni ona ithaf etmişdir. Görkəmli el sənətkarı, hökmdar şairin müasiri Aşıq Qurbani onu "Mürşidi-kamilim, şeyx oğlu şahim" deyə tərənnüm etmişdir. Şah İsmayıl Xətayinin əsərləri istər əlyazmaları, istərsə də şifahi şəkildə geniş yayılmış, məclislərdə musiqi havalarının müşayiəti ilə ifa olunmuşdur. Bu günə qədər el sənətkarları arasında yaşayan "Şah Xətayi" havası onun irsinin xalq arasında nə qədər dərin nüfuz və hörmətə malik olduğunu bir daha təsdiq edir. Onun həyat və mübarizəsi ilə bağlı olaraq məşhur "Şah İsmayıl " dastanı yaranmışdır. Bu dastan əsasında M.Maqomayev eyni adlı opera bəstələmişdir. Yazıçı Ə.Cəfərzadənin "Bakı-1501", F.Kərimzadənin "Xudafərin körpüsü", Ə.Nicatın "Qızılbaşlar" romanları və bir sıra başqa bədii əsərlər Şah İsmayıl Xətayinin həyatı və şəxsiyyətinə olan güclü marağın ifadəsi kimi meydana çıxmışdır.

Xətayi irsinin oxuculara təqdim olunan bu nəşrində filologiya elmləri doktoru Əzizağa Məmmədov tərəfindən işlənmiş elmi-tənqidi mətn əsas götürülmüş, başqa nəşrlərdəki düzəlişlər də nəzərə alınmışdır. Tərtib zamanı mövcud nəşrlərdəki qüsurları düzəltməyə, orijinala yaxın daha dəqiq mətn hazırlamağa təşəbbüs göstərilmişdir.

Şairin klassik poeziya üslubunun qorunmasını təmin etmək üçün apostrof işarəsinin bu nəşrdə saxlanılması məqsədəuyğun bilinmişdir.

***Xəlil Yusifli***

# Qəzəllər

***

Hüsni-rüxsarın kim, oldu canü dil heyran ana,
Və'deyi-dövri-qəmərni tapşırır dövran ana.

Çün sənin hüsnün misali-Yusifi-Kən'anidür,
Yüzini hər kim ki, görməz, yoxdurur iman ana.

Atəşi-eşqində, ey xunxarə gözlü dilbərim,
Eylə yanmışdır bu bağrım, yoxdurur dərman ana.

Gül yanağın, dilbəra, bəs tazətərdir hər zaman,
Qanlı yaşımdan tökər hər dəm gözüm baran ana.

Zülməti-zülfində könlü bu Xətayi xəstənin
Xızra bənzər kim, görünməz çeşmeyi-heyvan ana.

***

Getdi ol dilbər, bəsi dərdü bəla qaldı mana,
Nə bəla, bil kim, yüküş cövrü cəfa qaldı mana.

Munca gəldim, mən gədayə hiç inayət qılmadın,
Eşigində qıldığım dəsti-dua qaldı mana.

Müjdə gəldi dilsitanımdan ki, qətl oldu rəqib,
Şükr kim, biganə getdi, aşina qaldı mana.

Anca kövkəb kimi yaş tökdi ğəmində gözlərim,
Yer ilə, gög ilə Keyvan həm baxa qaldı mana.

Ey Xətayi, zülfi tək arındı yüzdən Zəngibar,
Dilbəri-Çinü Xətən, xubi-Xəta qaldı mana.

***

Can olmaz isə, sən təki canan yetər mana,
Vəslin bu xəstə könlümə dərman yetər mana.

Hicrin cəfası eylə yıxıbdır bu könlümü,
Hər şəb qapunda naləvü əfğan yetər mana.

Zülmat içində abi-həyat istəməz könül,
Lə’lin zülali çeşmeyi-heyvan yetər mana.

Zahid, qoparma sən məni meyxanədən bu gün,
Ruzi-əzəldə yar ilə peyman yetər mana.

Gərçi, Xətayi, getdi əlindən vüsali-dust,
Hər dəm xəyali-didəyə mehman yetər mana.

***

Cana, könüldə həmdəm olan qəmdürür mana,
Gör kim, fəraq evində nə həmdəmdürür mana.

Ancaq yüzün görəndə sənin can degil mə’lul,
Zülfin kimi könül dəxi bərhəmdürür mana.

Dil təşnə olsa vadiyi-hicrində, qəm yemən,
Lə’lin zülali çeşmeyi-Zəmzəmdürür mana.

Neyçün sevərdi xəstə dil, ey bivəfa, səni,
Bu çox bəla ki, hicrin edər kəmdürür mana.

Miskin Xətayi vəsl ilə yüz il yaşar müdam,
Bu ömr kim, zəmanədə bir dəmdürür mana.

***

Ey cəmalın gülsitani baği-minudur mana,
Cənnəti-rizvan ki, derlər, ol səri-kudur mana.

Yüzün üstə zülfini ta gördüm, ey ruhi-rəvan,
Gecə-gündüz ağlamaq eşqində xoş xudur mana.

Hicr sərgərdanlığın çərxi-fələkdən görmənəm,
Bu cəfalərni qılan ol yari-məhrudur mana.

Gecələr ta sübh olunca uyxu gəlməz eynimə,
Ta xəyalın daima çeşmimdə qarşudur mana.

Anca yaş tökdi Xətayi firqətindən, ey sənəm,
Xancaru baxsam, gözümdə yer yüzü sudur mana.

***

Dilbəra, eşqin tənimdə sevgili candır mana,
Pərtövi-mehri-rüxin xurşidi-tabandır mana.

Dərdi-hicrindən sənin hərgiz şikayət qılmazam,
Hic əlac etmən tələb, neyçün ki, dərmandır mana.

Asitanın xakini vermən cəmii-aləmə,
Hər ayağın toprağı mülki-Süleymandır mana.

Ta cəmalın müshəfin gördüm, əya nuri-ilah,
Zikri-eşqin dildə laim virdi-Qur'andır mana.

Ey Xətayi, xubların cövri vəfadır aşiqə,
Firqəti mehr nigarın, cövri ehsandır mana.

***

Getdi ol məhru yanımdan, yüz cəfa qaldı mana,
Cövr bilmən kim, bəlayi-müntəha qaldı mana.

Ey pəri, çox işveyi-hüsninə məğrur olma kim,
Mülki-fani sanmagil kim, nə sana qaldı, mana.

Ta kim, ol xurşidrux getdi gözümdən su təki,
Göz yaşım anın yüzündən aşina qaldı mana.

Sən gedəndən bərlu anca zarü əfğan etmişəm,
Yerü gög, insü mələk cümlə baxa qaldı mana.

Dilbərin getdi, Xətayi, sən nedirsən dünyəni?
Çünki can getdi, bu tən, yarəb, niya[1] qaldı mana.

***

Hər dəm ğəmində naləvü ahim yetər mana.
Dünya yüzündə ol yüzi mahim yetər mana.

İsbat qılmışam rüxi-zərdü əşki-sürximi,
Də'viyi-eşqə böylə güvahim yetər mana.

Aləm xəlayiqi mənə cümlə həsud ola,
Ol asitanın iti pənahim yetər mana.

Zahid, ögünmə, taleyi, sə'dəm deyib yügüş,
Sən var işinə, bəxti-siyahim yetər mana.

Kəsmə ümid rəhməti-həqdən, Xətayi, sən,
Cümlə xətadə lütfi-ilahim yetər mana.

***

Dilbəra, ol ay yüzün xurşidi-tabandır mana,
Bağçan içindən axan su abi-heyvandır mana.

Məscidə varmaq nə hacət, dedim, ey zahid, mana
Ruy ilə zülfi anın küfr ilə imandır mana.

---

[1] Niya – "niyə" sözüdür. Qafiyə xatirinə orijinalda "niya" yazılmışdır. Biz də o cür saxlamağı məsləhət bildik.

Müddəilər tə’nəsindən sanmanız kim, mən dönəm,
Ol mənim canım içində cani canandır mana.

Mən səninlə söyləşəndə gər zimistan, gər bahar,
Hər nə çağ görsəm səni, aləm gülüstandır mana.

Ey Xətayi, çün sənə həqdən nəzərdir hər zaman,
Eşqin ilə bu həyatım baği-rizvandır mana.

***

Xaki-payin, dilbəra, bir taci-dövlətdir mana,
Bəs yüzün görmək sənin bəxtü səadətdir mana.

Çün ğəmi-eşqində ölməkdir həyati-cavidan,
Həq bilür ölmək degil ol, eyni-rahətdir mana.

Munca kim, dərdündə zəhmət çəkmişəm, ey bivəfa,
Çünki səndəndir bu zəhmət, cümlə rahətdir mana.

Gərçi məndən dər hicab olursan, ey arami-can,
Yüzünü görsətdigin eyni-inayətdir mana.

Düşdə gərdü dün Xətayi, yar olubdur həmdəmi,
Ya düşümdür, ya xəyalım, bu nə halətdir mana?

***

Ah kim, sən getdin, ey ay üzlü, can qaldı mana,
Can səninlə getdi, ismi-natəvan qaldı mana.

Taki sən getdin yanımdan, ey dilaramım mənim,
Haləti-vəslin könüldə pasiban qaldı mana.

Gərçi gülzari-cəmalın getdi qarşımdan mənim,
Dildə mehri-qamətin sərvi-rəvan qaldı mana.

Gər nihan oldu gözümdən ol pəri peykər sənəm,
Gögdə mah onun yüzündən bir nişan qaldı mana.

Taki səndən ayrı düşdi bu Xətayi xəstə dil,
Buyi-muyin müşk ilə ənbərfişan qaldı mana.

***

Həqq əzəl meyxanəsindən verdi bu cami mana,
Kainat əhli təəccüb qıldılar qamu mana.

Bilməz idim xətti-rüxsarın sifatın söyləmək,
Fitnə çeşmin qəmzəsi öyrətdi ilhamı mana.

Səbrü aramım gedibdir, görməzəm eynimdə xab,
Firqətin bir eyləmişdir sübh ilə şami mana.

Çox cəfa hasil olur səndən mana, ey bivəfa,
Aqibət eylər xəyalın rəsmi-bədnami mana.

Köynəyindən çıx dedim şol sərvi-gül xəndanıma,
Zərrəcə qayınmadı, göstərdi əndami mana.

Ey Xətayi, zülfinin zəncirinə qeyd etmə dil,
Danədir xali anın, həm zülfidir dami mana.

***

Xaki-payin sürmədir eynimə, ən’an et mana,
Gər qəbul olmaz muradim səndən, e’lam et mana.

Dərdimin dərmani rüxsarini görməkdir sənin,
Təşnəyəm, billah, dodağın şərbətin cam et mana.

Çün könül xalin ucundan düşdü zülfin qeydinə,
Bigünah öldürməgil hər ləhzə, aram et mana.

İstəmən zahirdə faş olmaq, anınçün gözlərəm,
Mehri-eşqin razini, ey yar, ilham et mana.

Bu Xətayidən götürgil möhnəti-hicranini
Ey pəri ru, tanrı içün ancaq ilzam et mana.

***

Nitqi-ənfasi-Məsihin dəmbədəm candır mana,
Çünki mən Xızram, dodağın abi-heyvandır mana.

Bilməzəm aləmdə, yarəb, gərdişi-əyyami-ğəm.
Lütfü ehsanınmıdır, ya cövri-hicrandır mana?

Vermişəm imanimi zənciri-zülfin küfrinə,
Bəndi-zülfin küfrini gördüm, nə imandır mana.

Dün rəqibi-kafiri-gümrahilə eybində kim,
Hər hekayətlər ki, qıldın cümlə pünhandır mana.

Bu Xətayi birlə solmuş bir dəxi, ey şahi-hüsn,
Ta dəhanın xatəmi-möhri-Süleymandır mana.

***

Ya ilahi, istərəm səndən bu ən’ami mana,
Edəsən həmdəm kim ol sərvi-güləndami mana.

Şol büti-namehriban hərgiz məni yad etmədi,
Bir məhəbbət qılmadı axır sərəncami mana.

Cövri-hicran çəkdigimdən qalmayıbdır taqətim,
Ya nəsib etsən noleydi səbrü arami mana.

Könlüm aldın bitəkəllüf, canımı almaqdadur,
Güldürür eşqində daim xas ilən ami mana.

Keçdi ömrün, ey Xətayi, uş bu zaye dünyada,
Şol vəfasız ləbləridən vermədi kami mana.

***

Dust yolunda halal olsun, dila, qeyrət sana.
Qeyridən bir zərrə minnət çəkmədin, rəhmət sana.

Ol sənəm əzmi-səfər etdi, könül, əylənmə kim,
Bir nəfəs didar gər kim, qalmaya həsrət sana.

El dilü din, siz çıxın evdən ki, dildarım gəlür,
Sən də, ey can, durma kim, biz vermişiz rüxsət sana.

Çareyi-behbudimi sordum müalicədən, dedi:
– Dərd dərdi-eşq isə, mümkün degil səhhət sana.

Ey Xətayi, sən şəhidi-ğəmzeyi-dildarsən,
Həşrdə rəşk aparar yetmiş iki millət sana.

***

Rövşən yüzün ki, zülfin olubdur niqab ana,
Nisbətdir əbr içində məhü afitab ana.

Eşqin sənin ki, məxzəni-gənci-ilahidir,
Andandurur ki, məskən olubdur xərab ana.

Eşqin nədir cahanda sənin, ey pəri sifət,
Heyrandurur fələkdə gəzən mahtab ana.

Uyxudə gözlərim necə görsün cəmalını,
Eşqində çünki gəlmədi bir zərrə xab ana.

Aşiqdurur yanağına zülfin Xətayi tək,
Andan düşər bir vəchilə bu piçü tab ana.

***

Eylədim bünyad əvvəl bəndə əz nami-xuda,
Ol yaratmış sərvəri-mərdan Əliyyül-Mürtəza.

Aciz olma, ey könül, münkir gərəkməz əhli-dil,
Həqtəala buyruğudur mur əlində əjdəha.

Eylə sultandır ki, yoxdur mislü həm həmta ona,
Buyruğundan kim, onun çıxmaz şəhü mirü gəda.

Kim ki, həqqə münkir oldu, qoy cəzasıdır onun,
Zərrəcə rəhm etməgil sən ta kim, ol halın duya.

İt rəqiblər tə’nə edərsə, Xətayi, həqqə sal,
Olma qəmgin kim, sana qıldığını həqdən tapa.

***

Canü dilmi qoymuşam yolunda mən, ey dilrüba,
Taki uyxuda görərmən sən təki bir məhluqa.

Taki eşqinin bəlası canıma kar eylədi,
Ey təbibim, bilməzəm kim, varmı bu dərdə dəva?

Daneyi xalinə ta kim, mürği-can qıldı təmə’,
Dami-zülfin həlqəsinə oldu canım mübtəla.

Ey mürüvvət mə’dəni, məndən kərəm qılma diriğ,
Qənbərinəm mən sənin, şahim, beeşqi-Mürtəza.

Özgə aşiqlər əgərçi dil verər dildarinə,
Bu Xətayi xəstə gör, yolunda qıldı can fəda.

***

Ey könül, sidq ilə hər kim şah ilən yoldaş ola,
Yüz gərək döndərməyə hər necə kim, yol daş ola.

Yolu gər daş ola, gər yay ola, gər oxü qılıc,
Mürşidindən dönənin mə’nidə ismi laş ola.

Qul gərək tanıda öz doğruluğun həq yoluna,
E’tiqaddan azmaya, gər bayü gər qəllaş ola.

Ey könül, cəhd eyləgil doğri ola gör şahə sən,
Aqibət qəlbi çıxar, hər kimsə kim, qəllaş ola.

Ey Xətayi, sidq ilə bu şah əyağinə gələn
Aqibət bir gün, gümansız, xəlq içində baş ola.

***

Hər kimə kim, səncələyin bir pərivəş yar ola,
Əqlü huşü xanimanından dəxi avar ola.

Başinə hər kimsənin düşsə saçın sevdaləri,
Tərk edüb dünyanı ömründən dəxi bizar ola.

Sən kimi aləmdə olmaz, gər olarsa, dilbəra,
Bu gözü cadusifət, həm qaşları məkkar ola.

Dərdü ğəm gəldikcə səndən şad olurmən, dilbəra,
Görüm, onları mənim könlümdə bərxurdar ola.

Qıla dönmüşdür vücudim möhnəti-cövrin çəkə,
Sağ gəzən düşmənlərin bu bəndə tək bimar ola.

Həmdəmin daim rəqib olmuşdur, ey gül yüzlü yar,
Xanda bir gül bitsə, lazımdır yanında xar ola.

Eşqinə hər kim giriftar oldu, ey kafir necə,
Şeyx Sən’an tək belinə bağlayan zünnar ola.

Vəsl ilən şad eylə, qurtar dərdü qəmlərdən məni,
Dərdi hicranın çəkən ki, bu dili-əfkar ola.

Varmıdır bir kimsə, yarəb, əhli-üşşaq içrə yar,
Bu Xətayi xəstə dil tək aşiqi-didar ola.

Ey bəndə, gər cəhanda pənahın ilah ola,
Kəmtər qulun məqamı sənin padişah ola.

Aşiq odur ki, də'vi edərsə sözinə,
Qanlı yaşilə çöhreyi-zərdi güvah ola.

Mehrabi var o zahidin, amma ki, aşiqə
Mə'şuqinin əyağı izi qibləgah ola.

Bədxahim ola cümlə cəhan, çəkməzəm məlal,
Çün ol sənəm mənimlən əgər nikxah ola.

Başdan ayəğə bəndə Xətayi xətaludur,
Zahid, xaçan ki, xubları sevmək günah ola.

***

Neylərəm ol cənnəti içində dildar olmasa,
Qoy anı viranə qalsun, baxçada bar olmasa.

Ğəflət əhli qaldı həqdən şöylə bil kim, binəsib,
Qanda didarı görür, ol bunda bidar olmasa.

Dünyada aşiq olan geydi məlamət donunu,
Hər yetən aşiq olurmi, dərd ana kar olmasa?

Aşiqin meydanda başi top yerinə çalınur,
Başını meydana qoymaz, kim ki, sərdar olmasa.

Doğruluq dost qapısıdır, doğru gəl gir bu yola,
Əgri meydanda utanur, onda iqrar olmasa.

Ey Xətayi, gövhəri xərc eyləmə nadanə sən,
Gövhərin qədrini bilməz, gər xiridar olmasa.

***

Hüsnün bəyani sureyi-Yasinü haləta,
Ey Kə'beyi-mübarəkü vey Mərveyi-Səfa.

Dövri-fələk verürsə mənə ixtiyarini,
Bir tari-muyini dü cəhanə qılam bəha.

Gəlmiş degil, gəlibdürə bilməz beruzi-həşr
Dövri-qəmər sənin təki bir şahi-məhliqa.

Kim ki, vüsalin istiyə ixlas ilə sənin,
Üstündə zilli-sayeyi-səadət dutar hüma.

Torpağə bas əyağini, ey gözlərim nuru
Kim, xaki-payini dilərəm bəhri-tutiya.

Şeydavü məstü valehü heyranəm, ey sənəm,
İxlas ilə yolunda mənəm rindü canfəda.

Xurşidü mahü cümlə sitarə bər əncümən
Qıldı sücud surətinə, ey əzizi-ma.

Ruh müsəvvər oldu yüzündən beabü gil,
Sənsən, şəha, bu əhsəni-təqvimə kimiya.

İnsan deyirdi göydə mələk yox idi hənuz,
Sən var idin cəhanda, əya dürri-ibtida.

Həmtasi ol şahənşahi-ə'zəm nigarımın
Yoxdur behəqqi-hörməti-övladi-Mustəfa.

Yarın yolunda xəstə Xətayi yoruxmə tiğ,
Olgil şəhidi-dəşti-biyabani-Kərbəla.

***

Taki rüxsarindən ərrəhman ələl-ərş-istiva,
Həm anın şə'nində münzəl ayəti-şəmsüz-züha.

Sureyi-Tahavü Yasinü təbarək hüsninə
Gör nə tə'zim eyləmişdir həq təala rəbbəna.

Münfəildir təl'ətindən dər fələk xurşidü mah,
Şol cəhətdən kim, yüzün nurundan almışdır ziya.

Valehü sərgəştədir aləmdə əhli-mə'rifət
Vəchinə, ey gövhəri-pakizeyi-ərzü səma.

Bu Xətayidən inayət kəsmə, ey şahi-kərəm,
Canə yetmişdir cəfadan lütf edib qılgil vəfa.

***

Minbə'd əgər mənimlə həbib olsa aşina,
Mən canımı yolunda onun eylərəm fəda.

Gülgün yüzün xəyalına düşdü könül yenə,
Bənzim saraldı dərd ilə manəndi-kəhrəba.

Darüş-şəfayə getmədigim canandan ötrüdür,
Ey cismimin həyatı, ləbindir mənə şəfa.

Çeşmin cəhanda fitnəvü aşub göstərir,
Hər dəm qiyaməti qoparır qamətin mana.

Yastan, Xətayi, yar eşiginə e'tiqad ilə,
Şamü səhər də dövlətinə eyləgil dua.

***

Vəchində peydadır sənin ənvari-zati-kibriya,
Ol yüzə qarşu dəxi şərməndədir şəmsüz-züha.

Leyli cəmalından cüda Məcnun kimi sərgəştəyəm,
Fərhadvar istər könül Şirin dodağından şəfa.

Cami-müsəffadan mana saqi içirdi bir qədəh,
Sufi nə bilsin mən necə ol camdən buldum səfa.

Hər kim ki, tövhid əhlidir, ol didü vadid əhlidir.
Ruzi-əzəldən ta əbəd istər kəmali-müntəha.

Mən cahilü nadan idim, ol hüsn içün heyran idim,
Ta gənc ikən pünhan idim, şimdi gözümdən zahira.

Eynül-yəqin hər sirrinə idrak edən insan idim,
Ey mə’rifətdən bixəbər, insafə gəlgil (bidəğa).

Canü cəhani sizsizin neylər Xətayi xəstə dil,
Səndən müdam ehsan dilər, çünki gədadır binəva.

***

Zərreyi-mehrində daim, ey cəmalı afitab,
Əbr yüzündən götürgil, dutmagil məndən hicab.

Dur dedim yarın kuyindən, ey rəqibi-rusiyah,
Xəstə bülbül var ikən neylər gülüstanda ğürab?

Ey gözü nərgiz, yüzü gül tək, boyu sərvi-rəvan,
Taki səndən ayrı düşdüm, xəstəyəm, halım xarab.

Cənnəti-vəslindən, ey canım, məni dur eyləmə,
Mən fəraqın atəşindən çəkmişəm dərdü əzab.

Bu Xətayi həqqinə daim dutubdur çox ümid,
Aqibət rəhm eylə anə saəti-yövmül-hesab.

***

Gəldi sürahi məclisə, rəf’ eyləmiş niqab,
Nur eylədi bu məclisi zərrinpər afitab.

Manəndi-cami-Xızr nəbidir misal ilən,
Abi-həyat içindəki can bəxş edən şərab.

Qül-qül deyər mütariyə, yə’ni di gəl, di gəl,
Baş endirir piyaləyə kim, qılma ictinab.

Mə’şuqi-sərvqamətü məhbubi-simtən,
Tavusi-rövzə cilvə qılır, çıxmış əz hicab.

İçmiş şərabi-lə’l çü sərxoş öpər əyağ,
Nəql eyləməkdə canü cigərdən dilər kəbab.

Ayineyi-Iskəndərü həm cami-Cəm budur,
İzhar edər cəhanı, qılur şeyxi çün şəbab.

Hər yerdə kim, otura, Xətayi, o xurvəş,
Gögdə məlayik oxur: “Ya leytəni turab”.

***

Bu aləm hüsninə heyrandır, ey dust,
Sana bu qönçə ləb xəndandır, ey dust.

Mən ol Yə’qub nisbət zar boldum,
Cəmalın Yusifi-Kən’andır, ey dust.

Hilali qaşını ta gördü çeşmim,
Bu canım eydinə qurbandır, ey dust.

Sana bu künfəkan valeh bolubdur,
Ki, hüsnin surəti-rəhmandır, ey dust.

Cəmalın səfhəsində xəttü xalın,
Yüzündə ayəti-Qur’andır, ey dust.

Sənin eşqin vücudim şəhdi içrə
Bu könlüm təxtinə sultandır, ey dust.

Xətayiyə, demişsən, cövr edim çox,
Yenə lütfü yenə ehsandır, ey dust.

***

Əhli-həyatə söylərəm, ey həyyi-laməmat,
Fani cəhanda kimsəyə munis degil həyat.

Baqidir ol ki, derlər ani vacibəl-vücud,
Fərmandır anə mümtənəat ilə mümkinat.

Can bəxş edər məmatə ləbin, ey Məsih dəm,
İsalərin əcəbmi dəmindən bu mö’cüzat?

Məhdi-zəmin içində ki, tifli-nəbat edər,
Ana həmişə dayeyi-lütf əmirdir nəbat.

Şətrənci-dəhr içindəki at oynadan xani?
Təqdir beydəqi ani bir dəmdə qıldı mat.

Çün qul olan qapında görər qədri-səltənət,
Bir qulunam ki, vermişəm ol qədr içün bərat.

Yetməz, Xətayi, zikr ilahın nüfusinə,
Bir zat imiş ki, irməz anə zat ilən sifat.

***

Sərxoşi-cami-ələstəm ta əbəd hüşyar məst.
Məsti-layə’qəl gəzərmən şəhr içində ar məst.

Sordular məndən ki, neyçün bidil oldun, mən dedim:
– Ol səbəbdən bidil oldum, dilbərü dildar məst.

Həqqinə aşiq olanlar şirin cana qalmasın,
Didara müştaq olanlar qibləsi didar məst.

Hər qəmişdən şəkkər olmaz, hər tikəndən tazə gül,
Hər keyikin göbəyindən nafeyi-tatar məst.

Adəmi oldur ki, anda hüsnü xülqü lütf ola,
Adəmi demə anı kim, cübbəvü dəstar məst.

Daima istər Xətayi şah cəmalın görməgə,
Şol gədayi-alihümmət talibi-didar məst.

***

Bu, qəmzə degil, bəladır, ey dust,
Bu, xəndə degil, cəfadır, ey dust.

Şəkkər ləbin ağzuma söyərsə,
Sögmək degil ol, duadır, ey dust.

Yer yüzi həvayi-qəddün ilə
Cənnət kimi xoş həvadır, ey dust.

Dil mürşidinə xəyali-zülfin
Həm xirqəvü həm əsadır, ey dust.

Aşiq olalı sana Xətayi
Balaına mübtəladır, ey dust.

***

Dilbəra, dərdimə dərman səndən özgə kimsə yox,
Həm dəxi könlümdə iman səndən özgə kimsə yox.

Hicr evində mən kiminlə həmdəm olum, ey sənəm,
Könlümün şəhrində mehman səndən özgə kimcə yox.

Xızr tək zülmətdə qaldım, bir mədəd qıl tanrıçün,
Təşnə içün abi-heyvan səndən özgə kimsə yox.

Hər nə kim, hökm eyləsən, eylə mənə, ey eşqi-yar,
Könlümün təxtində sultan səndən özgə kimsə yox.

Bu Xətayi xəstənin vergil murdaın, ya ilah,
Kim, mənə lütf ilə ehsan səndən özgə kimsə yox.

***

Ol pəri kim, bu cəhanda hüsninin həmtası yox,
Sərvi-rə'nanın xuraman qəddi tək balası yox.

Gecə-gündüz mən anın hicrində yanmaqdır işim,
Neyləyim kim, ol məhin məndən yana pərvası yox.

Ögmə, ey zahid, mana rizvanü gənnət bağini
Kim, anın yarın yüzü tək bir güli-həmrası yox.

Qılma, ey naseh, mənə zülfin sevərsən deyə tə'n,
Xansı aşiqdir kim, andan başda bir sevdası yox.

Gərçi çoxdur dünyada üşşaqi ol mahin, vəli
Bu Xətayi xəstə tək bir aşiqi-şeydası yox.

***

Bu könlüm şad olur qəmdən rüxi çün laləgun görgəc,
Misalı-mərdi-müflis nagəhan bir yaxşı gün görgəc.

Əgər ah eyləsəm, topraq olur dər ləhzə ahimdən,
Düşər hər parəsi bir yerdə kuhi-Bisütun görgəc.

Anunçün əyləməz ahi bu canım rəhgüzarində,
Həramilər çaparlar karivani çün tütün görgəc.

Məhü səyyarələr şərməndədir yüzünə baxmaqdan,
Fələk övcində xurşidi həyadən sərnigun görgəc.

Xətayi, rəsm beylə eyləyibdür ehtiraz ilə,
Hezaran naz edər xublar ki, aşiqni zəbun görgəc.

***

Həq kəlamı sevmişəm, sireyi-Yasindən mədəd
Kim, mana incili-fürqanın duasindən mədəd.

Ey behəqqi mö'cizati verdin ol Musayə sən
Kim, mana Musayi-İmranın əsasindən mədəd.

Ey yaradan aləmi ol şahi-xuban eşqinə,
Ol rəsuli-axiratın mö'cizasindən mədəd.

Kim ki, kamin almadı, dünyadə oldur binəva,
Binəvanıın vergilən, yarəb, nəvasindən mədəd.

Bu Xətayi der: – Əzəldən mən imamin quluyam,
Ey imami-həqq Əliyül-Murtəzasindən mədəd.

***

Munca cövr etdin mana, namehribanlıqdan nə sud?
Öldürəndən sonra, ey can, mehribanlıqdan nə sud?

Qəhrin ilən təlx keçdi çünki ömrüm dünyədə,
Yaşım yüzdən istəyübən şadimanlıqdan nə sud?

Bilməzəm neyçündürür düşmənligin bu növ ilən?
Lütfini görsətməyib, həm bu yamanlıqdan nə sud?

Çünki rəhmin yoxdurur mən piri-eşqin halinə,
Bu cəhan bağində, ey sərvim, cavanlıqdan nə sud?

Ey Xətayi, dilbərin çünkim cəfa eylər sana,
Bivəfa aləmdə böylə zindəganlıqdan nə sud?!

***

Fələknin gərdişindən dadü fəryad.
Məni ayırdı səndən dadü fəryad.

Məni yardan ayırdı bu zəmanə,
Zəmanə gərdişindən dadü fəryad.

Mənim iki cəhanım sevgili şah,
Səni sevmədigindən dadü fəryad.

Yaxam yırtım gedim əğyar əlindən,
Bu rəhmi yox dilindən dadü fəryad.

Necə biçarəvü büryan olubdur,
Xətayi yar əlindən dadü fəryad.

***

Ərzə yazdım mən sana, ey şahi-xubanım, mədəd.
Ərzi-halim sən bilürsən, dinü imanım, mədəd.

Şərmsarəm, pürgünahım sən bağışla, ya kərim,
Cümlələrni yarlığayan kamil insanım, mədəd.

Məstü Məcnun olmuşam mən firqətindən, ya həbib,
Ey həqiqət aləmində incə ərkanım, mədəd.

Bu əlimdür daməniniz, ya Əliyül-Murtəza,
Buyi-vəslindən sənin hər dərdə dərmanım, mədəd...

Hər yana əzm eylər olsan, sureyi fəth oldu fəth,
Açılar bağlu qapu dövlətlü dərbanım, mədəd.

Bu Xətayinin günahin sən götürmə yüzinə,
Şahi-mərdan, şiri-yəzdan, sirri-sübhanım, mədəd.

***

Hüsn ilə ziba imişsən, ya Əli, səndən mədəd,
Görk içində bay imişsən, ya Əli, səndən mədəd.

Eşqlə mə’şuqü aşiq səndə olmuşdur zühur,
Sirri-ma ovha imişsən, ya Əli, səndən mədəd.

Eşq oxirlər adini rahi-həqiqətdə sənin,
Eşq ilə şeyda imişsən, ya Əli, səndən mədəd.

Övliyalar, ənbiyalar çoxdurur, illa ki sən,
Cümlədən ə’la imişsən, ya Əli, səndən mədəd.

Mö’minə irşad edirsən lütfü ehsanü kərəm,
Kafirə qovğa imişsən, ya Əli, səndən mədəd.

Yerdə, gögdə istəmir şol kor münafiqlər səni,
Zahirən peyda imişsən, ya Əli, səndən mədəd.

On səkiz min aləmin sirdaş sən sirrindədir,
Mürşidi-bina imişsən, ya Əli, səndən mədəd.

Qisməti-ruzi-əzəldə həm müini-Mustəfa,
Hərgisi-şəhla imişsən, ya Əli, səndən mədəd.

Anca kim, seyr eylədim, gəzdim vücudim şəhrini,
Misli-bihəmta imişsən, ya Əli, səndən mədəd.

Bu Xətayi xəstədil birliginə iqrar edir,
Vahidi-yekta imişsən, ya Əli, səndən mədəd.

***

Qamətindən münfəildir sayeyi-sərvi-bülənd,
Həsrətindən ər’ərü şümşad olubdur dərdmənd.

Arizin bağında zülfin tarinə bənd eyləgil,
İstər isən naleyi-bülbüldən olmaq bəhrəmənd.

Sərbəsər bir tareyi-muyin bəhasıdır sənin
Mülki-Təbrizü Cəğatayü Xorasanü Xocənd.

Ta ki, gəldi, ey sənəm, eşqin xəyalı başimə,
Dünyəvü üqba qəmindən keçdimü oldum ləvənd.

Canımı eşqinə təslim eylədim ixlas ilə,
Ol pəri peykər məni, yarəb, nədən qılmaz pəsənd?

Dər biyabani-təhəyyür qalmışam bixürdü xab,
Valehi sərgəştəvü heyranü zarü müstəmənd.

Bu Xətayi ləblərin eşqində gər ah eyləyə,
Ahinin suzindən olur xak ol kuhi-Səhənd.

***

Ta ki, dərdindən olubdur yürəgim səd parələr,
Tiği-eşqin yürəgimni səd hezaran parələr.

Ay yüzündən ayru gördüm dideyi-bixabimi,
Gög yüzində uymaz oldu hər gecə səyyarələr.

Zahida, sən fariğ ol, ahimdən ikrah eyləmə,
Kim, mənim bağrımda çoxdur ğəmzələrdən yarələr.

Yaralı bağrım qanın tökdü gözümdən dəmbədəm,
Gör nələr qıldı mana şol nərgisi-xunxarələr.

Çıxmiyə miskin Xətayi könlü zülfindən, nola,
İşi seyr olur anın hər xanda var səyyarələr.

***

Həsrətin dərdindən, ey can, bağrım oldu parələr,
Suzi-eşqin yürəgimdə hər dəm eylər yarələr.

Yandırub hicran odu könlümü verdi badə gör,
Dutdu əflaki-cəhani geydi gög də qarələr.

Düşdü hüsnin mənzərinə canü dil bu gözlərim,
Çarə yox, naçar olubdur, neyləsin biçarələr.

Tərk edüb qoydum, gedərəm, xanü mani, mülki uş,
Hicrin etdi mən qəribi üştə gör avarələr.

Öldü dərdindən Xətayi, bir qədəm rəncidə qıl,
Qəbrinə basgil, eşitgil səd hezaran nalələr.

***

Ol pəri peykər ki, çeşmimdən nihan olmuşdurur,
Baqi ömrüm olsun ol, cismimdə can olmuşdurur.

Yarəb, ol gözlər nə bağın nərgisi-şəhlasıdır?
Kim, qəmindən cismü canım natəvan olmuşdurur.

Eylə kim, bülbül yeri gülşəndir, ey gül yüzlü yar,
Könlümə kuyin məqami gülsitan olmuşdurur.

Anca çəkdim möhnəti-hicrin qəmin, ey bivəfa,
Cövri-eşqindən vücudim natəvan olmuşdurur.

Ta Xətayi gördü ol hüsnü cəmalın, ey günəş,
Gör necə aləm dilində dastan olmuşdurur.

***

Könlümü alan mənim ol dilruba yarımdurur,
Gərçi könlümi alur əmma ki, qəmxarımdurur.

Necə kim, cövrü cəfa qılsan bu mən dilxəstəyə,
Eyləmən andan şikayət kim, vəfadarımdurur.

Gecələrdə uyxu gəlməz gözümə, qan ağlaram,
Gögdəki kövkəb degil, şol çeşmi-bidarımdurur.

Tanrı içün yola gəlsən, bir qədəm ahəstə bas,
Ayağın altında topraq cismi-bimarımdurur.

Bu Xətayi afitabə eylədi gögdə nəzər,
Yar aydır kim, ana bax, əksi-rüxsarımdurur.

***

Dilbəra, səncələyin, billah ki, yarım yoxdurur,
Bir saat sənsiz mənim səbrü qərarım yoxdurur.

Düşmüşəm eşqin qəminə, yet mənim fəryadimə,
Səndən özgə hiç kimsə qəmgüsarım yoxdurur.

Arılıq, billah, sevərmən mən səni, ey dilrüba,
Ta təmami sevmişəm, busü kənarım yoxdurur.

Gər məni öldürsələr, sən eylə bilgil, ey nigar,
Bu məhəbbət ətəgin əldən qoyarım yoxdurur.

Aqil aydır: – Ey Xətayi, ixtiyar əldən qoma,
Aşiqəm bir dərd əlində, ixtiyarım yoxdurur.

***

Bu məşrəbə bir səfayi-candır,
Qərrabə dibi ana məkandır.

İçi doludur əz abi-heyvan,
Aləmdə nişanı binişandır.

Can dövlətini bilür təmamət,
Sən sanma ani ki, bizəbandır.

Dövri-yüzinin çü məh təmamət
Sərpuş çü şəkli-asimandır.

Vəsfində onun Xətayi heyran,
Gər sən’ət isə budur hamandır.

***

Bu tübşi kim, yeri dər ziri-padır,
Fələklər çərxi anə pəhnümadır.

Həmişə xakə sanmışdır özüni
Anınçün gözlər içrə tutiyadır.

Müdəvvərdir, müsəvvərdir, münəvvər,
Yer üstə sureyi-şəmsüz-zühadır.

Anın mir'atinə bax, həqqi gör kim,
Kim, ol aineyi-geytinümadır.

Yüzi ol şəms imiş bəzm əhli içrə,
Təala şanəhü, əhli-liqadır.

Anınçün olmuş anın şərbəti pak
Ki, heyvan suyilən yüz tən nəvadır.

Xətayi, şükr qıl həq qüdrətinə
Ki, həqqin bilməyən əhli-xətadır.

***

Bu şahi-pürkərəm sahib nəzərdir,
Vilayətdir, yəqin nuri-bəsərdir.

Quşanə ğazilər seyfü silahi,
Münafiq canına xövfü xətərdir.

Yəzidin ləşkəri yüz min olursa,
Vilayət ləşkərindən bir yetərdir.

Münafiq ləşkəri bir ğazi görsə,
Qoyun ki, qurd toxur, andan betərdir.

İşarət qılduğunca bir nəzər şah,
Önündə Şümrü Mərvan dərdədərdir.

Nişani ol günəş təl'ətli şahın
Başında tacü belində kəmərdir.

Olar kim, cəhli-təndir sirri-qüdrət,
Ani arif bilür incə xəbərdir.

Cahangir ğazilər meydanə girsə,
Xəvariclər ayağda payi-sərdir.

Çü rəhmət yağmuru irdi zəminə
Ki, hər bir ğazinin yüz nami vərdir.

Yəzidə zəxmi-seyfü tirü xəncər
Başından getməsin tiğü təbərdir.

Əli bəhri-həqiqətdir, yəqin bil
Həyati-cavidani mö'təbərdir.

Vilayət bəhrinə yol bulmuyanlar
Gözü ə'mavü əhməq, bixəbərdir.

Nəfəs gövhərdir ani bir bilənlər,
Sözin bir söyləyənlər gerçək ərdir.

Qızıl ələm, qızıl bayraq, qızıl tac
Geyinsə qazilər, ol gün həzərdir.

Xətayi, şah yolunda can fədadır,
Çe cayi-mülkü malü simü zərdir.

***

Xar oldu yürəgim hicrində, ey gül yüzlü yar,
Yar bağrım arasın, gör kim, necə xar anda var.

Varma yanımdan mənim, ey hicri-dilsuzani-dust,
Dust-düşmən xamusi ağlar mənimçün zar-zar.

Zar-zar ağlar çü bülbül gül yüzünçün mürği-can
Candan etmişdir məni cövr ilə dövri-ruzigar.

Ruzigarım tirədir sənsiz, əya arami-dil,
Dil neçük aram dutsun, həddən ötdü intizar.

İntizarəm və'deyi-vəslin yolunda hər zaman,
Hər zaman divanə tək dağlara düşdüm biqərar.

Biqərar oldum saçın tək rüxlərindən ayru mən,
Mən neçük aram edim sənsiz ki, oldum dilfikar.

Dilfikar oldu Xətayi firqətindən ruzü şəb,
Ruzü şəb vəslin xəyalı canda qaldı yadigar.

***

Əzəldən şah bizim sultanımızdır,
Pirimiz, mürşidimiz, xanımızdır.

Şaha qurban gətirdik biz bu canı,
Şahın sözü bizim imanımızdır.

Həsudə yoxdurur, yalansıya mərg
Ki, gerçək söhbəti bürhanımızdır.

Şahı hər deyibən girdik bu yola,
Hüseyniyüz, bu gün dövranımızdır.

Biz imam qullariyüz sadiqanə,
Şəhidlik, qazilik nişanımızdır.

Yolumuz incədir, incədən-incə
Bu yolda baş verək, ərkanımızdır.

Xətayiyəm, məvali, sirri-Heydər,
Şahı həq bilmiyən düşmanımızdır.

***

Cana, qəmində gözlərimə su gəlir-gedir,
Seyl oldu, daşdı, şimdi behər su gəlir-gedir.

Vəsl olmaz isə yüzünü görmək mana müdam,
Kuyindən, ey sənəm, mana bir bu gəlir-gedir.

Bixab qaldı kövkəbə nisbət bu gözlərim,
Hər gecə özgə gözlərə uyxu gəlir-gedir.

Ta görmədi gözüm səni, ey sərv boylu yar,
Sənsiz həmişə gözlərimə cu gəlir-gedir.

Miskin Xətayi görmədi çeşmin kimi sənin,
Səhra içində munca ki, ahu gəlir-gedir.

***

Vücudini bu könlüm can demişdir,
Ləbini lə'l ilə mərcan demişdir.

Saçın rəngin şəbi-qədr oxuyanlar
Yüzün nurin məhi-taban demişdir.

Bu könlüm eşqini, ey qəmgüsarım,
Vücudim şəhrinə sultan demişdir.

İki gözüm yaşı hər dəm yüzimə
Birin Nilü, birin Ümman demişdir.

Əyağın tozinə, ey nuri-rəhman,
Xətayi canını qurban demişdir.

***

Hər zaman kim, qarşuma ol dilbəri-məhru gəlür,
Canıma bir od düşür, bu dilimə yahu gəlür.

Sinəmi qarşu dutaram kuyinə ol dilbərin,
Sağınuram dəmbədəm Veysi-Qərəndən bu gəlür.

Həsrətindən dilbərin düşdüm Sərəndib kuhinə,
Aşiqi-dilxəstəni hər dəm sorur ahu gəlür.

Canımı qurban qılardım yoluna ol dilbərin
Ol zəmandan kim, deyərlər ol büti-məhru gəlür.

Ey Xətayi, sən vücudin cuyini pak eyləgil,
Çünki pak olsa ana sərçeşmədən bir su gəlür.

***

Rüxlərin müshəf, nigara, qaşların mehrablər,
Baxdım, ol yüzdən mana fəth oldu yüz min bablər.

Zərrə ikən gün təki aləmdə məşhur olmuşam,
Ta mana düşdi sənin mehri-rüxündən tablər.

Gər sənin yüzün degil aşiqlər içün qibləgah,
Bəs nədən oldu hilali qaşların mehrablər?

Ta sənin zülfü rüxüni görmişəm hər sübhü şam,
Gecə-gündüz giryədən gəlməz gözümə xablər.

Çini-zülfün bəndinə düşdü Xətayi xəstə dil,
Şərbəti-lə’lindir anə qənd ilə innablər.

***

Aşiq isən gəl bərü kim, cani-canan məndədir,
Zahida, sən xandasan kim, nuri-iman məndədir.

Məndədir yer ilə gögün hikməti, həm qüdrəti,
Abü atəş, xakü badü cümlə ərkan məndədir.

Həq təala dörd kitabi gögdən endirdi yerə,
Mən anı istəməzəm çün külli-fürqan məndədir.

Katiba, ağü qəraye baxma, səni azdurur,
Aç qulaq, dinlə sözüm, avazi-Qur'an məndədir.

Pəhləvanlar çox cəhanda, Rüstəmi-Zal olmuşam,
Həm İskəndər hikməti, mülki-Süleyman məndədir.

Əyyuba çəkdirdi çox dərdi bəlavü möhnəti,
Gəl məni istəş, verəyim dərdə dərman məndədir.

Yə'qubi gör zarü giryan Yusifi-Kən'an içün
Piri-künci-xəlvətəm uş Misr sultan məndədir.

Şahi-Mərdanın, Əlinin aliyəm, övladiyəm,
Zülfüqarü tacü Düldül uş bu nişan məndədir.

Açarım dini-Məhəmməd, məzhəbi-Cə'fər yəqin,
La fəta illa Əli, bu sirri-pünhan məndədir.

Mən şaha bu canımı sidq ilə qurban qılmışam,
Gər qəbul qılsa vilayə, eydi-qurban məndədir.

Çün Xətayiyəm, şahın vəsfini daim söylərəm,
Eşqilə bel bağlaram, dəftərlə divan məndədir.

***

Ey həq əhli, sən sənin cismində beytüllahi gör,
Xancaru əzm eyləsən, lövhində ərşüllahi gör.

Adəmin şə'nində kərrəmna dedi nitqi-ilah,
Əhli-mə'nasan, həqiqət sümmə vəchüllahi gör.

Zakirəm, zikr eylərəm, könlümdə özgə kimsə yox,
Natiqəm, nitqi-hidayət, gəl həbibüllahi gör.

Hazihi-cənnati-ədnin dəftərin şərh eyləyən
İblis olma, gəl sücud eylə bu babüllahi gör.

Lövhi-məhfuzin Xətayi əbcədin qıldı bəyan,
Div degülsən, xatəmin xətmində Fəzlüllahi gör.

***

Əzəldən ta əbəd heydər gəlübdür,
Adəm övladinə sərvər gəlübdür.

Əli şiri-xudadır, şahi-mərdan,
Məhəmməd həqqə peygəmbər gəlübdür.

Aşiqlər qibləsi yüzündür, ey dust,
Qaşın mehrabinə mənbər gəlübdür.

Ki həqdən Zülfüqar oldu Əliyə,
Əli qulluğuna Qənbər gəlübdür.

Əli xişm ilə doğradı Vu cəhli,
Xəmir tək dəstinə Xeybər gəlübdür.

Ala gözlər mənim imanım aldı,
İki zülfin yenə ənbər gəlübdür.

Suyi-heyvan içün zülmat içində
Xətayi Xızrü Iskəndər gəlübdür.

***

Şəha, ol zülfi-müşkinin nə ziba çini-pürçindir
Ki, hər bir tari ol zülfin bəhayi-Çinü Maçindir.

Xətindir ayəti-rəhman ki, həqdən münzəl olmuşdur,
Ana derlər kim, ol sünbül səvadi-nafeyi-Çindir.

Tükəndi Yusif əyyami sənin dövrani-hüsnündən,
Xəbər ver xublar içində yalandır bu xəbər, çindir?

Şikarı aşikar eylər gözün bu bazü şəhbazi,
Könüllər seydinə yarın gözü şahanə laçindir.

Güli-sirabi-hüsnində nə nisbət ol siyəh xalın,
Bu rə'na beççeyi-hindu gülüstan içrə gülçindir.

Xətayi ta anı gördü, özündən əl yudu külli,
Anın çəngali-çəngindən şikar olmuş gögərçindir.

***

Dilbəra, hüsnini sane afitab etmişdurur,
Bilməzəm neyçün gözümdən dər hicab etmişdurur.

Gəl xumarım yaz mənim vəslin meyindən, ey pəri,
Şol şərabın həsrəti bağrım kabab etmişdurur.

Ta yaman göz dəgməyə, ey mah, hüsnin bağına,
Həq-təala zülfini pərri-ğürab etmişdurur.

Hafizi-Qur'an təki aşiqlər əzbər qılmağa,
Həq cəmalın ayəti ümmül-kitab etmişdurur.

Ğəm yemən könlüm ki, məskən buldu eşqin küncüni
Gərçi ol viranəni hicran xərab etmişdurur.

Ey məhi-namehriban, sorma Xətayi halını,
Firqətin ol xəstəni təhti-türab etmişdurur.

***

Könül ta kim, ğəminlən aşinadır,
Qərarü səbrdən mütləq cüdadır.

Könül pənd almadı, sevdi yüzünü,
Ana bu dərdü möhnətlər səzadır.

Gəl ey həmdəm, həzər qıl, eşqə düşmə,
Bəladır xubları sevmək, bəladır.

Nola aşiqləri öldürsən, ey dust,
Ləbin bir busəsi yüz xunbəhadır.

Könül bir yarə vermişdir Xətayi,
Eşigində səlatinlər gədadır.

***

Hər sübhdəm ki, kuyi-sənəmdən səba gəlür,
Qəmgin könül məqaminə yüz min səfa gəlür.

Şadü fərəh bulub dilü canım, zəbanimə
Əhlən və xeyr məqdəmü səd mərhəba gəlür.

Bir busəsinə canü dil istər bəha sənəm,
Gərçi birinə yüz dilü canım bəha gəlür.

Mə'nidə gərçi aşiqü mə'şuq birdürür,
Məndən dua gedir, nişə səndən cəfa gəlür.

Bağışlagil Xətayi günahın, əya pəri,
Bəxş edə necə ki, quldan xəta gəlür.

***

Mahimi gördüm ki, yüzindən niqab almış gedir.
Pərtövi-nurindən anın afitab almış gedir.

Dövri-hüsnindən anın, ey yaşlu çeşmim, uymagil
Kim, şəbi-zülfindən anın ruz xab almış gedir.

Dilbərim cami-şərab içmiş, eşitdim nəql içün
Aşiqi-dilxəstə bağrından kəbab almış gedir.

Ol pəri gedəndə aləm necə heyran olmasun,
İşvəvü kirişməvü nazü itab almış gedir.

Ol sənəm rə’na gedir, yer üstə çəkmiş damənin,
Bu Xətayi xəstə ol yerdən türab almış gedir.

***

Ta ki, düşdüm hicrinə, könlüm fəğanə başlər,
Gəldi ahimdən mənim fəryadə dağü daşlər.

Hüsnini yad eyləsəm, ey sərv boylu dilbərim,
Firqətindən çeşmə tək axar gözümdən yaşlər.

Mehri-ruyin sərbəsər sehr ilə dutdu aləmi,
Fitnəvü qövğayə saldı ol göz ilən qaşlər.

Eşqə dil verdin deyə cövr etmə, ey zahid, mana,
Can verür mə’şuqə daim aşiqi-qəllaşlər.

Nasehə, eyb eyləmə miskin Xətayi şe’rinə,
Çün həqə mə’lumdurur könlündə sirrü faşlər.

***

Könül bir yarı sevdi kim, pəridir,
Cahan içrə gözəllər sərvəridir.

Boyi bağ içrə sərvi-nazə bənzər,
Yanağı həmçü vərdi-əhməridir.

Yüzidir nisbəti-xurşidi-taban,
Fələkdə məh aninçün Müştəridir.

Əgər xaqan, əgər fəğfur olursa,
Eşigi itlərinin kəmtəridir.

Yüzi səhni-gülüstan içrə güldür,
Saçının buyi müşkü ənbəridir.

Kim anın vəslinə bir dəm irişsə,
Cəmii-mülki-aləmdən bəridir.

Saçının rəngidir çün leylətül-qədr,
Cəmali nuri şəmsi-xavəridir.

Əzəldən ani sevdim canü dildən,
Sağınmasun ki, eşqim sərsəridir.

Baxub heyran olur hüsninə aləm,
Xətayi xəstənin ol dilbəridir.

***

Ey könül, vəqti-bəhar etdü, xəzan olmuşdurur,
Su kənarında sənəm sərvi-rəvan olmuşdurur.

Ey fələk, dünya yüzində dövri-hicran keçdi çün,
Ol büti-namehribanım mehriban olmuşdurur.

Şərh edəndən bərlü şirin ləblərin övsafini
Mürği-canım tutiyi-şəkkər zəban olmuşdurur.

Gərçi düşmən tə’nəsindən çox cəfa çəkdim, vəli
Şükr kim, işim bekami-dustan olmuşdurur.

Döşədi yüz dürlü xali bəzm üçün fərraşi-sün’,
Saqiya, gəl kim, cəhan baği-cinan olmuşdurur.

Simü zərdən şaxlər doldurdu dəstü damənin,
Məclisi-şabaş içün gövhərfəşan olmuşdurur.

Uğraşanda ta ki, eşqin zərrə qılur dağları,
Bu Xətayi xəstə andan natəvan olmuşdurur.

***

Bizim ol dilrüba canınəmizdir,
Məgər ol can degil cana, nəmizdir?

Yanarmən şəm'i-ruyin həsrətindən,
Deməzsən ol bizim pərvanəmizdir.

Fəraqində nə fikrim vardır, ey dust,
Vüsalın hər gecə mehmanəmizdir.

Gözün sərməstdir, boyun süpahi,
Sözün nəqlü ləbin peymanəmizdir.

Güləndə dişlərin ağzında, ey can,
Sədəf içindəki dürdanəmizdir.

Səri-zülfin içində danə xalin
Könül quşinə damü danəmizdir.

Xətayi dedi: – Kimdir? – Bəndəniz də
Dedi: – Bir aşiqi-divanəmizdir.

***

Əya gün yüzlü, çöhrən ayə bənzər,
Boyun bir sərvi-xoş balayə bənzər.

Xədəngi-can fədadır qəmzən, ey dust,
Qaşın üstə qurulmuş yayə bənzər.

Cəhanda bülbül olsam mən əcəbmi?
Sənin yüzün güli-həmrayə bənzər.

Yüzün şövqilə lə'lin həsrətindən
Gözüm yaşi behər su çayə bənzər.

Məlayik, hurinin gər hüsni xubdur,
Yüzün andan dəxi zibayə bənzər.

Sifatın oxusa gülşəndə mütrib,
Könül fəryadı çəngü nayə bənzər.

Xətayi, dilbərindir huri-rizvan,
Otağı cənnətül-mə’vayə bənzər.

***

Dilbəra, canımda dərdin bir dəva nisbətlüdür,
Hər cəfa gəlsə mana səndən vəfa nisbətlüdür.

Bu cərahət cismimə oxun gələndə ün verür,
Ol mana əhlən və səhlən mərhəba nisbətlüdür.

Gər mana nifrin edər düşmən, mən andan qəm yemən
Kim, münafiqdən gələn qarğış dua nisbətlüdür.

Abi-çeşmimdən xəyalın hər zaman əksilməsün
Kim, anın əksi gözümdə tutiya nisbətlüdür.

Eşq ilən laf etmə, ey miskin Xətayi, əbsəm ol
Kim, bu mənzildə səlatinlər gəda nisbətlüdür.

***

Din Məhəmməd dinidir səllə əla sahib vüqar.
Kövsərin suyin verən şahım Əlidir şəhsüvar.

Həm səxidir, həm səxadır, kainatın eynidir,
Kimsə nə bilür, anın sirrin bilür pərvərdigar.

Dedilər kim, bu cəhanın nuri kimdir, kim ola?
Mir Həsəndir, şah Hüseynin alı oldu yadigar.

Daş yarıldı, çıxdı Düldül yəhərü yügən ilə,
Ey münafiq, yola gəlgil, eyləmə şahdan kənar.

Xanda varsan, ey Xətayi, sən bu ləfzi söyləgil;
"Lafəta illa Əli, lasöyfə illa Zülfiqar".

***

Növcəvan ol pir ikən dövran ki, canan dövridir,
Şad ol, ey xəstə könül kim, dərdə dərman dövridir.

Zülməti-hicranə söylən hökmini tərk eyləsün,
Bir günəş doğdu arayə, mahi-taban dövridir.

Lal oturma, söylə, ey can mürği, gəldi növbəhar,
Getdi qış vəqti aradən, uş gülüstan dövridir.

Aşiqə mehr etdi dilbər, qalmadı cövri-rəqib,
Küfr aralıqdan arındı, şimdi iman dövridir.

Ömr içün qəm çəkmə, ey dil, nuş qıl maül-həyat,
Dilbərin şirin ləbindən abi-heyvan dövridir.

Naümid olma cəhanda, ey gədayi-binəva,
Dərgəhi-sultanə gəl kim, lütfü ehsan dövridir.

Möhnəti-dünyadən, ey dil, fariğ ol, sürgil murad,
Xürrəm ol, qəm çəkməgil kim, zilli-sübhan dövridir.

Gəzməgil aləmdə sərgərdan, könül, pərvanə tək,
Xoş münəvvərdir cəhan, şə'mi-şəbistan dövridir.

Dudi-ahindir, Xətayi, gögdə bulutlar sənin,
Durmayıb tök göz yaşın kim, əbrü baran dövridir.

***

Ey ki, sərxoşdur dü çeşmin, ləblərin peymanədir,
Ol səbəbdən aşiqin daim yeri meyxanədir.

Necə qəvvas olmayım yaşımda kim, ol dilbərin
Ləblərin lə'li-Bədəxşan, dişləri dürdanədir.

Verməzəm dünyavü üqba dövlətinə eşqini,
Dünyəvü üqba mana bir yanə, ol bir yanədir.

Sanma, ey çeşmim, sana biganədən ümmid ola,
Gör nələr qıldı könül, kim həmdəmü həmxanədir?

Bu Xətayini rəha qılmaz saçun zəncirdən,
Sanma kim, uslandı ol miskin, hənuz divanədir.

***

Bu sürahi bir dilarami-pəri nisbətlüdür.
Şəkli bir məhbubi-şuxin peykəri nisbətlüdür.

Oturur məclisdə bir zərrinkülahü simtən,
Asılu zülfi-müsəlsəl ənbəri nisbətlüdür.

Yoxsa bir şəhzadeyi-zərrin kəmərdir, pürxütut,
Ol kəmər üstə əliflər xəncəri nisbətlüdür.

Təxti-simin üstə oturmuş Süleyman hökm içün,
Əldə bir zərrin əyağ əngüştəri nisbətlüdür.

Hər tərəfdən görünür yüzində yüzlü surəti,
Filməsəl ayineyi-Iskəndəri nisbətlüdür.

Sidq ilən bel bağlamış, durmuş fütuhi-rəzm içün,
Ğazilər yanında anın ləşkəri nisbətlüdür.

Hövzi-cənnətdir cəvahirdən tökülmüş rövzədən,
Səlsəbil içində abi-kövsəri nisbətlüdür.

Yoxsa doğmuş arədə bir afitabi-şəm'i-bəzm,
Çeşmi-mərdüm anə hər su müştəri nisbətlüdür.

Bəzl edər bəzmin Xətayi abi-kövsərdən müdam,
Şahi-mərdanın-Əlinin Qənbəri nisbətlüdür.

***

Bir pəri heyraniyəm, bilmən məkani xandadır?
Kimsə bilməz dünyədə namü nişani xandadır?

Xubları sevmə deyüb tə'n etmə, ey naseh, mənə,
Çünki bilməzsən məqami-cavidani xandadır.

Gəldi "sübhan-əlləzi əsra beəbdəh" şə'ninə,
Lövhi-məhfuz üstə ol hüsnin bəyani xandadır?

Mən dedim: – Bir busə ver. Der: – Can verüb almaq gərək.
Bu məkan içrə mətai-rayiqani xandadır?

Mən dedim: – Yüzünü göstər. Dedi: – Taqət yox sana.
Bu sualinə cəvabi, "ləntərani" xandadır?

Ta vüsalindən cüda düşdüm, həyatım qalmadı,
Dünyəvü üqbadə sənsiz zindəgani xandadır?

Xanda kim, yatım cəhanda uyxu gəlmər çeşmimə,
Bu Xətayi yatmağa yar asitani xandadır?

***

Ta mənim könlümdə, cana, həsrəti-canənədir,
Həq bilür kim, ağlamaqdan gözlərim peymanədir.

Arizin gülşəndürür, canım ona bülbül kimi,
Rüxlərin çün şəm'dir, könlüm ona pərvanədir.

Mən sana hər dəm dualar qıluram, ey bivəfa,
Ey sənəm, neyçün sənin hər gündə qəsdin canədir?

Gərçi zülmətdir saçun, yüzün ona xurşidvar,
Ləblərin tə'mi nə nisbət çeşmeyi-heyvanədir?

Dərdi-eşqindən sənin gər istəsəm dərdü ələm,
Neyləsün bu xəstə könlüm, dərd ilə həmxanədir.

Bağça içində güli-əhmər nə nisbət vəchinə,
Ol yanağın qanına can laleyi-həmra, nədir?

Bu Xətayi başdan ayağə üzülmüşdür tamam,
Nişə kim, ol zülfinə məhrəm həmişə şanədir.

***

Eşq meydanında hər kim can ilən baş oynadır,
Yar önündə qəmzədir, kiprig ilən qaş oynadır.

Şahi-mərdanın yolunda çox kişi vardır, vəli
Afərin ol başə kim, min başə bir baş oynadır.

Şah qatında məhrəm olub canü başından keçər,
Sanma kim, yarı önündə dəgmə fərraş oynadır.

Dün mənimlən rubəru boldu nigar, öldü rəqib,
Gözlərilən çox işarətlər qılur, qaş oynadır.

Ey Xətayi, qəm yemə çün düşmənin oldu yüküş,
Müddəi daim iraqdan kərpicü daş oynadır.

***

Nə insansan, sən ey can kim, cəmalın həqqə məzhərdir,
Qaşınlan qamətin şəkli mana mehrabü mənbərdir.

Sən ey türki-pəri dilbər, əcaib sün'i-yəzdansan,
Görəldən bərlü rüxsarın sözüm Allahü əkbərdir.

Könül səhrayi-hicranda diləməz nafeyi-ahu,
Ayağın toprağı, cana, mana çün müşkü ənbərdir.

Nə bürcün kövkəbisən sən, əya mehri-cəhan ta kim,
Camalın afitabından iki aləm münəvvərdir.

Bu gün ixlasü sidq ilə Xətayi valeh olmuşdur
Ki, yüzü şəm'i-ənvari, saçı anın müənbərdir.

***

Eşqin, ey dilbər, könül təxtində şah olmuşdurur.
Surətin can mülkinə xurşidü mah olmuşdurur.

Eşqini könlümdə mən dəxi neçük pünhan edim?
Ruyi-zərdim, əşki-sürxim çün güvah olmuşdurur.

Müddəilərdən dəxi, cana, nə fikrim var mənim,
Bəndəyə çün sən kimi sultan pənah olmuşdurur.

Bağçada hüsnin gülünü bülbüli-şeyda görüb,
Axdı yaşı danə-danə, bənzi kah olmuşdurur.

Hüsnini hər kim ki, gördü, valehü heyran olub,
İşi anın dünyədə fəryadü ah olmuşdurur.

Çün cəmalın gördü düşmən, qılmadın ana nigah,
Müddəilərinin məqami bəndü çah olmuşdurur.

Bu Xətayi yüzüni ta gördü, ey xubi-Xötən,
Ol Xətavü hind elində padşah olmuşdurur.

***

Dilbəra, hicrin yərasinə ləbin mərhəm düşər,
Ol dişün incusi tək dəryadə həm dür kəm düşər.

Mən səninlən, dilbəra, bir əhdü peyman eyləsəm,
Müddəilərinin içinə dəmbədəm matəm düşər.

Yüzüni eşq əhli gər görərsə, ey xubi-Xötən,
Onların könlündə qəm, qayğu, kədər xürrəm düşər.

Aləmi gəzdim təmamət, görmədim hüsnin kimi,
Dünyəni gəzsən xəmusin eylə səntək kəm düşər.

Bu Xətayinin kəlamini eşitsə hər zaman,
Ol Xötənlə Çin eli hər dəmbədəm bərhəm düşər.

***

Du zülfündən mənə bir mu gərəkdir,
Sənin vəslindən ancaq bu gərəkdir.

Könüldən getməz ol çeşmin xəyalı,
Bəli, Məcnunlara ahu gərəkdir.

Cəfavü cövrünüzdən inciməz dil
Ki, xublar daima bədxu gərəkdir.

Gözüm yaşın tökərmən ayağuna,
Bəli, sərv ayağunda su gərəkdir.

Xətayi sözlərin səm' etsün ol ay
Ki, xublar guşinə lö'lu gərəkdir.

***

Ta səri-kuyində bu könlüm müqim olmuşdurur,
Dil məqami baği-cənnati-nəim olmuşdurur.

Dəftəri-hüsnində şol hərfi-xətü xalın sənin
Sətri-"Bismillah ərrəhmanirrəhim" olmuşdurur.

Sidqimiz ol vəchidir kim, həqq olur anda zühur
Kim, təriqətdə sirati-müstəqim olmuşdurur.

Şər'iniz yolunda biz qılsaq xəta, sən qıl kərəm,
Min bir adından sənin biri kərim olmuşdurur.

Ey Xətayi, çəkmə qəm, gər hicr ilən bimarsən,
Çün sana ol xaliqin fəzli həkim olmuşdurur.

***

Görəli ol məh yüzün başıma yüz sevda düşər,
Rüxlərin manəndi ancaq bir güli-həmra düşər.

Ey könül, əql əhli isən sevmə xublar yüzüni,
Xubların dərdinə ancaq bu dili-şeyda düşər.

Ey sənəm, xublar içində sən düşübsən sərfəraz,
Eylə kim, bağ içrə rə'na sərvi-xoş bala düşər.

Heyf ola çeşmini, cana, nərgizə nisbət qılım,
Xansı nərgiz gözlərin tək məstü həm şəhla düşər?

Necə olmasun Xətayi eşq ilən divanə kim,
Könlünə hər dəm sənin tək bir pəri sima düşər.

***

Mənəm bir tən, vəleykin can anındır,
Ki, hər kim can qıyar, canan anındır.

Təbibimdir mənim, ruhum, rəvanım,
Zəifəm, xəstəyəm, dərman anındır.

Eşigində onun mən bir gədayəm,
Nə kim lütf eyləsə, ehsan anındır.

Səadət bürcinin dilxahi oldur,
Yer ilə gögü həm Keyvan anındır.

Ləbin yanında xəttin Xızra bənzər,
Kənari-çeşmeyi-heyvan anındır.

Səni-zülfü ləbi-lə'lini gördüm,
Təmami Türkü Hindistan anındır.

Səri sevmən deyənlər kafər oldu,
Yüzüni kim sevər, iman anındır.

Məgər məşşatə zülfin şanə qılmış,
Bu gələn nikhəti-reyhan anındır.

Xətavü Misr ilən Çinü Xorasan,
İraqü Fərs, həm Kirman anındır.

Başın top edə gör canan yolunda,
Çalınsın top çün çövkan anındır.

Xətayi, can fəda şol yarə qıl kim,
Cəhanü cümlə cismü can anındır.

***

Yanağın, ey pəri, can mənzilidir.
Bu bülbülnün gülüstan mənzilidir.

Ayağın basdığı yer, ey dilaram,
Bu mur içün Süleyman mənzilidir.

Saçının zülmətində təşnə Xızram,
Dodağın aği-heyvan mənzilidir.

Bitibdir qamətin çeşmim üzündə,
Nə xoş sərvi-xuraman mənzilidir.

Götürmə ağ yüzündən qarə zülfin
Ki, əqrəb mahi-taban mənzilidir.

Murad içün gəlübdür dil qapuna,
İnayət qıl ki, ehsan mənzilidir.

Xətayi könlünə yar mehri düşdü,
İmarət qıl ki, sultan mənzilidir.

***

Dilbəra, bu dərdimə dərman edərsən, vəqtidir,
Mən fəqirə lütf ilə ehsan edərsən, vəqtidir.

Növbahar oldu, gözüm istər camalın görməgə,
Əzm edüb gülşən saru seyran edərsən, vəqtidir.

Çox zamandır qönçə tək bağrımnı pürxun eylədin,
Ləblərini gül təki xəndan edərsən, vəqtidir.

Zülməti-hicrin fəraqın çəkmişəm dövranda çox,
Vəslini bu könlümə mehman edərsən, vəqtidir.

Xeyli vəqtdir kim, Xətayi zülməti-hicran çəkir,
Ləblərini çeşmeyi-heyvan edərsən, vəqtidir.

***

Dilbəra, ğəmgin könülmü şad qılsan, vəqtidir,
Bu yıxılmış könlümü abad qılsan, vəqtidir.

Xeyli müddətdir ki, könlüm eşq ilə viranədir,
Şimdi ol viranəni abad qılsan, vəqtidir.

Ey şəhi-lütfü kərəm, bir gəz eşit fəryadimi,
Bənd içindən bəndəni azad qılsan, vəqtidir.

Firqətin dövrində çəkdim möhnətü cövrü cəfa,
Şimdi vəslin yoluna irşad qılsan, vəqtidir.

Çünki dərdi-eşqini olmaz nihan etmək anın,
Ey Xətayi, dərd ilən fəryad qılsan, vəqtidir.

***

Ey, könül, ol mə'nisiz cahili yar etməkmolur?[1]
Mə'nisiz cahil sözünə e'tibar etməkmolur?

Həm onun qövli xətadır, həm qərari bivəfa,
Oylə bir bədnam ilə qövlü qərar etməkmolur?

Xaki-payi-əhli-dil ol, olmagil cəhlə rəfiq,
Çün əbabil var ikən zağı şikar etməkmolur?

Cəhlini ürfan edəndə xaki-pay olgil ona,
Əhli-söhbət göricək ondan kənar etməkmolur?

Hər kəs öz eybilə səttarına dutmuşdur yüzün,
Sən onun eybini açıb, şərmsar etməkmolur?

Bir neçə vəqt yar olub, bir kimsənin eybin tutub,
Sən onun gizlicə sirrin aşikar etməkmolur?

Ey Xətayi, can fəda qıl bir vəfalı yar içün,
Hər vəfasız bivəfanı ixtiyar etməkmolur?

***

Cana, sənin cəmalını çün afitab oxur,
Hüsnin kitabi-şərhini ümmül-kitab oxur.

---

[1] Etməkolur – etməkmi olur.

Xublar yüzinə baxmağı zahid aydır günah,
Aşiqlər ol günahı həmişə səvab oxur.

Bülbül oxudi gülşəni-hüsnün sifatını,
Dil gördü gül yüzini, sözinə cəvab oxur.

Hər xəstə dil ki, badeyi-eşqin ilə oldu məst,
Çeşmini saqi, lə'lini cami-şərab oxur.

Miskin Xətayi yetmək içün xaki-payinə
Hər dəm dilində ayəti-"künti-türab" oxur.

***

Eşqiniz, cana, bu könlüm təxtinə sultandurur,
Bu vücudim mülkinə xeyli-xəyalın candurur.

Ta görübmən hüsnini, ey gövhəri-yekta sənəm,
Bir gözüm Qülzüm misali, bir gözüm Ümmandurur.

Ruzü şəb bəs kim, qılur bülbül fəğanü zarlığ,
Ta gülüstanda yüzün tək bir güli-xəndan durur.

Əhli-taət bəs ki, zikr edər sifati-hüsnüni,
Bildi kim, yüzün sifati ayəti-Qur'andurur.

Dünyənin varü yoxundan, ey Xətayi, qəm yemə,
Saxlayan daim səni şol sayeyi-sübhandurur.

***

Ol sənəm kim, gecə-gündüz can anın heyranıdır,
Əqlü fəhm andan bərü eşq ilə sərgərdanıdır.

Dilbərim, yarım, əzizim, qəmgüsarım, munisim,
Can şikarım, sevgi yarım, canımın cananıdır.

Dün səba gəldi mana xoş-xoş müənbər buy ilə,
Qaliba, ol məhliqanın zülfi-müşkəfşanıdır.

Ey könül, hicran qəmindən çox şikayət qılma kim,
Aşiqə cövrü cəfası lütf ilə ehsanıdır.

Bu Xətayi şe’rinə eyb etmə, ey nakəs həsud,
Cümlə üşşaq əhlinə həmdəm onun divanıdır.

***

Arizin kim, ol rüxi-pürnur, tab üstündədir,
Suyə bənzər kim, həmişə afitab üstündədir.

Həq bilur kim, rüxlərin şə’nində olmuşdur nüzul,
Ayəti-müshəf ki, övraqi-kitab üstündədir.

Aləmin rövşənliği gərçi günəşdəndir, vəli
Pərtövi-hüsni-cəmalın afitab üstündədir.

Tabi-eşqindən həmişə gör nə sərgərdan gəzər,
Asiman daim ki, yüzündə niqab üstündədir.

Mehri-eşqin nəqdinə viranə könlümdür məqam
Kim, bəli gəncin yeri daim xərab üstündədir.

Ayağın toprağıdır həqq əhlinin başında tac,
Cismi daim bu Xətayinin türab üstündədir.

***

Ta kim, ol zülfin niqabi mahtab üstündədir,
Bir bulud nisbətlüdür kim, afitab üstündədir.

Gün təki yüzün cəhanda zahir olmuşdur, vəli
Bu əcəb kim, bəndədən daim hicab üstündədir.

Eşqiniz kim, oldu bu viranə könlüm məskəni,
Gəncə bənzər kim, yeri daim xərab üstündədir.

Zahidi-gümrahi gör, divarə eylər səcdəni,
Ol günəhkar öylə sanur kim, səvab üstündədir.

Bu Xətayinin dilində eşqi-dilsuzin sənin
Oda bənzər kim, həmişə ol kəbab üstündədir.

***

Ta kim ol ahu gözün mülki-Xötəndən bac alur,
Şol humayun zülfiniz fəğfuri-Çindən tac alur.

Nola gər hüsnindən alsa zərreyi-nur afitab
Kim, bəli, daim pənilərdən nəva möhtac alur.

Nə əcəb, mən miskinin könlün əgər yəğma qıla
Hinduyi-zülfin ki, mülki-Rumdən tarac alur.

Ta ayağın tozu tək qapunda məskən dutmuşam,
Bu səadətdən mənim bəxtim mələkdən bac alur.

Bu Xətayi Kə'beyi-kuyində tapmışdır şərəf,
Hacı tək könlüm təvafi-kuyinizdən hac alur.

***

Arizində sünbülin ənbərfəşan etmişdürür,
Sanasan kim, əqrəb ilə məh qiran etmişdürür.

Afərin ol gül yanağlu dilbəri-rə'nayə kim,
Hüsn bağında boyu sərvi-rəvan etmişdürür.

Zərrəmidir bilməzəm, yaxud dəhani dilbərin,
Sün' ilən bir mumidir, yaxud miyan etmişdürür?

Qaş ilən gözmidir ol rüxsarın üstə, ey sənəm,
Yoxsa dövran fitneyi-axirzəman etmişdürür?

Ey Xətayi, ahuyi-könlün şikar etməkligə,
Dəsti-qüdrət kim, səni əbru kəmna etmişdürür.

***

Dilbəra, mehrin əzəldən sidq ilə canımda var,
Andan özgə kimsə yoxdur, həm bilür pərvərdigar.

Bu fəna darində əhli-zövq ilən qılgil səfa,
Mülkü malü təxtü cah olmaz cəhanda payidar.

Sayeyi-qəddində gərçi yer yüzi buldu şərəf,
Sayebani-rif’ətindən nöh fələk dutmuş qərar.

Gəlməmişdir sən təki aləmdə, ey sultani-hüsn,
Sahibi-fəzlü kəmalü izzəti ba iftixar.

Arif isən, qoymagil əldən həqiqət mənzilin,
Aqil isən, dinyeyi-ğəddarə vermə ixtiyar.

Nəzmi-əş’arın, Xətayi, hər biri dürdanədir,
Söyləgil ta şahların guşində olsun guşvar.

***

Ey fələk, dövründə neyçün ol nigar əldən gedir?
Qanım ilən əllərin qılmış nigar, əldən gedir?

Dün dedi zahid mana: – Neyçün könül verdin ana?
Neyləyim, görgəc yüzini ixtiyar əldən gedir.

Bülbüla, gül dövridir, əfğan edər çox mürğ zar,
Nalə qıl, oturma, vəqti-mürğizar əldən gedir.

Ey könül, hicran ilən ömrün tükənsə, qəm yemə,
Neylərəm ömri-əzizi, çünki yar əldən gedir.

Ey Xətayi, çünki yarın eylədi əzmi-səfər,
Ruzü şəb ah et ki, yari-ğəmgüsar əldən gedir.

***

Ey sənəm, neyçün sənin və'din xilaf olmuşdurur?
Mehrin az olmuş, vəli qəhrin gəzaf olmuşdurur?

Könlümi eşqin aytdı kim, xilas olmaz müdam,
Aləmə andan ki, əmri-nunü kaf olmuşdurur.

Surətin əlhəmdürür, vəsfi-cəmalın Vəzzüha,
Çün sifatın sureyi-Qur'anda Qaf olmuşdurur.

Abi-kövsərdir dodağın, baği-cənnətdir yüzün
Kim, mənə lə'lin şərabi cami-saf olmuşdurur.

Mən neçün hicrində vəslin ləzzətindən kam alam,
Vəslin ilən hicrinin işi məsaf olmuşdurur.

Ey könül, qıldın səfər, əzmi-təvəkkül pişə qıl
Kim, pənah etmək bizə həqdən kifaf olmuşdurur.

Cövrü qəhrinin yolundan, ey Xətayi, dönməgil,
Gər məqamı ol pərinin kuhi-Qaf olmuşdurur.

***

Bu mənim cismimdəki zəhmətlərimol can bilür,
Mana hicran etdigin ol dilbəri-canan bilür.

Ta ki, həmdəmdir ğəmi-eşqin könüldə, ğəm yemən,
Çün xəyalini sənin dil sevgili mehman bilür.

İnciməz bu xəstə canım dərdi-hicrindən sənin,
Cövrü qəhrin gəldigincə lütf ilə ehsan bilür.

Çünki birdir aşiqə qəhr ilə lütfün mə’nisi,
Dil fəraqini vüsalü dərdini dərman bilür.

Ruzü şəb bülbül təki eylər Xətayi nalələr,
Bağİ-hüsn içrə yüzüni çün güli-xəndan bilür.

***

Ey sənəm, eşqində hər dəm bu könül bimardir,
Eylə kim bülbül dəxi ba eşqi-güldür, zardir.

Nə əcəb yüz üstə ol zülfün yatursa hər zaman,
Bu mühəqqəqdir ki, gənc üstə nigəhban mardir.

Möhnəti-hicran əlindən, ey sənəm, qəm çəkmənəm,
Dərdi-eşqin, ey pəri, hər dəm mana ğəmxardir.

Dün dedi həmdəm mana: – Kimdir sənin könlün alan?
Mən dedim: – Bilməzmisən, ol gözləri xunxardir.

Necə tərk etsün Xətayi gül yüzinin vəsfini
Kim, şikəstə bülbülün daim yeri gülzardir.

***

Gərçi gün xoşdur, vəli rüxsarın andan yaxşıdır.
Ay dəxi tabandurur, didarın andan yaxşıdır.

Nafeyi-müşki-Xötən gərçi müəttərdir, vəli,
Ey sənəm, ol xali-ənbərbarın andan yaxşıdır.

Nəqşi-tavus istəmən, andan cəmalın yegdürür,
Ləfzi-tuti dinləmən, göftarın andan yaxşıdır.

İstəmən firdövs bağinin güli-xoşbusini,
Dünya bağında güli-rüxsarın andan yaxşıdır.

Bu Xətayi qatinə kim, qıldılar tə'rifi-müşk,
Çin-bəçin ol zülfi-müşkinbarın andan yaxşıdır.

***

Ənbərin zülfinmidir, ya müşki-tatarındurur?
Gögdə kövkəb əqdi həm lö'leyi-şəhvarındurur.

Hər səhərgəh aləmü afaqı pürnur eyləyən
Gün degil, ey dilbərim, ol hüsni-didarındurur.

Ruzi-məhşər qoparan, cana, qiyamət qamətin,
Fitnələr zahir qılan ol çeşmi-məkkarındurur.

Tuba kim, derlər cahanda, qəddü rəftarındır ol,
Baği-rizvan kim, deyirlər, ruyi-gülzarındurur.

Dünyəvü üqbadə hərgiz ğəm yemə əğyardən,
Ey Xətayü, çün sənin lütfi-xuda yarındurur.

***

Ta cəmalın nuri çeşmimdən nihan olmuşdurur,
Gecə-gündüz işim ah ilə fəğan olmuşdurur.

Hüsnini ta görmüşəm bir bülbüli-zar olmuşam,
Çün mana kuyin məqami gülstan olmuşdurur.

Bir məsəldir kim, deyərlər: – Gəncin üstə mar olur;
Zülf içində hüsnin ol gənci-nihan olmuşdurur.

Gər fələk yüzündə derlər: – Mahi-tabandır şərəf,
Təl'ətin yer üstə mahi-asiman olmuşdurur.

Pir olmuşdu cahanda firqətindən, ey sənəm,
Ta yüzün gördü Xətayi, növcavan olmuşdurur.

***

Ey pəri, hüsnün sənin cani-cəhandan yaxşıdır,
Bəlkə ancaq can degil, canü cahandan yaxşıdır.

Gərçi Yə'qubi zəif etdi fəraqi Yusifin,
Zə'f içində ol dəxi mən natəvandan yaxşıdır.

Ögməyin mahi-fələknin pərtövi-rüxsarini,
Ol pərinin hüsni mahi-asimandan yaxşıdır.

Aşiqi viranədən mən' etmə, ey əql əhli kim,
Xəstədil Məcnunə səhra xanümandan yaxşıdır.

Bu Xətayi cu kənarında nə baxsın sərvə kim,
Qəddi-dilcuyi onun sərvi-rəvandan yaxşıdır.

***

Ey günəş, hüsnin xəyalı ta ki könlümdən keçər,
Qanlu yaşım yəm təki dolmuşdur andan sərbəsər.

Nalələr kim, gecələr ta sübh olunca eylərəm,
Qorxuram hicrindən anın razi-pünhanım açər.

Necə sərxoş olmasun dövründən anın dilbərim
Nərgisi-məstaniniz kim, su kimi qanım içər.

Leyli zülfinin ğəmi qıldı pərişan əqlimi,
Eylə Məcnunəm ki, Məcnun görsə həm, məndən qaçər.

Çox yaşagil çün mana yar olmadın, ey səngdil,
Bu Xətayi oldu qəhrindən sənin zirü zəbər.

***

Bütpərəst oldu könül, bütxanələr küncündədir,
Mən bilürmən bu dili-şeyda nələr küncündədir.

Gənc-eşqin çün vücudim şəhərini qıldı xərab,
Nişə kim, gəncin yeri viranələr küncündədir.

Yusifi-Kən'ani salmışdır zənəxdan çahinə,
Zülfinə bağlu neçə divanələr küncündədir.

Cismimi tərk etdi dil, kuyində dutmuşdur məqam,
Kim ki, can tərkin qılur, cananələr küncündədir.

Nərgisi-məsti-xumarın qanimi içməkligə
Qaşların mehrabinə məstanələr küncündədir.

Dürlü nəzmim həsrətindən firqətindən, ey sənəm,
Bəhri-çeşmim mə'dəni dəndanələr küncündədir.

Zahid aydır: – Ey Xətayi, rəxtü dəstarın xanı?
– Qoymuşam meyçün girov, meyxanələr küncündədir.

***

Gəl təraş et xəttini, şahi-cahan üç gündə bir,
Ta olasan afəti-dövri-zaman üç gündə bir.

Mən səni çoxdan sevirdim, bilməmişsən, ey pəri,
Öldürər aşiqini, verməz aman üç gündə bir.

Çar əbru dilbəri sevdim, qərəz qucmaq degil,
Mərhəba etsin bizimlə tək haman üç gündə bir.

İki cahan hörmətiçün sufi gəlsin can ilə,
İçəlim lə'li-şərabi-ərğəvan üç gündə bir.

Ey günəş yüzlü, yüzün göstər Xətayi bəndənə,
Nur ilə dolsun zəminü asiman üç gündə bir.

***

Badi-sübh əz suyi-məşriq afitab almış gəlür,
Ğaliba, yarın cəmalından niqab almış gəlür.

Aşiqi-dilxəstədən "dəf'i-süda" etmək dilər,
Sünbülündən dilbərin buyi-gülab almış gəlür.

Gözlərin dövrində məst oldu ləbin çahin görüb,
Zahidi meyxanədən gördüm şərab almış gəlür.

Sufiyi-biçarə həm halın görüb ol zahidin
Söhbətin gərm etməyə çəngü rübab almış gəlür.

Hər kişi almış gəlür anın ğəmindən bir nəsib,
Bu Xətayi çeşmi-pürxun, dil kəbab almış gəlür.

***

Bu sürahi, filməsəl, bir dilbəri-canandurur.
Rahi-ruhəfza anın içində nazik candurur.

Məclisi-üşşaqi pürnur etsə ol hər şəb nola
Kim, məlaik şəm'i gögdə kövkəbi-rəxşandurur.

Səcdeyi-şükr eyləyüb hər dəm ayağa baş içün
Çün görər üstündə daim sayeyi-sübhandurur.

Səbzxət saqilər, andan doldurun peymanələr,
Xızr cami tək pür abi-çeşmeyi-heyvandurur.

Bir pəri sərvi-səhi-qəddir ki, durmuş rəqs içün,
Yoxsa cənnət məclisində tubiyi-rizvandurur.

Bir pəri sərvi-səhi-qəddir ki, durmuş rəqs içün,
Yoxsa cənnət məclisində tubiyi-rizvandurur.

Cami-Cəmşidü Cəmin dövrani xətm oldu tamam,
Dövri-cam indi anındır kim, şəhi-dövrandurur.

Budur ol ayineyi-Iskəndəri-gitinüma,
Munda rövşəndir, cahanda hər nə kim, pünhandurur.

Bu sürahidən məvali dolduranda dustkam,
Qayğudan düşmən xəvaric yürəgi bir qandurur.

Görmədi heç kimsə mun tək simtən, məhbubi-şux,
Kakili zərrinü taci dəxi nur əfşandurur.

Yerdə əksi-çərxi-pür kövkəbdir olmuş aşikar,
"Nəssi-əzzinəs-səmavət" ayəti-bürhandurur.

Beylə qiymətlü cəvahir xansı mə'dəndən çıxar?
Kün fəkan mülkin baha versən, hənuz ərzandurur.

Bu Xətayi içdi andan dər əzəl bir cür'ə mey,
Ta əbəd hüşyar olmaz, məsti-cavidandurur.

***

Getmə sən, eşqin ki, bir gənci-nihan əldən gedər,
Bil ki, sən getsən yanımdan, təndə can əldən gedər.

Qayib oldu gül yüzün çeşmimdən, ey ruhi-rəvan,
Qorxaram ki, sünbüli-ənbərfəşan əldən gedər.

Candan oldum, ey pərivəş, möhnətindən tanriçün,
Qıl tərəhhüm ki, bu cismi-natəvan əldən gedər.

Ahim odundan kim, oldu yerü gög zirü zəbər,
Ehtiyat et ki, zəminü asiman əldən gedər.

Mən yaman etsəm necə sən yaxşılıq qıl, ey əziz,
Nəsnə qalmaz dünyədə, yaxşı-yaman əldən gedər.

Basmadan hər yerə kim, bir dəm qədəm tutmaz qərar,
Məskən eylə çün müşərrəfdir, məkan əldən gedər.

Bu Xətayi, ey sənəm, bir dəm camalın görməsə,
Taqət etməz də kim, ol ruhi-rəvan əldən gedər.

***

Ol kimsə kim, bu dünyəvü üqbadə şahdir,
Həm ənbiyalər üstə ulu padşahdir.

Tə’rif edüb sifatini, şirim dedi xuda,
Bu doğru sözə insü məlayik güvahdir.

Həm bəhrü kanü kuhi-vilayətdir ol Əli,
Düşmən anın qatında qamu bərgi-kahdir.

Olmaz qənim Qənbərinə bəbrü əjdəha,
Çün həmdəmi ol şahi-cəhanın ilahdir.

Hər kim anı sevirsə, Yəziddən nə fikri var?
Çün qullarına xövfü xətərdən pənahdir.

Ol mə’dəni-vilayət anın asitanidir
Kim, eşigində insü mələk dadxahdir.

Gər bürcü-ərşin üstə mələk anı sevməsə,
Harut tək məqamı anın qə’ri-çahdir.

Bürcində övliyalarin ol, filməsəl, tamam
Kövkəb içində nisbəti xurşidü mahdir.

Məhşər günündə lütfin umar dəstgir ola,
Miskin Xətayiyi-xəstəyə kim, pürgünahdir.

***

Kuyin sənin ki, rövzeyi-darüssəlamdir,
Mehrab qaşların ana, çeşmin imamdir.

Hiç bilməzəm bu dünyada əyyami-ruzigar,
Ruy ilə zülfiniz mana sübh ilə şamdir.

Bədnam qılma könlümi, aşiq deyib, həsud,
Aləmdə eşq adı beylə nik namdir.

Yar məclisində badəvü cam istəmən müdam
Kim, gərdəni sürahi, anın lə'li camdir.

Mən' eyləmə Xətayi kəlamini, ey rəqib,
Bax dəftərinə: sözləri nəzmü nizamdir.

***

Gögdəki mahin liqası dust didarındadır,
Afitabın yüzi ol xurşid rüxsarındadır.

Vəsl ümidinə gəzər miskin könül, olmaz həlak,
Yoxsa çox hicran bəlası çeşmi-bimarındadır?

Ahu tək aşiqlərin könlün neçün seyd etməsün,
Ol qədər kirpik oxu kim, çeşmi-xunxarındadır.

Aqibət tufan qopar, bir gün cahanı qərq edər,
Seyli-baran kim, bu aşiq çeşmi-xunbarındadır.

Bu Xətayi şe'rinə münkir nədənsən, zahida?
Atəşi-eşqin nişanı odlu göftarındadır.

***

İşim eşqində fəryad eyləməkdir,
Vüsalın və'dəsin yad eyləməkdir.

Xərab etdi demən eşqin könülni,
Bəs ol viranı abad eyləməkdir.

Bu könlüm adəti hər şəb ğəmində
Fəğanü ah bünyad eyləməkdir.

Verürmən ğəm dilə ümmidi-vəslin,
Bu rəsm ilən anı şad eyləməkdir.

Xətayi qulluğın məqbul qılsan,
Bu gün yüz bəndə azad eyləməkdir.

***

Mənim ol sevgi yarım gəldi, xoşdur.
Əlimə ol nigarım gəldi, xoşdur.

Əlindən ixtiyarın getsə, getsin,
Əlimə ixtiyarım gəldi, xoşdur.

Sən ol səhradə çün quli-biyaban,
Çəməndə gül'üzarım gəldi, xoşdur.

Öl imdi qış günü sərma əlindən,
Mənim tazə baharım gəldi, xoşdur.

Sən ey Seyyid Əli zülmat içində
Bu rövşən ruzigarım gəldi, xoşdur.

Xətayi, şükr qıl Allaha daim,
Gedən səbrü qərarım gəldi, xoşdur.

***

Təala şanəhü əkbər, bu nə hüsni-dilaradır,
Cəmalın huridən yegrək, boyun tubadan ə'ladır.

Gözüm yüzün görər hər dəm, zəhi nazir, zəhi mənzur,
Könül zülfin ilər hər dəm, əcəb aşüftə sevdadır.

Xöcəstə qamətin gördüm sənin, ey sərvəri-xuban,
Bəladan dil xilas olmaz, əcəb hümmətlü baladır.

Əgər cövrü cəfa qılsan və gər mehrü vəfa qılsan,
Yolundan dönməgim yoxdur ki, həq binavü danadır.

Xətayi xəstənin vergil muradın, həsbətən lillah
Ki, xaki-asitanında işi daim təmənnadır.

***

Ey könül, yar vəslini qoyma ki, yar əldən gedər,
Sən bu işdə qılma təqsir, ixtiyar əldən gedər.

Yil-dəyil, saətbəsaət xoş keçir gün yar ilə,
Həftə-həftə, günbəgün ol ruzigar əldən gedər.

İşrətü zövqü səfayə, ey könül, şad ol müdam,
Eyş nihan olur, görünməz, aşikar əldən gedər.

Aşinayi tərk edübən yadə can vermə, könül,
Yad ilə biliş olunca aşina əldən gedər.

Ey Xətayi, qoyma yarın damənin əldən müdam,
Kim ki, işin süst dutar, hər nə ki, var əldən gedər.

***

Ləblərin yadi ilə didələrim qan doludur,
Ağlamaqdan ətəgim lə’l ilə mərcan doludur.

Səri-kuyində nə ğəm, nalə qılursa dilü can,
Yüzü gül gülşən ara bülbüli-xoşxan doludur.

Gər şikayət edəyim qaşı yayı oxudin,
Hər yana sancıla sinəmdə bu peykan doludur.

Buyi-zülfin gətirir yadimə badi-səhəri,
Canü dil bağçasıda müşk ilə reyhan doludur.

Ey Xətayi, özüni xak edə gör pak olasan,
Mənlik etmə ki, cahan əhlinə ürfan doludur.

***

Bu gün mən munda, yarım anda neylər?
Yüzi şö'lə nigarım anda neylər?

Apardı əql ilə səbrü qərarım,
Mənim səbrü qərarım anda neylər?

Qatı müştaq idim şirin ləbinə,
Gözü məstü xumarım anda neylər?

Vətəndən ayrı düşdüm dadü fəryad,
Qəribəm, qəmgüsarım anda neylər?

Xətayi, xəstə düşdüm yardan ayrı,
Təbib ilə timarım anda neylər?

***

Dilbəra, eşqin sənin cismimdə canım canıdır,
Vəsli-rüxsarın xəyalı könlümün dərmanıdır.

Firqətin dövrində, dilbər, xəstə canım oldu zar,
Şərbəti-lə'li-ləbin bu dərdimin dərmanıdır.

Mehrü qəhrindən anın, aşüftə könlüm, qəm yemə,
Kim, mana cövrü cəfası lütf ilə ehsanıdır.

Zahida, vermə nəsihət eşqi tərk etgil deyü,
Aşiqin, Allah bilür kim, sevgisi rəhmanıdır.

Ey Xətayi, cövrü qəhrindən cahanın incimə,
Hər nə kim, bəndə yoluna gəlsə həq fərmanıdır.

***

Bağdaş qurub otursa nigarım, fəğan qopar,
Dursa-otursa, fitneyi-axirzaman qopar.

Şirvan xəlayiqi xamu Təbrizə daşına,
Mülki-Əcəm sorar ki, qiyamət xaçan qopar?

Yetdükcə tükənir ərəbün kuyi, məskəni,
Bağdad içində hər necə kim, türkman qopar.

Çıxsa saraydən bu cahan varisin dutar,
Bir mürşidi-təriqət, pirü cəvan qopar.

Görmüşdü ta Xətayi əzəldən yəqin muni,
Nuhun əlaməti gəlür, andan tufan qopar.

***

Bilmən ki, yar cövrü cəfa kimdən ögrənür?
Eşqində bunca dərdü bəla kimdən ögrənür?

Aşiqlərinə cövrü sitəmdir işi müdam,
Bəs bilmənəm ki, rəsmi-vəfa kimdən ögrənür?

Bu xəstənin qapunda duadır işi müdam,
Sor ol gədayə, munca dua kimdən ögrənür?

Ol ay yüzini görməgə yer, gög baha dedi,
Yarəb ki, bu mətaə baha kimdən ögrənür?

Cana, Xətayi dünyadə dərdin çəkər sənin,
Könlünə sor ki, rəsmi-vəfa kimdən ögrənür?

***

Pərtövi-hüsnindən, ey dilbər, cahan pür nur olur,
Binəvadır kim, vüsalından həbibin dur olur.

Ey pəriru, sən mana hərgiz nəzər qılsan benaz,
Müddəi bu qüssədən eynül-yəqin rəncur olur.

Zahidin cövründə gər viran olursa mülki-dil,
Ğəm degil, cana, çü vəslindən yenə mə’mur olur.

Hüsni dövründə baxın hiç iltifat etməz mana,
Kim görübdür mövsimi-gül bağban məqdur olur.

Təşnə dildir bu Xətayi, can veribdir lə’linə,
Necə kim, lə’lin əsəldir, dil ona zənbur olur.

***

Dodağın qənd imiş, bal anda neylər?
Nə nazik xətt imiş, xal anda neylər?

Əlifə nisbət etdim qəddi-dalın,
Əlif üstə əlif, dal anda neylər?

Zahidin geydigi sufü səqərlat,
Fəqirin geydügi şal anda neylər?

Kimin kim malı, mülki, gənci çoxdur,
Gəncü mülk olmayan mal anda neylər?

Xətayi qal evində halə yetdi,
Bu bir hal evidir, qal anda neylər?

***

Dilbəra, eşqi-rüxün daim bu can üstündədir,
Bir gülə nisbətdir ol kim, gülstan üstündədir.

Şol münəvvər çöhrənin qatında kəmtər zərrədir,
Gərçi xurşidin məqami afitab üstündədir.

Eşqinə seyd olalı hər dəm bu canım qəsdinə
Qaşü gözün, dilbəra, tirü kaman üstündədir.

Gərçi derlər mahi-taban nur alur xurşiddən,
Nuri-hüsnin afitabi kün-fəkan üstündədir.

Dövləti-vəslin dilər miskin Xətayi hər zaman,
Xaki-payin tək məqami asitan üstündədir.

***

Dilbəra, dildə sənin mehri-rüxün can kimidir,
Şərbəti-lə’li-ləbin dərdimə dərman kimidir.

Baği-hüsnində boyun sərvi-xuraman dedilər,
Zülmət içində ləbin çeşmeyi-heyvan kimidir.

Taki səndən düşəli ayrı, əya ruhi-rəvan,
Gözümün yaşı mənim qətreyi-baran kimidir.

Ruyü muyin görəli fürqəti-hicranda nə ğəm,
Zülfü ruyin, sənəma, şəm’i-şəbistan kimidir.

Bu Xətayi düşəli söhbəti-vəslindən irağ,
Bağrı büryan kimivü gözləri giryan kimidir.

***

İki aləmdə sultandır qələndər,
Qədimi küfü imandır qələndər.

Qələndərdir həqiqət sirri-kövneyn,
Əmiri-həyyi-fərmandır qələndər.

Qələndər Mustafavü Murtəzadır,
Zəhi cism ilə həm candır qələndər.

Cahan içində sər ta pa bürəhnə
Şəhin eşqinə qurbandır qələndər.

Müsafirlər ki, məsti-cami-həqdir,
Vüsali-şahə mehmandır qələndər.

Cəhanın darini buldu gəda boş,
Əcayib əhli-imandır qələndər.

Keç indi, şöhrəti-aləm göründi,
Hesaba cümlə ehsandır qələndər.

Vilayət Kə'bəsin açdı Xətayi,
Qulami-şahi-mərdandır qələndər.

***

Mənim yolumda yektalər gərəkdir,
Dini, imanı yəğmalər gərəkdir.

Mənim tək gövhəri nadan nə bilsün,
Məni bilməgə danalar gərəkdir.

Nə bilsün məni hər bir başlı, gözlü,
Könül gözündə binalar gərəkdir.

Mən olman dəgmə fikr ilən müyəssər,
Mənə bir incə sevdalər gərəkdir.

Mənəm sultan Xətayi Heydər oğlu,
Mənim yolumda qovğalar gərəkdir.

***

Ey müsəlmanlar, bu gün ol yari-pünhan ayrılır,
Uçdu ruhim, getdi əqlim, gövdədən can ayrılır.

Ayrılır ol yari-sərdarım, gedir, qoymuş məni,
Səd hezaran dadü bidad bəndədən can ayrılır.

Ey könül, fəryadü nalə vəqtidir, eylə fəğan,
Şimdi şəhrindən sənin ol şahü sultan ayrılır.

Zar qıl bülbül kimi, çak et yaxanı gül kimi,
Şol əzəldən yar, həmdəm, əhdü peyman ayrılır.

Gözlərim, hər dəmdə mövc eylə ki, firqətdir bu gün,
Tök sədəflər dürrini kim, gövhəri-kan ayrılır.

Dost vida eylər mənimlən, ağlaram mən zar-zar,
Gözlərimdən hər zaman gör bəhri-ümman ayrılır.

Ey Xətayi, tanrı sorsun bu şikəstə könlümi,
Zərd olubdur arizin, andan məgər qan ayrılır?

***

Nə buyursan, şəha, fərman sənindir.
Yolunda canü baş qurban sənindir.

Xəta məndən, əta səndən, əya dust,
Ki, mürvət kanısan, ehsan sənindir.

Susamış ləblərin Xızrı-zəmanə,
Suvar, gəl çeşmeyi-heyvan sənindir.

Səvar ol dövlət atını həmişə,
Səadət topuna çövkan sənindir.

Mələklər müştəridir gül yüzünə,
Sür imdi, ey qəmər, dövran səninindir.

Əzəldən canımı qurban verərdim,
Qəbul eylə, şəha, fərman səninindir.

Eşigində qulundur bu Xətayi,
Nəzər qıl halına, heyran səninindir.

***

Aşiqin aqilə daim sözü divanə gəlür,
Aşiqin daim anınçün sözü divanə gəlür.

Rayqan satma, sənəm, Xızra dodağın suyini,
Xızr əgər istəyə su, çeşmeyi-heyvanə gəlür.

Əsrimiş xuni-dilimdən sənəmin xuni gözi,
Gər sən inanmaz isən gör ki, nə məstanə gəlür.

Gahü bigah mana tövbə verir vaizi-şəhr,
Vaizin tövbəsi, şaha, mana əfsanə gəlür.

Aşinadır bu Xətayi sözü iman bilənə,
Özüni bilməyənə demə ki, biganə gəlür.

***

Xandadır ol bimisalın ibtidasi, xandadır?
Kim bilir ol küntü kənzin intəhası xandadır?

Gəl bəyan etgil sifati-zatini şərh eylə kim,
Mən sual etdim ona eyni-liqası xandadır?

Kəndü lütfindən yaratdı aləmin mövcudini,
Cümlənin məqsudi şahdır, istivası xandadır?

Ərşü kürsi, cənnətü həm narü tubavü şəcər,
Əbrü badü maü tin əsli-şərası xandadır?

Hər kişi kim zikri xətlən könlünü etməz cila,
Ol nə bilsün bibəsər eşqin səfası xandadır?

Xatəmi-tövhidi hər kim könlünə mehr etmədi,
Ol şəhadət şərhinin bilməz əsası xandadır.

Sən niyaz et, ey Xətayi, kimsə bilməz çün səni,
Məntiqin inşasının həmdü sənası xandadır.

***

Gördüm yüzüni, ey sənəm, billah ki, xoş canandir,
Manəndi yoxdur hüsninin, qiymətlü bir dürdanədir.

Pəndü nəsihət dutmadın neyçün könül verdin ona,
Billah, cəzadır, ey könül, hicran oduna yanədir.

Yüzün çü mahi-bədrdir, yəldası zülfindir sənin,
Aşiqləri məst eyləyən lə'li-ləbin peymanədir.

Yüz gösətərübən aləmə neyçün açırsan vəchini?
Dilbər yüzi fitnə degil, sor, ey könül, aya nədir?

Ol dilbərin rüxsarinə verdi Xətayi könlüni,
Ah ilə tab oldu işim, ol şəm'inə pərvanədir.

***

Könül, şad ol ki, canan gəldi, derlər.
Bu mürdə cisminə can gəldi, derlər.

Şikayət eyləmə sən hicr əlindən,
Sənin dərdinə dərman gəldi, derlər.

Bu zülmət cövrini çox çəkdi bülbül,
Bahar irdi, gülüstan gəldi, derlər.

Qarınca bağladı bel xidmətinə,
Əsən yellər Süleyman gəldi, derlər.

Xətayi, can fəda dostun yoluna,
Bu gün dost sana mehman gəldi, derlər.

***
Həqin nüsxələrində bir bəyan var:
Müqərrər bilüniz kim, qanə qan var.

Başım qurban sana, ey mürşidi-həqq,
Neçə yüz mən təki canə qıyan var.

Əlin var, sən Yəzidi yaxşı qırdın,
Cahandar olasan ta kim, cahan var.

Hənuz şah Heydərin qanı qalıbdır,
Yəzidə bir dəxi külli qəran var.

Sana münkir derəm, görməzsən anı,
Günəşdən əhli-həq qatna əyan var.

Mənim halım şaha ərz etmək içün
Yeri badi-səba sən bir zaman var.

Bu yola varmağ olmaz rəhnümasız,
Necə bir olasan kim, sözə qan var.

Yəqin ixlas gərək eşqin yolunda,
Get, ey münkir ləin, səndə güman var.

Öküş xövf eyləmən eşqin yolunda,
Rəfiqim ğazilərdən karivan var.

Müəzzin gecə-gündüz çağırır hey:
– İmam gəldi, namaza dur, oyan, var.
Səfər qıl, dur, oturma, ey Xətayi
Ki, şəhri-Ərdəbildə xanədan var.

***

Gəl, ey arif, sana hər dəm təvafi-həcci-əkbərdir
Ki, qiblə nuri-peyğəmbər, imami nəqdi-heydərdir.

Əli oldur ki, cənnətdə olubdur saqiyi-kövsər,
Budur saqi, budur cənnət, şərabı abi-kövsərdir.

Əlində badeyi-gülrəng içər ğazilərin şahi,
Nə hacət nəql içün şəkkər, sözün qəndi-mükərrərdir.

Şücaət bu, vilayət bu, mürüvvət bu, kəramət bu,
Əlini görmiyən hazir Yəzidü gəbrü kafərdir.

Hədisi-və'zi-Qur'andan nə buldun, gəl, gəl, ey zahid,
Kəlamın ismi Qur'andır, hədis Allahü əkbərdir.

Siratin körpüsin keçdim, əməl mizanini çəkdim,
Bu yoldan azanın, billah, məqami nari-məhşərdir.

Xətayilə Xötən mülki şaha fəth oldu Çin belə
Ki, məclis nafeyi-müşkin sərasər müşki-ənbərdir.

Əya mehrab edən daşı, həqiqət məzhəbindən kim,
Nigarın gözləri, qaşı mana mehrabü mənbərdir.

Behişt istərsən, ey zahid, biya dər məclisi-rindan,
Həqin didarı, ey aşiq, nə cənnatə müyəssərdir.

gər nazirsən, ey talib, həqi insanda gör, getmə,
Mübarək xacəmin vəchi həqin nurində məzhərdir.

Xətayinin degil həqqi şaha qulam deyə bilməg,
Əgər xidmət qəbul olsa, anın mövlası Qənbərdir.

***

Nə xacəyəm, nə də mal əksiyimdir,
Nə sultanəm, nə xud qul əskiyimdir.

Ərənlər dünyəyə murdar demişlər,
Nə gərkəsəm, nə murdar əksiyimdir.

Mən qürab degiləm, zağı gözləyəm,
Zira mən bülbüləm, gül əksiyimdir.

Seyr eylədim tamunun dörd guşəsin,
Nə yanaram, nə xud nar əksiyimdir.

Şah Xətayim, hər şeydən bir nəzər var,
Bir yüzü nurlu didar əksiyimdir.

***

Daneyi-xalin görəndə mürği-dil pərvaz edər,
Qeyb ikən ol dəmdə əsrari-məani baz edər.

Dastani-hüsnini, ey dust, dər fəsli-bahar
Guşeyi-gülşəndə bülbül sübhdəm ağaz edər.

Görmədi bir gəz günah ol şahi-xuban ah kim,
Ögrənibdir kim, mana hər ləhzə yüz min naz edər.

Ey könül, qatlan vüsalın istər isən daima
Hər cəfalar kim, sana şol dilbəri-tənnaz edər.

Ey Xətayi, afərin qılmaq gərək idrakına,
Böylə tər sözlər məgər kim, Sə'diyi-Şiraz edər.

***

Mana cövrü cəfa qılmaq degil, cananələrdəndir,
Yaman yoldaşilən yar olma ki, nadanələrdəndir.

Mənim tək aşinayi yad qıldın, ey tərəhhümsiz,
Fələkdən görməzəm anı, qamu biganələrdəndir.

Fədadır bil yəqin billah, yolunda cani-şirinim,
Cəmalın şəm'inə hər dəm yanan pərvanələrdəndir.

Xəbər dutmaz həqiqətdən riyayi zahidin fəhmi,
Anın fikri əcayib qissəvü əfsanələrdəndir.

Xətayi, nəzmi-əş'arinə yüz min afərin gəlsin
Ki, aqillər xəyalından degil, divanələrdəndir.

***

ahanda aşiqin çox adı vardır
Ki, hər birisinin bir dadı vardır.

Bu gün sən Xosrovi-Şirin dəhansan,
Sənin tək Şirinin Fərhadı vardır.

Bu eşqin ögünə dözməz dağü daş,
Yavuz iti külüng fuladı vardır.

Hər işi eşqilə dutgil cahanda
Ki, eşqilə olan bünyadı vardır.

Nə yerdə bir gurü ahu olursa,
Müqərrərdir, anın səyyadı vardır.

Cəmii-bəndənin vardır niyazı,
Qamu könüllərin muradı vardır.

Uda bilməz munu dövri-zəmanə
Ki, bir oynayıcı nərradı vardır.

Zühur oldu oyunçu rindü qəllaş,
Vilayətdən anın irşadı vardır.

Sağınmanız, Xətayi dərdini sor
Ki, söylər söylədir ustadı vardır.

***

Əz qeylü qali-mədrəsə xoşdur ki, olsa dur,
Ey dil, həzər qıl onda ki, yoxdur sana qüsur.

Meyxanə küncün istə deyir saqiyi-lətif,
Öz vəhdətində ol ki, çü Allah imiş ğəfur.

Əfsanə sözlü vaizi görsən, məlamət et,
Ta xəlq içində eyləməyə razini zühur.

Bolsun bu malü mülk və gər hiç bolmasun,
Neyçün ki, vəsli-yardir ancaq mana zərur.

Səndən Xətayi mehrü vəfa iltimas edər,
Yarəb, muradı aşiqi-biçarənin budur.

***

Boyun bir sərvi-rə’nadır, güli var,
Səmən üzrə pərişan kaküli var.

Nə nazikdir cəmalın gülşəni kim,
Güli-tər üzrə nazik sünbüli var.

Nə gülşəndir yüzün kim, çevrəsində
Hezaran əndəlibü bülbüli var.

Necə məstü xumar olmaya çeşmin,
Önündə ləblərin kimi müli var.

İnanma zülfi əhdinə, Xətayi,
Kim, anın bir başıvü min dili var.

***

Aşiq oldur kim, sözü canü dililə yar bir.
Birdürür aşiq əzəldən, sevgili dildar bir.

Əhli-eşqin mə’niyi-zatü sifati birdürür,
Adəmə qıl səcdə, zahid, qılmagil inkar bir.

Cümlənin halın bilən sənsən, yenə bildürmiyən,
Demə hər naməhrəmə gər qılmasa iqrar bir.

Olmadı bu sirrə məhrəm hər xəsisi-kəcsüxən,
Dərdimin dərmanı doğru yar bir, əttar bir.

Pir birdir, sirr bir, iqrar bir, göftar bir,
İkilik sığmaz bu yolda, sirr ilə sirdar bir.

Sən bilürsən bəndənin halın, nə bilsün bilməyən,
Birmidir, ya yüzmidir, ya minmidir, bazar bir.

Atəşi-eşqin tutuşdurdu vücudim şəhrini,
Baxıram ki, hur birdir, nur birdir, nar bir.

Səd hezaran zülm edirsən, dönməzəm, döndərməzəm,
Yüzümi, ya sözümi, ya gözümi, ğəmxar bir.

Canə minnətdir nə gəlsə, ğəm yemən, şükr eylərəm,
Canı verdim, başı qoydum, olmuşam bimar bir.

Məsti-eşq etdin məni, Məcnun umanı neylərəm,
Ey susamış qanıma, hər gözləri xunxar bir.

Ömr birdir, gün bu gündür, yetsə dəm, saət deməz,
Baqi olmaz can bu təndə, fanidir, ədvar bir.

Heç günahsız bəndə olmaz, heç xətasız kimsə yox,
Sən günahın görə görgil, əfv edən ğəffar bir.

Bu dükan yüz min dükandır, həq dükanıdır, vəli
Şərh birdir, kar birdir, asılursan dar bir.

Ey Xətayi, sən təvəkkül həqqə qılgil, çəkmə ğəm,
On səkkiz min aləmə hökm eyləyən sərdar bir.

***

Şəm'i-hüsnin çövrəsində canü dil pərvanədir,
Yanmayan ol şəm'ə qarşu bixəbər pərva nədir?

Qaşların mehrabü yüzün məscidi-beytül-həram,
Gözlərin meyxanəvü lə'li-ləbin peymanədir.

Ey müsəlmanan, məni eyb etməniz aşiq deyib
Kim, məni valeh qılan ol nərgisi-məstanədir.

Dilbərin vəslindən ayru bu dili-məhcuri-mən
Fikrü ənduhü fəraqü dərd ilə həmxanədir.

Ey Xətayi, əhli-tövhidin qatında bilmiş ol,
Vaizin bihudə göftarı qamu əfsanədir.

***

Sənsizin könlüm, şəha, bir külbeyi-viranədir,
Kimsəyə ərz etməzəm kim, bir yıxılmış xanədir.

Canə can etdim yəqin ilə əzəldən həq bilür,
Canımın canı mənim şol dilbəri-cananədir.

Getdi ömrüm, hiç dinlənmən vüsalindən anın,
Şol məhi-namehribanın meyli çün hicranədir.

Hər gecə ta sübh hüsnin şəm'inə pərvanə tək
Cümlə aləmlər fəğanımdan tutub yanədir.

Ey Xətayi, sən yəqin bil kim, bu fani dünyada
Bivəfalərdən məhəbbət istəyən divanədir.

***

Bir qətreyi-ərəq ki, yüzündən nisar olur,
Səhni-zəmin bəharü gülü laləzar olur.

Ta şanə qıldı zülfini məşşateyi-əzəl,
Tabindən açılır ki, cahan müşkbar olur.

Rə’na qədin ki, sərvi-səhidir müqabili,
Yarəb, münasibi nə səbəbdən çinar olur?

Yarın, Xətayi, kuyinə can ver besidqi-dil,
Yarım deyən sana xaçan əğyarə yar olur.

***

Ol gedən yarımmıdır, ya ixtiyarımdır gedir?
Bilməzəm canımmıdır, ya sevgi yarımdır gedir.

Təndə canım qalmadı, anınla olmuşdur rəvan,
Ol mənim ruhi-rəvanım, ya nigarımdır gedir?

Canım andan ayru təndə bir dəm əglənməz mənim,
Ğəm məni eylər həlak, ol ğəmküsarımdır gedir.

Qalmadı heç karü bari bu Xətayi xəstənin,
Anın ilə karü barım, hərçi varımdır gedir.

***

Yandım eşqindən, əya gül yüzlü dildar, üştə gör!
Sənsizin aləmdə gəzmək oldu düşvar, üştə gör!

Sinəmin suzindən, ey dilbər, yanır ərş ilə fərş,
Ağlaram bülbül kimi bivəsli-gülzar, üştə gör!

Lalə tək bənzim saralmışdır fəraqindən sənin,
Olmuşam dilxəstəvü məcruhü bimar, üştə gör!

Əhdü peymanını məndən, ey pəri, sındırmagil
Kim, mana zülm eyləmişdir cövri-əğyar, üştə gör!

Bu Xətayi şol büti-tərsa cəmalın görgəcin
Rahibi-deyr olduvü bağladı zünnar, üştə gör!

***

Pərişan zülfi-müşkinin güli-xəndanə düşmüşdür,
Ucundan dürlü sevdalər xəti-reyhanə düşmüşdür.

Məgər xurşid imiş hüsnin ki, qıldı aləmi rövşən
Kim, ol rəxşəndə ənvari məhi-tabanə düşmüşdür.

Qaşın yayını qurmuşsan bizə əz ğəmzə hər saət,
Əya dilbər, onun səhmi, yəqin kim, canə düşmüşdür.

Cəmalın iştiyaqından eşitməzsən fəğanimni,
Vüsalın iftiraqından könül hicranə düşmüşdür.

Xətayi bəndəyə saqi içirmiş cami-səhbadən,
Görün, meyxanə küncündə, əcəb məstanə düşmüşdür.

***

Ey könül, hərcayi yari ixtiyar etmək nədir?
Yari-hərcayi sözünə e'tibar etmək nədir?

Güli-xoşbu var ikən əlim tikanə sürtməzəm,
Kəbki-rə'na var ikən zaği şikar etmək nədir?

Dəgmə bir cahil nigarın cövrini çəkmək nədən?
Kərr bir nakəs ilə qövlü qərar etmək nədir?

Ahu gözlü bir sənəm aslanları seyd eyləmiş,
Ey müsəlmanlar, ahu şiri şikar etmək nədir?

Ey Xətayi, sirrini sən dəgmə yerdə söyləmə,
Sirri aşiq dəgmə yerdə aşikar etmək nədir?

***

Ey könül, hər mə'nisiz cahili yar etmək nədir?
Mə'nisiz cahil sözünə e'tibar etmək nədir?

Çün anın qövli xətadır, həm qərarı bivəfa,
Ey könül, naəhl ilə qövlü qərar etmək nədir?

Əhli-həqqə can fəda qıl, cəhl ilə olma rəfiq,
Çün ənadil var ikən zağı şikar etmək nədir?

Xanda kim, hər əhli-ürfan görsən, olgil xaki-pa,
Ey könül, naəhl olub andan kənar etmək nədir?

Bir neçə gün yar olub, bir kimsənin halın duyub,
Sonra anın gizli sirrin aşikar etmək nədir?

Hər kim öz eybi ilə sübhaninə dutmuş yüzün,
Kimsənin eybin açuban şərmsar etmək nədir?

Ey Xətayi, qıl fəda canın vəfalu yar içün,
Hər vəfasız bivəfa kimsəni yar etmək nədir?

***

Ey sənin yüzünə baxdıq, qutlu oldu mahimiz,
Nə əcəb surət yaratdı sün'ilə Allahimiz.

Çün irişdim yüzinə, buldum siratül-müstəqim,
Abi-heyvanə irişdi vardığınca rahimiz.

Dün sağınur kim ki, görsə zülfinin şəbrəngini
Kim, qarayə boyayıbdır ani dudi-ahimiz.

Xızri-cavidan əlindən içmişüz abi-həyat,
İsiyi-Məryəm qatında qurmuşuz xərgahimiz.

Kə'beyi-vəslinə verdim canımı, qurban dedim,
Hacı oldum, qan tökərəm, xanı qurbangahimiz?

Qaşların tağini gördüm, qibləgahim eylədim,
Çün əyağın toprağında oldu mənzilgahimiz.

Bu Xətayi Kə'beyi-eşqinə ehram bağladı,
Ol saatda ərşə çıxdı zikri-illəllahimiz.

***

Həsrətindən, dilbəra, qaldı du çeşmim xabsiz,
Eylə kim, yulduzlar olur gecə gögdə xabsiz.

Ta sədəf ağzında yarın görmüşəm dür dişlərin,
Eşq bəhrində könül ol mə'nidən ğərqabsiz.

Zülməti-hicranda qaldım, bir mədəd qıl halimə,
Ey pərivəş, çünki rüxsar ilə siz məhtabsiz.

Əhli-həq qapundan özgə heç yerdə qılmaz sücud,
Ey sənəm, çün daima aşiqlərə mehrabsiz.

Bu Xətayinin vücudi oldu nurindən zühur,
İki aləm zərrədir, xurşidi-aləmtab siz.

***

Ta düşübmən eşqinə hicrində mən zarəm hənuz,
Dami-zülfin bəndinə mürği-giriftarəm hənuz.

Ta ki mən bülbül təki gülzari-hüsnin görmüşəm,
Ta əbəd tərk eyləmən, dər eşqi-gülzarəm hənuz.

Şəm'i-rüxsarini ta kim, görmüşəm, ey məhluqa,
Gögdə yulduzlar kimi hər gecə bidarəm hənuz.

Ta yüzün gördüm sənin mən, ey təbibi-dərdi-eşq,
Sanma kim, buldum şəfa, dərd ilə bimarəm hənuz.

Bu Xətayi yar ilən qalu bəladən qıldı əhd,
Həq bilür kim, bər səri-an əhdü iqrarəm hənuz.

***

Biz əzəldən ta əbəd meydanə gəlmişlərdənüz,
Şahi-mərdan eşqinə mərdanə gəlmişlərdənüz.

Yazmağa həqdən kəlamüllahi-natiq şərhini
Kim, bəyani-elm ilən Qur'anə gəlmişlərdənüz.

Kainati surəti-rəhmanə təfsir etməgə
Ruhi-qüdsi surəti rəhmanə gəlmişlərdənüz.

Bir müənbər türrənin küfrinə "amənna" deyib,
Həqqə təslim olmuşuz, imanə gəlmişlərdənüz.

Saqiyi-baqi əlindən məst olub içməkdəyüz,
Nərgisi-məstin kimi məstanə gəlmişlərdənüz.

Ğeybi-mütləqdən təmaşayi-rüxi-ziba içün
Bu şəhadət mülkinə seyranə gəlmişlərdənüz.

Ey Xətayi, eydi-əkbərdir camali dilbərin,
Biz bu eydi-əkbərə qurbanə gəlmişlərdənüz.

***

Dilbəra, şəmsüz-zühadır şö'leyi-rüxsariniz,
Ayəti-Tahavü Yasin surəti-didariniz.

Qamətin tubadurur, Nun vəlqələmdir qaşların,
“Hazihi-cənnətü ədnin” lə’i-şəkkərbariniz.

Ayəti-Vəlleyl zülfin, gözlərin “nə’mül-bəsər”,
Leyk “Sübhanəlləzi əsra” durur əsrariniz.

Sureyi-Tə’viz oxuram dəmbədəm ixlas ilə,
Ta ki hüsnini bəladən saxlasun cəbbariniz.

“Qül-kəfa billah” durur zikri Xətayi xəstənin,
Həq bilür kim, “sümmə vəchüllah”dir didariniz.

***

Hali-dilimni bəndədən ol yarə söyləniz,
Hicr oxu bağrımı necə bir yarə, söyləniz.

Əhvalımı sorarsa mənim ol cəfalı yar,
Zarü nəzarü xəstəvü avarə söyləniz.

Gülgün yanağların ğəmü cövrü cəfalari
Qıldı həvalə bağrımı yüz xarə, söyləniz.

Çox möhnətü cəfasını çəkdim, vəfa xanı?
Ğəm həddən ötdü dilbəri-ğəmxarə söyləniz.

Səhrayə saldı ahuyi-çeşmin Xətayini,
Ol buyi-zülfi nafeyi-tatarə söyləniz.

***

Qəbayi-fəqrü fənadır qumaşi-faxirimiz,
Ğəriqi-badeyi-səhba libasi-zahirimiz.

Qapında nola məhü mehrə baş əgməz isəm,
Fərazi-küngüreyi-ərşdir, şəha yerimiz.

Xudayə şükr, əcəb rahətü səfamiz var,
Pür oldu dust ğəmindən dərunü zahirimiz.

Ğübari-dəhri-dənidən kədərpəzir olmaz,
İmarət eylədi lütfin şikəstə xatirimiz.

Nola tökərsəm eşigində əşki-xunalud,
Xətayi, simü zərə meyl edər əkabirimiz.

***

Övliyadan hasil etdik eşq ilə sevdayi biz,
Zahidə verdik anunçün zöhd ilə təqvayi biz.

Dedilər ki, yedi tamu zülmətin hicranidir,
Ölmədən öndən cəhanda çəkdik ol ğövğayi biz.

Dedilər ki, səkiz uçmaq sirr olubdur zahidə,
Pərdəsiz nur anda gördük cənnətül-mə’vayi biz.

Cənnət elindən içəri bir əcayib mülk var,
Bihicab ol eldə gördük pirim, ol həmtayi biz.

Canü canan bilmişidik küfrü dini biədəb,
Qə’reyi-ümmanə daldıq, keçdik ol dəryayi biz.

Neçələr talib olubdur bu hüma kölgəsinə,
Çin elindən seyr edərkən bulduq ol dəryayi biz.

Ey Xətayi, dedi tuba pirimin yeg boyuna,
Heydərin yüzündə gördük ol güli-rə’nayi biz.

***

Sənsən həmişə surətü mə’nidə şahimiz,
Bilgil yəqin ki, arada həqdir güvahimiz.

Ey xubların güzidəsi, rövşən yüzün kimi
Nola əgər səfid ola bəxti-siyahimiz.

Vəslindən ayru möhnətü hicran içində mən,
Əflakə düşdü ğülğüleyi-suzi-ahimiz.

Billah, inan, bu doğru sözü əgri sanma kim,
Lütfündən özgə dünyadə yoxdur pənahimiz.

Bəndə Xətayi canını sana fəda qılur,
Ey afitab təl’ətü sün’i-ilahimiz.

***

Sənsən cahan içində bu gün padşahimiz,
Ruzi-əzəldə həzrətin oldu pənahimiz.

Cövr etmə mən şikəstə dilü binəvayə kim,
Çün səndən özgə kimsənə yox dadxahimiz.

Hər xanda kim, sücud edərisəm be e’tiqad,
Mehrabi-qaşlarındadurur qəbləgahimiz.

Bir gün tərəhhüm eyləmədin xaksarına,
Yarəb, nə sadir oldu qapunda günahimiz?

Ğəmdən Xətayi dərd ilən incəldi çün hilal,
Bir mahdır görünmədi ol hüsni mahimiz.

***

Ey dodağın şəhdü şəkkərdir, siyəh xalın məgəs,
Olmasun eşqindən ayru təndə canım bir nəfəs.

Ey pəri, hər dəm nigəhban qapuna hacət degil.
Kim, yetər kuyində hər şəb naləvü ahim cərəs.

Neylərəm eşqindən ayru dünyanun ləzzatini
Kim, hüzuri-dil ğəmi-mehrin mənim könlümdə bəs.

Çün əzəldən eşqiniz canımda həqdəndir nəsib,
Həq bilür kim, ta əbəd könlümdə vardır ol həvəs.

Ey Xətayi, ğəm yemə, hər sözdə şükr et xaliqə,
Çün sana hər işdə daim həqdürür fəryadrəs.

***

Yarı gördüm bu gün xəndan oturmuş,
Yanağı tazə gül, reyhan oturmuş.

Yüzinə qarşu ğönçə güldügiçün
Səhər ağzına çalmış qan oturmuş.

Səninlə hüsn içində bəhs edənlər,
Necə peşman olub heyran oturmuş.

Sənin simin zənəxdanına, ey dust,
Nə həddim var desəm, dəndan oturmuş.

Dodağın çevrəsində qoşa xallar,
İki zəngi ona dərban oturmuş.

Sənin Leyli cəmalın görmək içün
Yolunda Məcnuni-heyran oturmuş.

Xətayiyə nəzər qıl çeşmin ilən,
Qapunda sübhü şam giryan oturmuş.

***

Həq ləbindən ğönçəni gülşəndə xəndan eyləmiş,
Leyk bu naziklik ilən anı xandan eyləmiş?

Qamətinin gül kimi tərhin götürmüş bağban,
Bağda əksindən anın sərvi-xuraman eyləmiş.

Div oğurlamışdı bir zərdə dəhanın nəqşini,
Varmış andan xatəmi-möhri-Süleyman eyləmiş.

Zülməti-zülfində içmiş ləblərin abini Xızr,
Heyyi-baqi bulmuş, adin abi-heyvan eyləmiş.

Şanədən məşşatə salmış bir saçın qılın yerə,
Sərbəsər xaki-cəhanı ənbərəfşan eyləmiş.

Arizin bağında bir mürği-hərim olmuş Xəlil,
Ol səbəbdən həqq ana odu gülüstan eyləmiş.

Bu Xətayi qanını tökməkdə ikən tökmədin,
Anda hər müfti ki, mən’ etmiş bəsi qan eyləmiş.

***
Məclis əhli çaxır içəndə dutar əldə əyağ,
Sanasan bir şəm’dir kim, üstə yanır bir çırağ.

Gülşəni-məclisdə bir şux pəridir, dilrüba,
Sanasan bir lalədir, bağrında anın dürlü dağ.

Dustkam olsun həmişə ol berəğmi-dustan,
Oldu məclisdə müşərrəf busə səndən solu sağ.

Müşki-ənbər məcməridir, yoxsa cami-meydürür,
Buyi-xubindən anın daim müəttərdir dimağ.

Mehr ilən yari ki, gəlmişdir zi gülşən yadigar,
Bu Xətayi xəstədildir xaki-ol məhruyi-bağ.

***

Ol pəri peykər mana yar olmadı, heyf oldu, heyf!
Aldı könlümni, vəfadar olmadı, heyf oldu, heyf!

Saxlar idim qəhrini könlümdə daim can kimi,
Sirrimi faş etdi, əsrar olmadı, heyf oldu, heyf!

Kim ki, yüz min məkr ilə qıldı məni səndən cüda,
Yüz bəlayə ol giriftar olmadı, heyf oldu, heyf!

Firqətin odinə yandım, canü dil oldu kəbab,
Kimsə halımdan xəbərdar olmadı, heyf oldu, heyf!

Eşq əlindən xəstə düşdü bu Xətayinin təni,
Ləblərindən bircə timar olmadı, heyf oldu, heyf!

***

Ey deyən kim, aqiləm, divanə xoş gəlmək gərək!
Kim qılur lafi-hünər, meydanə xoş gəlmək gərək!

Gər Əzizi-Misri-eşq olmaq dilərsən, ey könül,
Yusifi-Misri kimi zindanə xoş gəlmək gərək!

Ey könül, laf etmə kim, mə'nidə laf edən kişi
Mə'rifət meydanına mərdanə xoş gəlmək gərək!

Zahida, vird eylə daim zikrü fikri-ruyi-dust,
Əhli-islaməm deyən imanə xoş gəlmək gərək!

Aşiqəm dersən, könül, şərti budur aşiqlərin;
Hər nə kim, cananə qılsa, canə xoş gəlmək gərək!

Ey dil, ol şəh qatinə kəndusi vəsfindən ayıt
Kim, qulun hər bir sözü sultanə xoş gəlmək gərək!

Aşiqəm dersən, könül, eşq atəşindən dönmə kim,
Şəm' odinə yanmağa pərvanə xoş gəlmək gərək!

Kim ki, qərq olmaq dilər dər bəhri-eşqi-bikənar,
Kəştisiz bu lücceyi-ümmanə xoş gəlmək gərək!

Ey Xətayi, şe’rini ol yar istər dinləyə,
Dilrübalər guşinə dürdanə xoş gəlmək gərək!

***

Firqətin çəkdim, nigara, vəsli-rüxsarın gərək
Xəstəhaləm, dilbəra, lə’li-şəkərbarın gərək.

Baxmanam gül yüzinə hüsnin var ikən, ey pəri,
Neylərəm mən nərgisi, ol çeşmi-bimarın gərək.

Bəhri-çeşmim ağlamaqdan əbr tək baran tökər,
Bu pərişan könlümə ləfzi-göhərbarın gərək.

Mürği-bağı-eşqsən, əbsəm oturma, can quşu,
Dilbərin kuyində daim naleyi-zarın gərək.

Ey Xətayi, gülşənə var, xaki-payin gör anın,
Gər sana ol ahu gözlü, müşkbu yarın gərək.

***

Yazmışam bu rüq’əni, ol yarə göndərmək gərək.
Zar əhvalım mənim dildarə göndərmək gərək.

Lə’linizdən cami-mey bir kimsəyə vermək nədən?
Ləblərin şərbətləri bimarə göndərmək gərək.

Qaşların mehrabinə çox səcdeyi-şükr eylərəm,
Şeyx Sən’an tək məni zünnarə göndərmək gərək.

Çün təcəlla nurini görmək təmənna eylərəm,
Şimdi Mənsurəm, məni bir darə göndərmək gərək.

Ey Xətayi, ondan özgə kimsəyə yoxdur ümid,
Naleyi-zarım mənim ol yarə göndərmək gərək.

***

Mən görmədim zəmanədə hüsnin kəmali tək,
Bu canə munis olmadı kehrin xəyali tək.

Zülmati-hicr içində bulunmaz susuzlara,
Şol çeşmeyi-dodağının abi-zülali tək.

Çeşmi ağardı nöh fələkin, qəddi oldu xəm,
Dövri-qəmərdə görmədi qaşın hilali tək.

Min yil yazarsa katibi-təqdiri-ləmyəzəl,
Bir hərfü nöqtə yazmaz anın xəttü xali tək.

Yusif cahanə gəlmədi yar tək Xətayiyə,
Yə’qubi-xəstə çəkmədi könlüm məlali tək.

***

Ta xəyali-arizin gəldi gözümə xab tək,
Gecələr hər dəm gözümə görünür məhtab tək.

İxtiyar ilən mənim düşməz bu canım eşqinə,
Neyləyim, çəkdi xəyali-zülfiniz qüllab tək.

Gər namazım fövt ola, zahid, mana tə’n etmə kim,
Yar qaşıdır mana məsciddəki mehrab tək.

Ol zamandan bərlü kim, çeşmim yüzüni görmədi,
Yaş gözümdən cari oldu dəmbədəm seylab tək.

Yarə gər aləm nəzər qılsa, Xətayi, qəm yemə,
Baxmaq olmaz yüzinə xurşidi-aləmtab tək.

***

Cahanda görmədim ziba sənin tək.
Bu aləm içrə hüsnara sənin tək.

Bu xublar gülşənində yoxdurur hiç
Yanağı bir güli-həmra sənin tək.

Bulunmaz, doğrusu, can bağı içrə
Qədi çün sərv xoş bala sənin tək.

Çü xublar çoxdurur insan içində,
Heç olmaz, ey pəri, rə'na sənin tək.

Zəmanə şairində görmədim hiç,
Xətayi, bülbüli-guya sənin tək.

***

Yüzündür bu cahan içrə fələkdə mahi-taban tək,
Bitibdir hüsn bağında boyun sərvi-xuraman tək.

Vüsalına irən, derlər, həyati-cavidan buldu,
Saçın zülmatinin içrə ləbindir abi-heyvan tək.

Məgər kim, vəhyi-münzəldir qaşınla kirpigün, zülfün,
Yüzün övraqinin üstə yazılmış sətri-Qur'an tək.

Əcəbmi olsa, ey dilbər, vücudim eşqinə məhkum?
Oturmuş hökm edər daim könül təxtində sultan tək.

Müşəvvəş xatir olmuşdur Xətayi xəstədil daim
Sənin ol gül yüzün üstündəki zülfi-pərişan tək.

***

Ta vücudim eşqiniz yolunda bolmuşdur həlak,
Ayağın tozundan ayru oldu canım dərdnak.

Ta ola hər dəm mənim baş üstə qaim dövlətim,
Asitanında yaturmən daima bər ruyi-xak.

Hər necə cəhd etdim, ölüm daməninə yetmədi,
Paybusin həsrətindən eylərəm yaxamı çak.

Xalis oldum ta ki mən qan yaş axıtdım didədən,
Yumayınca qan ilən olurmi mərdüm yüzi pak?

Bir pərini sevdi bu miskin Xətayi könlü kim,
Eşqinə məftun olubdur öz səmək ta bər səmak.

***

Ey ki, eşqindən olubdur canü dil ğəmdən həlak,
Sən nə məzhərsən cahanda, ey cəmali-nuri-pak?

Ey pəri, eşqində mana çox cəfalər qılma kim,
Xəstəvü heyraninəm, oldum ğəmindən dərdnak.

Damənini qoymanam əldən, əgər çıxsa rəvan,
Gərçi hicranın əli qıldı yəxəmni çak-çak.

Cümlə aləm gər həsud olsa, yanımda bir cövə,
Sən mənimlə dust bolsan, cövri-düşməndən nə bak?

Bəndəni lütfü kərəm birlə nəzərdən salmagil,
Ey Xətayinin pənahi, leysə fi hübbi səvak.

***

İstəmən cismimdə can, ol dilrüba canım gərək.
Bir dəxi ol ay yüzin görsəm ki, imanım gərək.

Çox bəlavü dərdü ğəm çəkdim yolunda səbr edib,
Dərdi-hicran həddən ötdü, şimdi dərmanım gərək.

Dil ğəmin səhrasinə lə'lindən istər qətrə su,
Zülməti-hicranda qaldım, abi-heyvanım gərək.

Ey fələk, qıldın məni dilbərdən ayru natəvan,
Mən həvadə zərrəyəm, xurşidi-tabanım gərək.

Bu Xətayi qulluğa bağlandı xidmət qurşağın,
Ol gözüm nuri sənəm, ol sevgili canım gərək.

***

Hər kimin kim, dərdi var, dərmanə göndərmək gərək,
Hər kimin kim, dərdi yox, viranə göndərmək gərək.

Hər kimin canında xublar həsrəti vardır müdam,
Dünyədə ar etməsün, didarə göndərmək gərək.[1]

Dinməyən, dindirməyən girmək gərək öz küncinə,
Hər kimin sevdası var, seyranə göndərmək gərək.

Hər kim iqrar əhlidir, yoxdur niza', qoy dinləsin,
Hər kimin də'visi var, divanə göndərmək gərək.

Bu Xətayidir bu gün meydanda zərbi-dəstilən
Hər kimin sevdası var, meydanə göndərmək gərək.

***

Könlüm fəraq içində cəmalın dilər sənin,
Baxmaz çinarə, qəddi-şümalın dilər sənin.

Növ ayi gögdə, istər isə xəlq eyd içün,
Çeşmim həmişə qaşi-hilalın dilər sənin,

Yarəb, zəvalın olmasun, ey afitabi-hüsn,
Aşiq cahanda hüsni-cəmalın dilər sənin.

---

[1] Xətayi "Divan"ının Vatikan nüsxəsindən götürülmüş bu qəzəldə həmin misra qüsurludur, qafiyə pozulur. Didarə sözünün yerinə cananə, məstanə və buna bənzər bir söz yazılsa, qafiyə düzələr.

Dünyadə gərçi olmadı vəslin mana nəsib,
Könlüm gözümdə xeyli-xəyalın dilər sənin.

Ta kim, Xətayi gördü yüzün, ey məhi-Xötən,
Səhrayi-dildə çeşmi-ğəzalın dilər sənin.

***

Cana, ğəmində qismi cəfadır Xətayinin,
Leykin dilində mehrü vəfadır Xətayinin.

Lə'lin əgər verürsə dəva dərdməndinə,
Bir busəsinə canı fədadır Xətayinin.

Hər dəm ki, xaki-payini der tutiyayi-çeşm,
Giryan gözünə eyni-şəfadır Xətayinin.

Ta görmüşəm yüzün günəşin, ey qəmərliqa,
Hər dəm dilində şəmsüz-zühadır Xətayinin.

Könül alıb bəhasını versən vüsal ana,
Mürvət sənin bu işdə, rizadır Xətayinin.

Ta ağ yüzündə çini-saçındır məqami-dil,
İqlimi-Rumü Çinü Xətadır Xətayinin.

Gəldi Xətayi qapuna, vergil murad ana,
Hüsnin həqqinə zikri duadır Xətayinin.

***

Ta necə xab içində xəyalın görüm sənin,
Vəqtidürür ki, şimdi cəmalın görüm sənin.

Dərdi-fəraq içində qatı zarəm, ey sənəm,
Bir gün ola ki, ruzi-vüsalın görüm sənin.

Yetdi kəmalə, ey ğəmi-hicran, cəfalərin,
Şimdi məhəldürür ki, zəvalın görüm sənin.

Canımni eydi-vəslinə qurban edim rəvan,
Bir gün ola ki, qaşi-hilalın görüm sənin.

Yarəb, Xətayi görməsün ol möhnətü fəraq,
Yetüb vüsalə, rəf'i-məlalın görüm sənin.

***

Ta ki, sən ey ğönçə ləb, lə'lini xəndan eylədin,
Dərdə saldın, lalə tək bağrım qara qan eylədin.

Eşqiniz qıldı müsəxxər bu vücudim şəhrini,
Ta ki, mehrini könül mülkində sultan eylədin.

Könlümə cəm' oldu yüz min dürlü sevdayi-siyah,
Gül yüzün üstündə ta zülfin pərişan eylədin.

Ta ki, gülşən gəştinə çıxdın, əya gülrüx sənəm,
Bağça içində boyun sərvi-xuraman eylədin.

Qəhrü cövrün lütf qıldı bu Xətayi xəstəyə,
Mərhəba, xoş gəldin, ey can, lütfü ehsan eylədin.

***

Ol günəş bir zərrədir nuri-cəmalından anın,
Utanıbdır sərvü ər'ər qəddü balından anın.

Ol zamandan bərlü kim, yüzün görübdür gögdə mah,
Gizlənibdir yengi ay qaşi-hilalından anın.

Gül yanağından qızardı, daim oldu şərmsar,
Ru siyəhdir müşkü ənbər xəttü xalından anın.

Yerdə bir ay nurudur, aləm ana heyran olub,
Ayü gün bir ləm'ədir hüsni-kəmalından anın.

Bu Xətayi xəstədil kim, dərdinin dərmanı yox,
Bir mədəd ola məgər kim, zülcəlalından anın.

***

Dilbəra, mahim mənim fərrüx cəmalındır sənin,
Gün dəxi şol təl'əti-fərxəndə falındır sənin.

Özgə gözlər gögə baxar görmək içün mahi-nov,
Eyd içün mən baxdığım qaşi-hilalındır sənin.

Dinləmən ahəngi-qumri, bülbülin sövti ki var,
Guşi-dildə hər dəmadəm qeylü qalındır sənin.

Munca dəmdir dilbərin gördün vüsalın, ey rəqib,
Çün kəmalə yetmədin, imdi zəvalındır sənin.

Sürməgil mülki-Süleymandan Xətayi xəstəni,
Çünki bir muri-zəifi-payimalındır sənin.

***

Firqətin çəkdim, nigara, şimdi yar olmazmısan?
İxtiyarım getdi əldən, ixtiyar olmazmısan?

İntizarım həddən ötdü, hicr ilən oldum həlak,
Ğəmlü könlüm halinə bir ğəmgüsar olmazmısan?

Düşmədim sevda əlindən, bülbüli-can oldu lal,
Vəqtdir gül çöhrən açıb novbahar olmazmısan?

Munca möhnət çəkdin, ey dil, zülməti-hicran şəbi,
Ol məhin vəslinə yetdin, bəxtiyar olmazmısan?

Gər günahın çoxdur, ey miskin Xətayi, ğəm yemə,
Rəhmətinə xaliqin ümmidvar olmazmısan?

***

Gəl ey dildər, tənimdə can olubsan,
Nə canım, bəlkə həm canan olubsan.

Hədisi-Mustafadır “əkrəmüz-zeyf”,
Könül mülkində xoş mehman olubsan.

Əzəldən kövkəbi-rəxşan idin sən,
Bu dövranda məhi-taban olubsan.

Könül, ta gül yanağın gördün anın,
Oxu kim, bülbüli-xoşxan olubsan.

Xətayi könlün aldın xəndə birlən,
Əya gül bərgi, sən xəndan olubsan.

***

Qarşudan dün gəldin, ey sərvi-rəvanım, sənmidin?
Zində qıldun uş bu cansız cismü canım, sənmidin?

Dün xəyal ilən pəri tək əzm qıldın suyi-mən,
Bəs rəvan keçdin, əya ruhi-rəvanım, sənmidin?

Sirrimi pünhan edərdim xəlqə, çün gördüm səni,
Xəlqə faş oldu qamu sirri-nihanım, sənmidin?

Munca eşqin bari çəkdi bu Xətayi cövr ilən,
Sormadın bir qatla halın, pəhləvanım, sənmidin?

***

Yar aydır: – Gün nədir? Aydım: – Cəmalındır sənin.
Ay dəxi şol təl’əti-fərxəndə falındır sənin.

Ruzi-me’raci-nəbi vəslin günidir, ey mələk,
Qabi-qövseyi ol du əbruyi-hilalındır sənin.

Dilbərin vəsli-kəmalın çox görübsən, ey rəqib,
Ey kəmalə yetməmiş, imdi zəvalındır sənin.

Ağzımı təlx eylədi hicrin, təkəllüm qıl mana,
Tutiyi-şəkkər şikən şirin məqalındır sənin.

Ey Süleymani-zəmanə, aşiqin sor halını
Kim, qapunda mur nisbət payimalındır sənin.

Ay yüzinin səfhəsidir ayəti-“fəthün qərib”,
Hərfü nöqtə ol yüz üstə xəttü xalındır sənin.

Danla derlər dideyi-mö’min liqayi-həq görür,
Bu Xətayi xəstəyə ruzi-vüsalındır sənin.

***

Bəşarət könlümə, şah, sənmi gəldin?
Bu quru cismimə cansənmi, gəldin?

Məni dərdlü qoyub getdün bu yerdən,
Yenə dərdliyə dərmansənmi gəldin?

Əlin qanlu, gözün kinli, nə haldır?
O şərdə[1] qan edüb andənmi gəldin?

Yusif şəhrinə gəldin Misrdənmi?
Həsən, Hüseyn, şəhi-Kən’anmi gəldin?

Bu qul biçarəyə şah sən yetərsən,
A dövlət elçisi, şahdənmi gəldin?

---

[11] Şərdə – şəhrdə, şəhərdə

***
Aqibət, ey məh, məni aləmdə heyran eylədin.
Çeşmimi giryan qılub bağrımı büryan eylədin.

Xatidim məcmu ikən aşüftə qıldın, ey pəri,
Sən anı zülfin kimi əmdən pərişan eylədin.

Şol günəş tək hicrdən, ey tilbə könlüm, boldu kim,
Qönçə tək başdan-başa çaki-giriban eylədin.

Dil ara aşiqliğim pünhan ikən, ey pəri,
Xəlq ara sən ani yüz dillərdə dastan eylədin.

Cövri-eşqin, ey həbibim, eylə həddən ötdü kim,
Bu Xətayi xəstəyə qanımnı asan eylədin.

***

Məni əfgar edən ol xəttü xalın
Bikrdir çeşmeyi-lə'li-zülalın.

Zi Xızr anı görübdürsə Məsiha,
Əcaib xəlqi vardır zülcəlalın.

Nə cansan sən, mənim canumdan artux,
Könüldən getmədi bir dəm xəyalın.

Müqəddərdir mana ruzi-əzəldən
Deyim aləmdə daim vəsfi-halın.

Xətayinin duasıdır dəmadəm
Ki, yarəb, olmasun hərgiz zəvalın.

***

Sataşdı ta mana məstanə çeşmin,
Yazıbdır adımı dastanə çeşmin.

Məgər kafirdir, ol mehrab içində
Oturmuş, gəlməz iç[1] imanə çeşmin.

Geyibdir qaranı zahid kimi ol,
Mey içməkdir işi rindanə çeşmin.

İçibdir qanimi, derəm, inanmaz,
Deyim mən kim, sana inanə çeşmin.

***
Xətü xalında zülfündür dəlili əhli-ürfanın
Ki, andan aşikar oldu bəyani elmi-Qur'anın.

Götürdün pərdə yüzündən, behəmdullah ki, ey dilbər,
Səni gördü, xəcalətdən qaraldı yüzü şeytanın.

Rüxün, yarəb, nə güldür kim, fəğanə düşdü bülbüllər
Ki, şövqündən anın hər dəm hüzuri var gülüstanın.

Əya sultani-adil kim, işim sənsiz keçər müşkil,
Budur səndən muradım kim, gədadən kəsmə ehsanın.

Cənabi-asitanında, diriğa, qiymətim yoxdur,
Vüsalın özgələr gördi, məni yandırdı hicranın.

Qaş ilə kiprigin, eynin nə sehri-Samiridir kim,
Olarin məkrü alindən cahanı dutdu dastanın?

Xətayi, çeşmi-məstindən həbibin ehtiraz eylə,
Əgər qanın dökər hər dəm ki, oldur canü cananın.

***

Sünbülini arizin dövrində əfşan eylədin,
Xatiri-məcmuimi ğəmdən pərişan eylədin.

[1] İç – “heç” sözünün vəznə görə qısa deyilmiş şəklidir.

Xoş məqami-ə'zəm olmuşdur bu könlüm guşəsi,
Bilməzəm, yarəb, nədən cövr ilə viran eylədin?

İstər idim sayeyi-vəslindən, ey candinlənim,
Üştə zülm etdin mana, vəslini hicran eylədin.

Çeşmi-məstindən hezaran fitnə saldın könlümə,
Türki-yəğmaçi kimi, billah yüküş qan eylədin.

Bu Xətayinin çıxardınmı könüldən, ey həbib,
De məgər özgələr ilən əhdü peyman eylədin?

***

Ey sənəm, yüzində müşkin zülfini dağıtmagil,
Bağrımın yüz dağı üstə bir dəxi dağ etməgil.

Ta yüzini görmüşəm, divanə oldum dərd ilə,
Zülfinizdən özgə dəxi boynuma bağ etməgil.

Şol qara yüzlü rəqibi qoyma kuyin gerdinə,
Xəstə bülbül tək məqamin mənzili-zağ etməgil.

Ey pəri, aşiqlərin divanə qılma könlünü,
Aşiqin Məcnun misali məskənin dağ etməgil.

Ey Məsiha, bəndəni kuyində yad et bir nəfəs,
Bu Xətayinin yerin hicrində toprağ etməgil.

***

Ahü vaveyla kim, ol gülrüx pəri yarım degil.
Mən ona yar oldum, ol yari-vəfadarım degil.

Mən sana bir bəndəyəm, ey yari-dilxahım mənim,
Billah, iqrarımdurur bu sözlər, inkarım degil.

Naseh aydır dün mana: – Tərk eylə anın eşqini.
Vəh nedim kim, ol mənim həmrazi-əsrarım degil.

Sevgili yarın vüsalı xoşdur, amma neyləyim,
Möhnəti-hicran günündə bir mədədkarım degil.

Dilbər aydır: – Ey Xətayi, möhnətimdən çəkmə ğəm,
Kimdürür eşqimdə ol, zarü diləfkarım degil.

***

Ey mələk, hüsnin sənin nuri-xudadır, bilmiş ol.
Sidrədir boyun, nə sidrə, müntəhadır, bilmiş ol.

Mən sənin dərdü ğəmindən incimən, ey bivəfa,
Hər nə cövr etsən mana, eyni-vəfadır, bilmiş ol.

Yoxdurur əşya içində kimsənə haqdən cüda,
Cilvə qılan aləmə nuri-xudadır, bilmiş ol.

Gərçi çox gəldi risalət dövri-adəmdən bərü,
Xətmi cümlə ənbiyanın Mustafadır, bilmiş ol.

Gər vəfa qıl bu Xətayi bəndənə, ya qılma kim,
Ruzi şəb virdim sana zikrü duadır, bilmiş ol.

***

Axan ol sərvin yanında su degil, yaşımdır ol,
Ayağın altındakı başmaq degil, başımdır ol.

Ta xəyalınla sənin dəf'i-məlal eylər könül,
Getməsün dildən ki, xoş həmrazü sirdaşımdır ol.

Mən dedim kim, çeşmü ğəmzən sehri dutdu aləmi,
Onların sərfitnəsi kimdir? Dedi: – Qaşımdır ol.

Gözümün yaşın ki, saldım içdigim sudur mana,
Bağrımın qanın ki, gördüm, ağulu aşımdır ol.

Can fəda qıldı Xətayi, deмədi ol bivəfa,
Heyf, köçdü aşiqi-sərbazi-qəllaşımdır ol.

***

Riştədir cismim mənim, kirpüklərin suzən misal,
Yaylığın yanına dutar natəvan könlüm misal.

Gül-gül oldu arizin şövqün görübən şəm'i-dil,
Düşsə zülfin əksi şol gül yağlığ üstə dal-dal.

Dəmbədəm yaylığ arasında, həbibim, qaşların
Sanasın kim, görünür el gözünə gögdən hilal.

Natəvan könlüm düşər yaylığ misal əldən-ələ,
Ta məgər lə'li-ləbindən tapıla bər can vüsal.

Rəhm qılgil – yaylığın götür yüzündən, ey sənəm,
Qüssədən bolmuş Xətayi xəstədil aşüftəhal.

***

Kim ki, sərməst oluban aşiqi-didar degil,
Sən ona yar demə, yar degil, yar degil.

Ruzi-məhşərdə dutub damənini sanki derəm:
"Bu dəxi, ey gözəlim, dünyeyi-qəddar degil".

Zahid ol yüzini divarə dutub əl götürür,
Aşiqin məqsudi didar ola, divar degil.

Şahimin könlü bilür ol ki ğənidir həmişə,
Münkir oldur ki, bu sözlərimə iqrar degil.

Ləşkərim, ğazilərim, sufilərim, pirlərim,
Can ilə başı bu yolda mana inkar degil.

Qır Yezid ilə xəvarici, tükət, qalmaya heç,
Nişə kim, Cə’fəri məzhəbə tələbkar degil.

Ey Xətayi, bu cahan mülkini sən qalmaya gör,
Çünki heç kimsəyə qalmadı, sana yar degil.

***

Bu əzilmiş canü dildən, ah, ah əksük degil,
Gecə-gündüz müttəsil, dər gah-gah əksük degil.

Başə çizginsəm, vəleykin ğəm degildir, dilbərin
Ol səadət əhlidir, andan külah əksük degil.

Çəngi aldım mən bekəf, bir dəm fərağət bulmadım,
Həzrətindən xaliqə heç rusiyah əksük degil.

Başın üstən getməzəm onca ki, canım təndədir,
Çətrü xərgahi-humayun barigah əksük degil.

Çün Xətayi könlünü verməz vəfasız dilbərə,
Qul olana sidq ilə kim padşah əksük degil.

***

Sünbülün küfründən, ey şəhzadə, iman münfəil.
Xətti-səbzin rövnəqindən bərgi-reyhan münfəil.

Zülmətə nur oldu zülfün, ay yüzündən şərmsar,
Ləblərin şövqindən ol lə’li-Bədəxşan münfəil.

Pərtövi-hüsnin ziyasından Sürəyyadır xəcil,
Surətin tabından ol xurşidi-taban münfəil.

Ey səba, billah, dilimdən söylə kim, çox olmasun
Mahtab üstündən ol zülfi-pərişan münfəil.

Qeyrətindən bir nəzər fanus yüzün göstərmədi,
Məclisində yandırır çün şəm'i-pünhan münfəil.

Ol zaman kim, dilbərim bustanə girdi seyr içün,
Qamətindən oldu hər sərvi-xuraman münfəil.

Uş Xətayi sözlərindən əhli-ürfan utanur,
Cahilü nadan, rəqibü namüsəlman münfəil.

***

Dilbəra, yüzünü görsəm mahi-tabanım derəm,
Boyunu görgəc budur sərvi-xuramanım derəm.

Kirpigin, qaşın görüb tirü kamanım söylərəm,
Zülf ilən vəchin görüb şəm'i-şəbistanım derəm.

Zəhməti-dərdin könüldə eyni-dərmandır mana,
Can demən mehrinə təndə, bəlkə cananım derəm.

Bülbüli-baği-vüsaləm, ey güləndamım mənim,
Arizü rüxsarını görsəm, gülüstanım derəm.

Eşqiniz könlündə çün dutmuş Xətayinin məqam,
Mən anı viran içində gənci-pünhanım derəm.

***

Dilbəra, hüsni-rüxün gülzari-cənnət bilmişəm,
Hər nə kim zəhmət görürsəm, eyni-rahət bilmişəm.

Necə kim, cövrü cəfa qılsan bu ğəmgin könlümə,
Ol ğəmindən ağrıman, canımda minnət bilmişəm.

Təndə can olduqca getmən asitanından sənin,
Ayağın torpağını baş üstə dövlət bilmişəm.

Hər nə kim, səndən gəlürsə, xəstə könlüm nuş edər,
Qəhrini rahət sanıb cövrünü rəhmət bilmişəm.

Mən Xətayi bəndəyəm bir padşah qatına ekim,
Eşigində qulluğun sultanca izzət bilmişəm.

***

Təala şə'nəhu əkbər ki, bir nuri-xuda gördüm,
Qaşını qibləgah etdim, yüzün şəmsüz-züha gördüm.

Mənim Pərvim təki çeşmim gecələr uyxusuz qaldı,
Səadət asimanında yüzün bədri-düca gördüm.

Mənim dərdim əlaci şol həkimi-ləmyəzəldir kim,
İçəndən şərbəti-lə'lin vücudimni şəfa gördüm.

Şəbi-hicranda, ey salik, hidayət şəm'inə yandım,
Yüzünün afitabından yüz ənvari-ziya gördüm.

Görəndən bərlü didarın Xətayi xəstədir, heyran
Ki, anın asitanında səlatinlər gəda gördüm.

***

Dil sana heyran olubdur, ta cəmalın görmüşəm,
Ta göz açıb ol rüxi-fərxəndə falın görmüşəm.

Ruzü şəb dünya içində məstü heyranəm müdam,
Gecələr uyxu içində ta xəyalın görmüşəm.

Dünyəvü üqbadə mən övsafi-hüsnin söylərəm,
Bağçada andan bərü qəddi-şümalın görmüşəm.

Bir pərinin yüzünə heyranü zarəm can ilə,
Şol ləbü zülfü rüxü həm xəttü xalın görmüşəm.

Bu Xətayinin gözü səyyarə tək bixabdir,
Gül yüzün üstündə ta qaşi-hilalın görmüşəm.

***

Xeyli dəmdir, ey pəri, ol məh camalın görməzəm,
Dünyada bir dəxi misli-xəttü xalın görməzəm.

Hər zaman dersən mana kim, xatirin qılma məlul,
Necə olum şadman kim, cüz məlalın görməzəm.

Xeyli müddətdir cahanda firqətinlə həmdəməm,
Hicr ilən ömrüm tükəndi, heç vüsalın görməzəm.

Gözümü qan etdi hicran, vəsli-ruyin görmədim,
Qamətim xəm qıldı ğəm, qəddi-şümalın görməzəm.

Dil müşəvvəşdir Xətayi, ey səadət kövkəbi,
Ta sənin ol təl’əti-fərxəndə falın görməzəm.

***

Ey pəri, hüsnin sənin mahi-münəvvər görmüşəm.
Ol yüz üstə əbr tək zülfin müənbər görmüşəm.

Gərçi məhşər bir olur əhli-cəhanə, ey sənəm,
Firqətinin hər günün mən ruzi-məhşər görmüşəm.

Bəs ki, bülbül tək cəhanda eşq ilən fəryad edim,
Arizin bağı gülin çün vərdi-əhmər görmüşəm.

Bəs mənim mülki-cəhanda taleyim firuz ola,
Ta sənin yüzün kimi bir sə’di-əkbər görmüşəm.

Bu Xətayinin məqami asitanındır müdam,
Çün səni şahi-kərəm, özümni Qənbər görmüşəm.

***

Ol pəri rə’na gedən sərvi-rəvanımdır mənim,
Sayə sanma sürünən yanınca, canımdır mənim.

Bülbüli-zarəm ki, hüsnin gülşənidir məskənim,
Həlqeyi-zülfin şikənci aşiyanımdır mənim.

Mu təki belin xəyalı incə fikrimdir müdam,
Zərrəcə ağzın sözü razi-nihanımdır mənim.

Mən nola kövkəb kimi hər şəb ğəmindən ölməyim,
Çün cəmalın gögdə mahi-asimanımdır mənim.

Dedim: – Ey dilbər, Xətayi kimdürür kuyində zar?
Dedi: – Bir heyranü valeh natəvanımdır mənim.

***

Ol pəri kim, çeşmi saqi, lə’li camımdır mənim,
Qaşı mehrabım, yüzü beytül-həramımdır mənim.

Dilbərin vəslindən ayru istəmən hər sübhü şam,
Yüzü sübhümdür, vəleykin zülfi şamımdır mənim.

Ol pəri peykər neçük canım quşun bənd etməsün?
Danədir xali, pərişan zülfi damımdır mənim.

Valehəm bir qəddi tuba, lə’li kövsər yarə kim,
Asitanı rövzeyi-darüssəlamımdır mənim.

Bu Xətayinin sözinə münkir olma, zahida,
Bir pərinin hüsni vəsfində kəlamımdır mənim.

***
Çıxmadı eşqin sənin bir ləhzə canımdan mənim,
Mehri-yüzin yegdürür ruhi-rəvanımdan mənim.

Gül yüzini yad edəndə, ey pərirüx, ğönçə ləb,
Od çıxar susən təki hər dəm zəbanımdan mənim.

Əksi-sayəndir vücudim, ey boyu sərvi-rəvan,
Getməsün sayən sənin bir ləhzə yanımdan mənim.

Pərtövi-xurşidi-ruyini görəndə zərrə tək,
Bulmaya heç kimsənə namü nişanımdan mənim.

Firqəti qəsd etmədin miskin Xətayi xəstəyə
Bir xəbər ver, ey səba, ol gülüstanımdan mənim.

***

Batinim hicrində, cana, dopdolu qandır mənim,
El yüzinə zahirim gül kimi xəndandır mənim.

Zəhri-hicrin ləşkərindən kişvəri-canə nə ğəm,
Çün xəyalın könlümün təxtində sultandır mənim.

Bülbüli-zarəm, yüzün bağü gülüstanımdurur,
Ol gülüstan üstünə zülfün şəbistandır mənim.

Çeşmi-məstin gecələr neyçün oyanmaz xabdən?
Kim, işim hər sübhü şam ah ilə əfğandır mənim.

Bu Xətayiyə rəqibin fitnəsi kar eyləməz,
Daima çün dəstgirim fəzli-sübhandır mənim.

***

Ta məni ayırdı dövran sevgi yarımdan mənim,
İncidi gögdə məlayik ahü zarımdan mənim.

Surətin gördüm, nigara, valehü sevdayimən,
Firqətin dövr eylədi səbrü qərarımdan mənim.

Ey pəri peykər, səni andan bəri kim, görmüşəm,
Hüsnin ayırdı qərarü ixtiyarımdan mənim.

Həsrətəm Yə’qub tək Yusif yüzünə, ey səba,
Tanrı içün bir xəbər algil nigarımdan mənim.

Ey Xətayi, hər tükün titrər xəzan yaprağı tək,
Ta məni dur etdi dövran növbaharımdan mənim.

***

Ol pəri eşqinə mən candangiriftar olmuşam
Kim, fəraqü möhnətindən ruzi şəb zar olmuşam.

Ta ki düşdüm ol nigarın məh yüzü hicranına,
Dərd ilən səyyarə tək hər gecə bidar olmuşam.

Ta ki, gülzari-cəmalından cüdayəm, ey sənəm,
Hər zaman bülbül təki dər eşqi-gülzar olmuşam.

Çünki eşqin gəncini könlümdə pünhan eylədim,
Ruzü şəb ol gəncə mən hər dəm nigəhdar olmuşam.

Ta səni gördü rəqib ilən Xətayi xəstədil,
Dəmbədəm yanır vücudim, sərbəsər nar olmuşam.

***

Ey pəri, şirin ləbin eşqində Fərhad olmuşam,
Ta sana qul olmuşam, aləmdə azad olmuşam.

Ta ki, səndən ayru düşdüm, ey dilaramım mənim,
Dəmbədəm dər naləvü əfğanü fəryad olmuşam.

Gərçi ğəmginəm ğəmi-hicrində, ey arami-can,
Ta səni gördü gözüm, ğəmgin ikən şad olmuşam.

Ey sənəm, bu möhnəti-hicrü fəraqindən sənin
Gər xərab idim, vəli vəslindən abad olmuşam.

Ta səni gördü Xətayi, bilməz özün xandadır,
Ta sana mən aşina boldum, özüm yad olmuşam.

***

Sənmisən yanımda, cana, yoxsa xabımdır mənim
Kim, fələkdən yerə enmiş mahtabımdır mənim?

Eşigində dəmbədəm baran degildir su səpən,
Çeşmeyi-dildən çıxan çeşmi-pürabımdır mənim.

Ey rəqiba, orta yerdə hər dəm olmagil hica,
Hüsni anın dünyədə bir afitabımdır mənim.

Sanmanız kim, kəştidir dəryalər üzrə seyr edən,
Gözlərim yaşında bu cismi-hübabımdır mənim.

Etdim: – Ey dilbər, Xətayiyə cəfalər qılma çox,
Dedi kim, ğəm çəkməgil, nazü itabımdır mənim.

***

Sənin tək dilbəri-canana yetdim,
Zi hicran ölmüş ikən canə yetdim.

Saçın küfrinə olmuşdum giriftar,
Yüzüni görgəcin imanə yetdim.

Eşigin itlərilə həmnişinəm,
Nə dövlətlü qulam, sultanə yetdim.

Könül qalmışdı hicran zülmətində,
Ləbindən çeşmeyi-heyvanə yetdim.

Ğəmindən gözlərim kövkəb kimidir,
Şükür kim, bir məhi-tabanə yetdim.

Misali-qətrə idim, qətrə, üzdüm,
Behəmdullah, yenə ümmanə yetdim.

Xətayi xəstədir vəslin gədası,
Qapundan vayəvü ehsanə yetdim.

***

Cəmalın gülşəniçün mürği-zarəm,
Nədən kim, həsrəti-ol mərğizarəm.

Bu mə’nidən həlak olman ğəmindən,
Vüsalından sənin ümmidvarəm.

Cəmalın vərdini gülşəndə gördüm,
Fəraqından saçın tək biqərarəm.

Yüzüni görməgə can vermədim çün,
Bu işimdən beğayət şərmsarəm.

Xətayi ömri xətm oldu, hənuz, ah,
Cəmalın görmək içün intizarəm.

***

Vüsalından sənin dur oldu könlüm,
Qəti bizarü bizur oldu könlüm.

Dili-viranimə ta gəldi eşqin,
Sanasan beyti-mə’mur oldu könlüm.

Cəmalın ta ki, gördüm, ey pəriru,
Yüzün şövqilə pürnur oldu könlüm.

Cəfavü möhnətin ta gəldi canə,
Bəlalərdən qamu dur oldu könlüm.

Gözündən çün irağ oldu Xətayi,
Qəti bimarü rəncur oldu könlüm.

***

Ey pərivəş hüsni gəncim, yar, səndən küsmüşəm,
Ləbi şəkkər, dişi incim, yar, səndən küsmüşəm.

Ayda-yildə bir gəzər gözüm görər yüzün sənin,
Ey mənim görki güvəncim, yar, səndən küsmüşəm.

Gögdə istərdim səni, mən yerdə gördüm, bigüman,
Töhfi-qüdrət, mahü əncüm, yar, səndən küsmüşəm.

Yar yarı beylə sorar, ey vəfasız bivəfa?
Həddən ötdü dərdü rəncim, yar, səndən küsmüşəm.

Bu Xətayi gərçi kuyindən dilər dur olmaya,
Vara bilmən çox üşəncim, yar, səndən küsmüşəm.

***

Adım İsmayıl  ibni Heydəriyəm,
Əlinin çakərinin çakəriyəm.

Hüseyni məzhəbəm mən din içində,
Məvali olanın mən rəhbəriyəm.

Mənim ğazilərümə hörmət eylən,
Könül evində onların biriyəm.

Məni onlardan ayru sanmanız siz,
Vəleykin onların mən sərvəriyəm.

Mənəm həm pirü həm sultani-aləm,
Xətayiyəm, şahın bir kəmtəriyəm.

***

Ta kim, ey dilbər, vüsalın getdi yanımdan mənim,
Dürlü möhnətlər keçər hər lərzə canımdan mənim.

Gər vücudim qəbr içində yüz min il qalsa müdam,
Çıxmıya bu nari-eşqin üstüxanımdan mənim.

Xanüman əhvalini məndən fəraqin sormasın,
Keçmişəm səndən cüda öz xanümanımdan mənim.

Qəbrim üstinə, səba, lütf eylə gəl, qılgil güzər,
Bir xəbər algil mana canü cəhanımdan mənim.

Həq bilür, səyyarə tək gözümə uyxu gəlmədi,
Ta fələk qıldı cüda ol mehribanımdan mənim.

Növcavan ikən məni hicran güni pir eylədi,
Ta ki düşmüşəm cüda ömri-cavanımdan mənim.

Qəddi xəm oldu ğəmindən bu Xətayi xəstənin,
Ta cüda düşdü könül qaşı kamanımdan mənim.

***

Ey cəmalında sənin nuri-ilahidir tamam,
Ol sifatın zikridir fikrim həmişə sübhü şam.

Ol şahənşahi-cəhansan kim, qul olub qapuna,
Qənbərinin xidmətiçün Qeysərü Cəmdir ğulam.

Hələtadə həq sana çün saqiyi-mütləq dedi,
Abi-kövsərdən sənin dəstindədir yaqut cam.

Ol Əlisən kim, xamu peyğəmbərə sənsən şəfi,
Cümlə bu ümmid ilən qapuna gəlür xasü am.

Çün sənin övsafinə yetməz Xətayinin sözü,
Uş bu əbyat üstə xətm oldu kəlamım, vəssəlam.

***

Gecə-gündüz istəkim dildar yarım bulmuşam,
Canü dil qurtuldu ğəmdən, ğəmgüsarım bulmuşam.

Gögdə istərdim mən ol mahimni, buldum yerdə uş,
Həmdulillah kim, könüldə intizarım bulmuşam.

Heç qərarım yox idi, səbrim tükənmişdi, vəli
Bər qərarəm kim, ənisi-ruzigarım bulmuşam.

Bəxtvarəm bəxt əlindən, şadmanəm, dil fərəh,
Çünki mən canü könüldən ixtiyarım bulmuşam.

Var ikən könlüm açıldı, sərbüləndəm, nişə kim,
Sərv boylu, qönçə ləbli gül’üzarım bulmuşam.

Zülməti-hicran yenə firuz boldu, getdi ğəm,
Taleyim bürcündə mahi-tabdarım bulmuşam.

Ey Xətayi, şükr qıl həq verdüginə ruzü şəb,
Sün’i-sane, qüdrəti-pərvərdigarım bulmuşam.

***

Ta ki, gördüm mən cəmalın, ey pərivəş dilbərim,
Mənzəri-xurşid tək yaş ilə doldu gözlərim.

Bülbüli-zarəm yüzündən ayru, taqət qılmazam
Kim, yüzündür bu cahan bağında vərdi-əhmərim.

Mən dəxi yad eyləmən dünyavü cənnət bağını,
Ləblərin ta kim, olubdur məşki-abi-kövsərim.

Şərbəti-hicrinlə qılma, dilbəra, ağzımnı təlx,
Tutiyəm, lə’lindürür qəndü nəbatü şəkkərim.

Neçə gündür ki, Xətayi asitanın yastanur,
Sormadın bir gün ki, xanı ol ğulami-kəmtərim?

***

Gözləri meyxanədir, meyxanəyə göndərmişəm,
Ləbləri peymanədir, peymanəyə göndərmişəm.

Dilbərin ağzı sədəfdir dedilər, hey dilbəra,
Dişləri dürdanədir, dürdanəyə göndərmişəm.

Gözləri fəttanədir, saxla özün fəttanədən,
Ol xədəngi qəmzəni fəttanəyə göndərmişəm.

Canımın cananəsidir şol nigarın ğəmzəsi,
Canıma nuş eylədim, cananəyə göndərmişəm.

Yandırır gör dəmbədəm eşq odilən dilxəstəni,
Nuri-vahiddir bu gün, pərvanəyə göndərmişəm.

Bu Xətayi söylədi: – Zülmat içindədir yəqin,
Yar mana həmxanədir, həmxanəyə göndərmişəm.

***

Dərdü fəraqü həsrət ilən canə gəlmişəm,
Küfri-saçınla vəcginə imanə gəlmişəm.

Zülfin şəbində təşnəyəm ol abi-lə’linə,
Zülmat içində çeşmeyi-heyvanə gəlmişəm.

Bir əndəlibi-kuyi-fəraq idim, ey sənəm,
Yüzüni görməgə bu gülüstanə gəlmişəm.

Xoş aqiləm ki, dünyadə isbati-eşq içün
Divanə gəlmişəm, vəli divanə gəlmişəm.

Qapundan ayru oldu Xətayi şikəstə hal,
Ümmid ilən eşiginə dərmanə gəlmişəm.

***

Ta ki, gördüm mən səni, aləmdə heyran olmuşam,
Naləvü əfğan edərmən, didə giryan olmuşam.

Ta fəraqından könül məcruh olubdur hər zaman,
Dəmbədəm dər naləvü fəryadü əfğan olmuşam.

Gül yüzün övsafini ta kim eşitdim, ey pəri,
Hüsninin bağında bir mürği-gülüstan olmuşam.

Necə cəm' olsun bu könlüm sənsiz, ey arami-can
Kim, səri-zülfin kimi ğəmdən pərişan olmuşam.

Ta dodağın cür'əsindən qılmışam bir qətrə nuş,
Xızr tək sirabi-nuşi-abi-heyvan olmuşam.

Ey əzizim, firqətindən çıxmazam ğəmxanədən,
Sən təki Yusifdən ayru piri-Kən'an olmuşam.

Bu Xətayi ta hilali qaşların gördü sənin,
Şol mübarək təl'ətin eydinə qurban olmuşam.

***

Dünyəvü üqbadə sən tək yari-ğəmxar istərəm,
Xəlq edər divarə səcdə, bəndə didar istərəm.

Tuti tək təlx oldu ağzım, istərəm şəkkər ləbin,
Bülbüli-sərgəştəyəm, hər gündə gülzar istərəm.

Hər vəfasız dilbərə vermən könül, ey dilrüba,
Bir sənin tək dilbəri yari-vəfadar istərəm.

Çün sən ey dərdə təbibim, etməsən dərmanımı,
Bu vücudi-zarimi hər gündə bimar istərəm.

Bu Xətayi bəndə ol qaşın quluyam sidq ilən,
Qılmışam bir qatla iqrari, nə inkar istərəm.

***

Ey can, mən cəmalını gördükcə can derəm,
Görsət kim, ol cəmalını görsəm, rəvan derəm.

Bir şəmmə gər gətirsə səba buyi-zülfi-yar,
Başilə əqlü canü könül tərcüman derəm.

Vəqti-əcəl gəlirsə mələk can içün mana,
Yüzüni görmədin ana canım xaçan derəm.

Hər kim ki, gün yüzün xəbərini gətirsə, yar,
Mən ana müjdə yerü gögü asiman derəm.

Dedi Xətayi dilbərə: – Lütfin nədir mana?
Dedi: – Yüzümdə aşiqə min gülüstan derəm.

***

Mənəm ki, bu zəmanə şimdi gəldim,
Rəvan oldum rəvanə şimdi gəldim.

Aşiqəm məstü heyran şahə çün mən,
Mühübbəm xanədanə şimdi gəldim.

Şaha müştaq idim ğayətdə, billah,
Şükr kim, asitanə şimdi gəldim.

Yezidü müşrikin kökün kəsərəm,
Çırağəm yanə-yanə şimdi gəldim.

Əzəldən gəlmişəm şah əmri ilən,
Sağınmagil, cahanə şimdi gəldim.

Mühübbəm on iki şahə əzəldən,
Vəleykin bu dükanə şimdi gəldim.

Süleyman xatəmi, Musa əsası,
Aləmə Nuh tufanə şimdi gəldim.

Məhəmməd mö'cüzi, şah Zülfüqarı
Əlimdədir, nişanə şimdi gəldim.

Xəvaric əhlini qoyman cəhanə,
Xətayiyəm, cəhanə şimdi gəldim.

***

Əzəldən eşq ilə divanə gəldim,
Yerim meyxanədir, məstanə gəldim.

Hezaran dona girdim mən, dolandım,
Bu gün xəsm ilə mən meydanə gəldim.

İmamımdır mənim ol şahi-mərdan,
Bu gün nəsli-Əli divanə gəldim.

İmam eşqinə çalaram qılıcı,
Münafiq qırmağa mərdanə gəldim.

Mənəm bunda Xətayi Heydər oğlu,
Çü Ismail kimi qurbanə gəldim.

***

Ol pəri peykər sənəm cismimdə canımdır mənim.
Getməsün könlümdən ol, ruhi-rəvanımdır mənim.

Sorsam ağzın zərrəmi, ya ğönçəmidir, ya dəhan,
Bu sözüm, yoxsa xəyalım, ya gümanımdır mənim?

Görəli ahu gözün eşq ilə Məcnun olmuşam,
Ol səbəbdən kuhü səhra xanümanımdır mənim.

Sərvə bənzətdin boyunu, ey rəqibi-kəcnəzər,
Necə dersən sərv anı, ömri-cəvanımdır mənim.

Zülfini müşk oxudum, aydır ki, əbsəm, söyləmə,
Müşk dəxi bir türabi-asitanımdır mənim.

Gözmidir, ya çeşmi-ahu, yoxsa nərgis, məstdir?
Yüzmidir ol, yoxsa mahi-asimanımdır mənim?

Sordular kim, ey Xətayi, necə sevdin yarı sən?
Dedi: – Yoxdur ixtiyarım, qilsitanımdır mənim.

***

Mən səni candan sevirəm, ey dilaramım mənim,
Ol səbəbdən zarü giryan keçdi əyyamım mənim.

Gecəm ilən gündüzüm fərq edə bilmən, ey sənəm,
Ruy ilən zülfin olubdur sübh ilən şamım mənim.

Ruzü şəb bülbül təki fəryadü zaridir işim,
Ta yüzündən ayru düşdüm, ey güləndamım mənim.

Munca kim, cövrü cəfa çəkdim, mana yar olmadı,
Ol sənəmsiz bilmənəm nolur sərəncamım mənim.

Bu Xətayi dünyada hüşyar olmaz bir zaman,
Ta kim, ol peymaneyi-lə’lindürür camım mənim.

***

Könüldə eşqini can tək dilərdim,
Saçın küfrini iman tək dilərdim.

Könül bimar olanda hicr odunda
Vüsalın dərdə dərman tək dilərdim.

Mənəm dil təşnə səhralərdə daim,
Ləbini abi-heyvan tək dilərdim.

Qalanda zülməti-hicran evində
Cəmalın şəm'i-taban tək dilərdim.

Xətayi varsa vəslin gülşəninə,
Boyun sərvi-xuraman tək dilərdim.

***

Pürşərab olsun həmişə uş bu cami-dustkam,
Məclis içrə düşməsün ol dust əlindən mey müdam.

Saqiya, ol cami sən doldur təmamət, sun bizə,
Ömrü nöqsan olsun anın kim, dedi anı həram.

Badədən pürdür sürahi, damənində ol müdam,
Sanasan güllər bitər pəhluyi-sərvi-xoş xuram.

Zəhi gülzari-müsəffa, zəhi cami-pür səfa,
Ol bizə eylər təvazö, biz ana hər dəm salam.

Fikrü zikrüm hər dəm ol sultani-aləmdir mənim,
Bu Xətayi xəstə anın Qənbərinə bir qulam.

***

Ey gül yanağlu, qəddinə sərvi-rəvan derəm,
Eşqin yolunda canımı versəm rəvan derəm.

Dil ahusin seyd etməgə peyvəstə, ey pəri,
Kirpiklərin oxuna qaşını kaman derəm.

Bir zərrəcə cəmalını ərz eyləsən mana,
Canü cəhanı mən sana həm tərcüman derəm.

Qəddin qiyamə gəlsə, qiyamət nişanıdır,
Fəttan gözünə fitneyi-axirzəman derəm.

Sorsa, Xətayi, kimdir eşigimdə ol pəri,
Bir binəvayi-xəstədilü natəvan derəm.

***

Yer yox ikən, gög yox ikən ta əzəldən var idim,
Gövhərin yekdanəsindən iləri pərgar idim.

Gövhəri ab eylədim, dutdu cəhanı sərbəsər,
Yeri, gögi, ərşü kürsi yaradan səttar idim.

Gah Hüseynilən bilə pustimi soydu qadilər,
Gah o Mənsur donuna girdim, ənəlhəq dar idim.

Girdim Adəm cisminə, kimsənə bilməz sirrimi,
Mən bu beytullah içində ta əzəldən var idim.

On səkiz min aləmə mən gərdiş ilə gəlmişəm,
Ol səbəbdən həqq ilə sirdar idim, sərdar idim.

Dünyasından mən anın sirrin bilirdim, ol mənim,
Dəryanın altındakı sac qızdıran ənnar idim.

Mən Xətayiyəm, həqi həqq tanımışam, bigüman,
Anın içün ol yaratdı, mən ana dərkar idim.

***

Yüzün görəndə, ey sənəm, Allahə şükr edim,
Sürtüm yüzümni toprağə, dərgahə şükr edim.

Gərçi yüzündən ayrıyam, amma xəyalına
Hicran şəbində gögə baxub mahə şükr edim.

Gər rindəmü məlamətiyü aşiqəm, vəli
Bağrım yaxanda zahidi-gümrahə şükr edim.

Ruzi-əzəldə gördü səni bir nəzər gözüm,
Ömrümcə baxuban o nəzərgahə şükr edim.

Bəndə Xətayi düşmüş idi yardan irağ,
Yetdim çü asitani-şahənşahə, şükr edim.

***

Bu cahan mülkində mən sən yarə möhtac olmuşam,
Hər zaman ol yar ilə didarə möhtac olmuşam.

Bülbüli-məstəm, şəha, bimarü zarəm ruzü şəb,
Arizuyi-gül ğəmindən xarə möhtac olmuşam.

Girmişəm bazari-eşqə, bir xiridar istərəm,
İstəmən sudü ziyan, kirdarə möhtac olmuşam.

Eşq içində valehü sərməstü heyranəm, vəli
Gör necə Mənsur təki mən darə möhtac olmuşam.

Söz içində bu Xətayinin cahan möhtacıdır,
Bir nəfəs səndən, şəha göftarə möhtac olmuşam.

***

Hüsnini mən Yusifi-Kən’anə nisbət qılmışam,
Qılmışam nisbət, vəli şahanə nisbət qılmışam.

Canımı tərh etmişəm yolunda, ey arami-can,
Könlüm içində xəyalın canə nisbət qılmışam.

Dişlərin incu, ləbin mərcandır, ey bəhri-kərəm,
Həlqeyi-dövri-dəhanın kanə nisbət qılmışam.

Ey şəhi-xubani-aləm, bağ içində mən sənin
Boyunu sərvə, saçın reyhanə nisbət qılmışam.

Bu Xətayi bir qulundur asitanında sənin,
Mürvət eylə, mən səni sultanə nisbət qılmışam.

***

Ey həbibim, sən təki ziba camalı sevmişəm,
Əqli kamil, hüsnə bay bir doğru halı sevmişəm.

Sevmişəm bir lalə rüx, bir cadu gözlü dilbəri,
Heqqeyi-mərcan tək ağzı, xəttü xalı sevmişəm.

Yüzü gül-gül, zülfi sünbül, gözləri ceyran kimi,
Qaşları şol yayə bənzər ol hilalı sevmişəm.

Lə'li-meygunun sənin bir məclis içrə dəmbədəm,
Saqinin çəngində ol abi-zülalı sevmişəm.

Xeyli dəmdir kim, Xətayi yarının vəsfin yazar,
Birinə min dürr anın didarı, xalı sevmişəm.

***

Könül verdim, cəfasın bilməz idim,
Bəli dedim, bəlasın bilməz idim.

Ləbinə can dedimsə, tökmə qanım,
Sorub səndən bəhasın bilməz idim.

Vüsalından doyunca almadım kam,
Anın ruzi-cəzasın bilməz idim.

Saçın pürçin dedim, bəndinə düşdüm,
Bu çin sözün xətasın bilməz idim.

Xətayi təl'ətin həqdən dilərdi,
Qəbul olmuş duasın, bilməz idim.

***

Allah, Allah den, ğazilər, ğazilər deyən şah mənəm.
Qarşu gəlün, səcdə qılun, ğazilər deyən şah mənəm.

Uçmaqda tuti quşuyam, ağır ləşgərlər başıyam,
Mən sufilər yoldaşıyam, ğazilər deyən şah mənəm.

Nerdə əkərsən bitərəm, xanda çağırsan, yetərəm,
Sufilər əlin dutaram, ğazilər deyən şah mənəm.

Mənsur ilə darda idim, Xəlil ilə narda idim,
Musa ilə Turda idim, ğazilər deyən şah mənəm.

Əsir edin, bəri gəlün, novruz edin, şaha yetün,
Hey ğazilər, səcdə qılun, ğazilər deyən şah mənəm.

Qırmızı taclu, boz atlu, ağır bir ləşkər nisbətlü
Yusif peyğəmbər sifətlü, ğazilər deyən şah mənəm.

Xətayiyəm al atluyam, sözü şəkərdən datluyam,
Murtəza Əli zatluyam, ğazilər deyən şah mənəm.

***

Xəyalımdır mənim, ya duşdə gördüm?
Behəmdullah, cəmalın üştə gördüm.

Sözün hər biri gövhər olduğiçün
Asılmışdır həmişə guşdə gördüm.

Necə ki, bilicisən, əbsəm olgil,
Səadət olmağı xamuşdə gördüm.

Bəlasından bu eşqinin sağıngil,
Yüküş aşiqləri sərgəştə gördüm.

Sənin ol zülfinin hər bir qılını
Xətayi boynuna bir riştə gördüm.

***

Bu gün mən bir büti-məhparə gördüm,
Əlindən yürəgim səd parə gördüm.

Məni səndən sorar olsa səba, de:
– Zəifü xəstəvü avarə gördüm.

Qara zülfin görəndə, ey həbibim,
Könül meyl eylədi zünnarə gördüm.

Çəməndə gəşt edər gördüm həbibi,
Tərəhhüm qılmadı, yalvarə gördüm.

Necə miskin Xətayi qanın içmiş,
Şol iki nərgisi-xunxarə gördüm.

***

Avlaxda bu gün avlar ikən yarə yoluxdum,
Bir aydan arı gün kimi didarə yoluxdum.

Biçarə könül güzgüsü açıldı səfadən,
Hey-hey, nə əcəb ahuyi-tatarə yoluxdum.

Dün varmış idim bağçaya gül dərməgə, amma
Sundum əlimi bir gülə, səd xarə yoluxdum.

Çox mehrü vəfa umar idim yardən, amma
Bir cövri yüküş yari-cəfakarə yoluxdum.

Şah eşiginə səcdə qılıbdır bu Xətayi,
Bəhri-Nəcəfə irdim, şəhvarə yoluxdum.

***

Dilbəra, dərdi-fəraqın qoymadı cismimdə can,
Anca axdı qanlu yaşım, qalmadı bağrımda qan.

Ta səri-zülfin sənin yüz üstə gördüm, ey pəri,
Sən məni sevdayə saldın, ey məhi-namehriban.

Kim sənin yüzündürür xurşidi-xavər nisbəti,
Qaşlarınlən gözlərindir fitneyi-axirzəman.

Dün demişsən kim, sana göstərübən can alam,
Yüzüni göstərmədin aldın rəvanımdan rəvan.

Rumi ruyində Xətayi ta görübdür ruyi-həqq,
Cümleyi-aləm gözündə ruyi-həqqindir nişan.

***

Könlüm istər vəslin, ey sevgi canan, yenlədən,
Abi-lə'lindən qılam bu dərdə dərman yenlədən.

Yüzünə şeytan kimi ta qılmadı zahid sücud,
Mütləqa kafərdir ol, gətürsün iman yenlədən.

Eşq gəldi könlümə, hökm etdi canım mülkinə,
Şükr kim, öz təxtinə uş gəldi sultan yenlədən.

Gəl vəfa rəsmin aradan sən götürmə, mən dəxi
Qılalı bir sidq ilən bir əhdü peyman yenlədən.

Zülf ilən xəttü ləbini kim ki, gördü söylədi:
– Xızr ilən zülmatə girmiş abi-heyvan yenlədən.

Mah rüxsarın görüb iqrarə gəldi müddəi,
Çün zühur oldu yüzündən nuri-rəhman yenlədən.

Qapuna gəldi gəda tək bu Xətayi xəstədil,
Sən ana qıl, ey sənəm, bir lütfi ehsan yenlədən.

***

Səndən özgə, dəlbəra, heç kim mana yar olmasun.
Cövri-eşqindən mənim tək kimsə bimar olmasun.

Kafərin rəhmi gəlür mən dərdməndin halinə,
Leyk kafər sən təki yari-sitəmkar olmasun.

İstəməz bu xəstə könlüm özgələrinin minnətin,
Canıma vəslindən özgə nəstə ğəmxar olmasun.

Gərçi bülbüllər qamu gülzar istər zar-zar,
Səndən özgə könlümə aləmdə gülzar olmasun.

Bu Xətayi xəstəni divanə zahid məst oxur,
Eşqiniz canımda ol bir ləhzə hüşyar olmasun.

***

Dilbəra, gözdən cəmalın bir nəfəs dur olmasun,
Yaşlu çeşmimdə yüzündən ayru heç nur olmasun.

Ta ki, eşqinlən sənin mə’mur olubdur dil evi,
Eşqin ol viranədən bir ləhzə mə’zur olmasun.

Əbri-neysan ta cəmalın gülşəninə su verür,
Qətreyi-yaşimdən özgə anda yağmur olmasun.

Ta ki, səndən ayru düşdüm, görmədim səbrü qərar,
Hiç aşiq dilbərindən zarü məhcur olmasun.

Ta səni sevdi Xətayi, oldu dastan aləmə,
Kimsənə anın təki eşqində məşhur olmasun.

***

Aşiqi-dilxəstə gör dildarə döndərmiş yüzin,
Aləmi tərh eyləmiş, sən yerə döndərmiş yüzin.

Haşalillah kim, könül yüzin qapundan döndərə,
Bülbüli-biçarədir, gülzarə döndərmiş yüzin.

Döndərib zahid yüzin divarə hər dəm yaş tökər,
Aşiqin divari yox, didarə döndərmiş yüzin.

Yarə döndərmiş yüzin görgəc rəqibə söylədim:
– Ol güli-xəndani gör kim, xarə döndərmiş yüzin.

Dünyada məqsudinə hər kimsə yüzin döndərər,
Bu Xətayi sən büti-əyyarə döndərmiş yüzin.

***

Cəmalın görəli can buldum, ey can,
Yüzini nuri-iman buldum, ey can.

Yüzün dərdində gərçi xəstə idim,
Vüsalın dərdə dərman buldum, ey can.

Sənin mehri-cəmalın, şükr lillah,
Könül təxtində sultan buldum, ey can.

Behəmdillah ki, hicran zülmətində
Ləbini abi-heyvan buldum, ey can.

Xətayiyəm, ayağın toprağında
Bu gün mülki-Süleyman buldum, ey can.

***

Səndən özgə yarım olsa, ey pərivəş simtən
Asitanın çövrəsində qoy ki, xak olsun bədən.

Ol rəqiblər tə’nəsindən ehtirazın ta nədir?
Bəndəyə hiç iltifatın yoxdurur, yarəb, nədən?

Ol yüzi gül, zülfi sünbül, qaməti sərvi-rəvan
Ruzü şəb dutmuşdurur çeşmim kənarında vətən.

Sorsam ol şirin dodağın püstəmidir, ya nəbat,
Yarəb, ol nazik vücudun ya səmindir, ya səmən?

Çini-zülfində Xətayi ta dutubdur məskənin,
Yarəb, ol gülgün yanağın gülmidir, ya nəstərən?

***

Uş yenə güllər açıldı, xarə söylən gəlməsün.
Söhbəti-xasdır bu gün, əğyarə, söylən, gəlməsün.

Gəlməsün meyxanəyə vəhdətdə qoyma müddəi,
Abi-kövsərdən içən xümmarə, söylən, gəlməsün.

Bir həpəmdir bu ki, iqrar əhlidir məhrəm ana,
Munda naməhrəm düşər inkarə, söylən, gəlməsün.

Eyşü işrət dəmidir, eşq əhlinə edin səlah,
Yüzi çirkin, xuyi bədkirdarə, söylən, gəlməsün.

Çünki sərrafüz, bu bazar içrə gövhər görməniz,
Almazız hər möhrədən, bazarə söylən gəlməsün.

Sərxoşuz, ruzi-əzəl peymanə şahdan içmişüz,
Bu qədəhdən içməyən hüşyarə söylən gəlməsün.

Çün Xətayidir bu gün gülzari-vəhdət bülbüli,
Dəxi ol zaği-siyəh gülzarə söylən gəlməsün.

***

Candurur cismimdə eşqin, canım əldən getməsün,
Can gedərsə, ğəm degil, cananım əldən getməsün.

Zülfini rüxsarın üstə salma, cana tanriçün,
Küfr imanım dutub, imanım əldən getməsün.

Xəttü xalın dutmuş ol lə'lin kənarında məqam,
Eylə qıl kim, çeşmeyi-heyvanım əldən getməsün.

Ta ki, eşqin dutdi bu könlüm evində məskənin,
Üns dutmuşam ana, mehmanım əldən getməsün.

Bu cəhanda getsə, getsin mülkü malü təxtü rəxt,
Ey Xətayi, ğəm yemə, sübhanım əldən getməsün.

***

Mən sana daim çü yarəm, sən mana əğyarsən,
Məndən özgə cümleyi-üşşaqə sən dildarsən.

Görəyim, Allah səni badi-fənadən saxlasun
Kim, cəhan bağında sən bir sərvi-xoş rəftarsən.

Çünki ol mahin cəmalın istəməzdin görməgə,
Hər gecə, çeşmim, nədən kövkəb kimi bidarsən?

Ey pəri, çünkim təbibi-dərdi-eşq olmuş ləbin,
Bəs nədəndir sən həmişə gözləri bimarsən?

Bu Xətayi saçların çinində çin-çin bağludur,
Olmanam çindən pərişan çün mana ğəmxarsən.

***

Ey ki, heyrandır könül sən dilbəri-dildar içün,
Qamətin sərvi-rəvandır, rüxlərin gülzar içün.

Ey təbibi-əhli-ürfan, bir dəva qıl dərdimə,
Xəstə hal oldu könül sən gözləri bimar içün.

Zahida, çox tə'nə qılma məzhəbi-aşiqlərə,
Sən çü divar əhlisən, mən aşiqəm didar içün.

Ey könül, ol dilrübanın möhnətindən incimə,
Kimsə kim, gül istər, ol qayramaz ola xar içün.

Bu Xətayinin kəlamın qıl qəbul, ey görkə bay,
Zikridir hər dəm dua sən hüsni-bərxurdar içün.

***

Surətin gördüm, nigara, məstü heyranəm bu gün,
Ol qara zülfün təki ğəmdən pərişanəm bu gün.

Dünyada hər kim ki, yüzün gördü, aləm şahıdır,
Ta yüzüni görmüşəm, mən dəxi sultanəm bu gün.

Sən məni qulluğa məqbul eyləgil, ya eyləmə,
Asitanında sənin, ey şah, dərbanəm bu gün.

Asitanın itlərindən ta ki, bulmuşam şərəf,
Ey pəri, eşqində mən mehr ilə səgbanəm bu gün.

Der Xətayi: – Ta əzəldən qulluğa xət vermişəm,
Hər nə kim, hökm eyləsən, əmrində fərmanəm bu gün.

***

Ey ki, çox düşdüm fəraqindən fəğanü vayə mən,
Eşqi-zülfindən müdami düşmüşəm sevdayə mən.

Ta sənin gülgün yanağın görmüşəm, ey məhliqa,
Gülşən içrə baxmazam hərgiz güli-həmrayə mən.

Hüsni-ruyindən kim, ol xurşidi-aləm nur alur,
Heyf ola nisbət qılam mehri-rüxini ayə mən.

Bağ ilən bustan içində sərvə qılman iltifat,
Ta ki, qıldım bir nəzər şol qamətü balayə mən.

Ta könül oldu sənin ruzi-vüsalindən cüda,
Bu Xətayi dilşikəstə eşq ilən həmsayə mən.

***

Görmək istər yüzini eşq ilə can şimdidən.
Ey aəri, vəsl ilə qılgil dərdə dərman şimdidən.

Zahidi-gümrahə güstər yüzin, ey nuri-ilah,
Ta kim, ol kafər gətürsün həqqə iman şimdidən.

Ğəmdə zülfin tək pərişan oldu ol nikbət rəqib,
Yüz səadət bəndəyə görsətdi dövran şimdidən.

Tifl ikən dilbər dilər kim, rəf’ edə yüzdən niqab,
Zərrəni gör kim, olur xurşidi-taban şimdidən.

Ey Xətayi, fikri-bikrin eylədin əş’arə sərf,
Dutdu ürfan məclisin dəftərlə divan şimdidən.

***

Hər gələn dünya mənim der, sən qədim bünyadsən,
Cümlənin könlün alıbsan, nə əcəb səyyadsən.

Hər kəsə bir yüz ilə verdin muradın dünyada,
Xızr olan buldu həyatı, bildi kim, zülmatsən.

Hər kiminlən oynadın, çəkdin, çevirdin çərxini,
Hiç arif nəqşini duymaz, əcəb nərradsən.

Dünyanın malıvü mülki, gəncinə aldanma kim,
Əvvəli zərqü nişatdır, axiri şəhmatsən.

Ey Xətayi, sən cəhanın cövrünə şad ol müdam,
Çünki sevgin dust iləndür, eşq ilə ustadsən.

***

Yüzündür sureyi-Yusif, dodağın abi-kövsərdən,
Boyun tubadurur, amma, saçındır sünbüli-tərdən.

Cəmalın “hazihi cənnət” dedi həq “fədxülü fiha”,
Təala şanəhu əkbər, yanağın vərdi-əhmərdən.

Üzarın yüzüdür Yasin, anın şə’nindədir Əlhəmd,
Ləbin yaquti-əhmərdir, dişin lö’löi-gövhərdən.

Qaşındır qabi-qövseyni, saçın zilli-ilahidir,
Ziyad olmuşdurur, cana, cəmalın şəm’i-xavərdən.

Yüzüni sureyi-Ən’am oxudum qüdrətüllahdan,
Xətayi bolmadı bir dəm xilas Allahü əkbərdən.

***

Müşkin saçına ta ki, mələk çaldı şanəsin,
Səd parə qıldı can quşunun aşiyanəsin.

Lə’linə can baha dedi, verdim rəvan ona,
Ol bivəfayi gör ki, gedərməz bəhanəsin.

Eşqin ki, gəldi mehr ilə şəhri-vücudimə,
Mehmandır ol ki, canü könül dutdu xanəsin.

Anca ki, göz yaşın tökərəm, bolmazam xilas,
Eşqin könüldə yığdı tükənməz xəzanəsin.

Ta kim, Xətayi gördi anın çeşmi-məstini,
Heyrandurur ki, gözədə bilməz zəmanəsin.

***

Gəl ki, dərdi-bidəva dərmanə gəlsün yenlədən,
Tən Məsiha ləblərindən canə gəlsün yenlədən.

Zülməti-zülfində kamin tapmadım, hökm eylə kim,
Ta sekəndər çeşmeyi-heyvanə gəlsün yenlədən.

Çün rəqib əmrinə taət qılmadı, mərdud qıl,
Tuği-lə'nət ta kim, ol şeytanə gəlsün yenlədən.

Eşigin qulluğuna gəlsün səlatinlər qamu,
Qul təkəbbür qılmasın, sultanə gəlsün yenlədən.

Etdim: – Ey dilbər, demişdin göstərəm şəm'i-rüxim.
Der: – Qəbul etmən anı, pərvanə gəlsün yenlədən.

Xeyli dəmdir kim, Xətayi gözləri qan ağladı,
Seyli-xunin bir dəxi ümmanə gəlsün yenlədən.

***

Ulu kim, laf edər meydanə gəlsün,
Müxənnət gəlməsün, mərdanə gəlsün.

Ərəmlər mənzili həq mənzilidir,
Ərənlər sahibi-ürfanə gəlsün.

Cuş etdi zülfiqarım, qında durmaz,
Kim inkar əhlidir imanə gəlsün.

Əzəldən həq deyən əhli-təriqət,
O kandan sürülüb bu kanə gəlsün.

Aralıxdan küdurətlər ərindi,
Sürüldü lə'nət ol şeytanə gəlsün.

Günəhkarın günahından keçərlər,
Yüz üstə sürülüb sultanə gəlsün.

Axan çaylar, axan arxlar, bulaqlar,
Yerindən mövc urub ümmanə gəlsün.

Rəvayətdir hədisi-Mustafadan,
Min il ölüb yatanlar canə gəlsün.

Xətayi xəstədir, kani-səxavət,
Xəbər ver dərdlülər dərmanə gəlsün.

***

Ey məni hicran əlində zarü giryan eyləyən,
Çeşmimi giryan edüb sinəmni büryan eyləyən.

Gərçi bu dərdə məni saldın, əya arami-can,
Həm yenə dərdindürür bu dərdə dərman eyləyən.

Gərçi eyd oldu cəmalın xəlqə, ey əbru hilal,
Bəndəyəm ol eyd içün, canımnı qurban eyləyən.

Gərçi ğəmzən tiğ olubdur xeyli-üşşaqə, vəli
Çeşmi-xunxarındurur həm dəmbədəm qan eyləyən.

Eşqinin sərbazları çoxdur, vəli yoxdur dəxi
Bu Xətayi xəstə tək ahəngi, meydan eyləyən.

***

Bu gün gəldim cəhanə, sərvərəm mən,
Yəqin bilin ki, nəqdi-heydərəm mən.

Firidun, Xosrovü Cəmşidü Zöhhak
Ki, Rüstəm Zaləmü Iskəndərəm mən.

Ənəlhəqq sirri uş könlümdə gizlü
Ki, həqqi-mütləqəm, həq söylərəm mən.

Nişanımdır mənim taci-səadət,
Süleyman əlinə əngüştərəm mən.

Məhəmməd nuridən, Əli sirindən
Həqiqət bəhri içrə gövhərəm mən.

Xətayiyəm, şəha, əksüklü quləm,
Qapında bir kəminə kəmtərəm mən.

***

Çün sənin tək yar buldum, özgə mən yar istəmən.
Səndən ayru cümleyi-aləmdə mən var istəmən.

İstərəm ki, mən çəkim dərdü fəraqin zəhmətin,
Məndə özgə eşqinizdə kimsə bimar istəmən.

İstərəm kuyində avaz etməyə nakəs rəqib,
Öz ünümdən özgə anda naleyi-zar istəmən.

Dün demişsən istərəm bir busəyə yüz can baha,
Ol mətaə məndən özgə heç xiridar istəmən.

Ol səbəbdən bu Xətayinin sözü həqqanidir,
Həqdən özgə dünyada mən yarü ğəmxar istəmən.

***

Gəl ki, cana, səndən özgə təndə mən can istəmən,
Ta ki, sən varsan mənim yanımda, canan istəmən.

Gər əlac eylər mana aləm təbibi sərbəsər,
Şərbəti-lə’lindən özgə dərdə dərman istəmən.

Görəli hüsnin gülünü olmuşam çün əndəlib,
Bağçalarda səndən ayru vərdi-xəndan istəmən.

Ta əzəl gündən sənin eşqinə iqrar etmişəm,
Səndən özgə yar ilən mən əhdü peyman istəmən.

Eylə sanma kim, Xətayi mehri-ruyin tərk edə,
Var ikən dildə xəyalın özgə mehman istəmən.

***

Dün dedim: – Tərk et yolunda, təndə candır sən deyən,
Leyk bu cismim içində laməkandır sən deyən.

Yarə sordum ki, dəhanın ğönçədir, ya zərrədir?
Yar eydir: – Mən dəxi bilmən, binişandır sən deyən.

Mən dedim: – Gördüm şəbistan pərdədən ol çöhrəni,
Yar eydir: – Yarın degildir, binişandır sən deyən.[1]

Mən dedim: – Mənzərdə gördüm pür cəmalın hər gecə.
Yar eydir: – Təkdürür ol, mah-asimandır sən deyən.[2]

Bu Xətayi dedi kim, yüzündə gördü həq yüzün,
Der: – Xəyalındır sənin, gözdən nihandır sən deyən.

***

Ey xublar içrə təl'əti hüsn ilə bay olan,
Ol sərv qəddi sayəsi zilli-hümay olan.

Canlar şikarın etməyə səyyad gözləri,
Kirpigü ox, qaşları peyvəstə yay olan.

Bağı-rüxin suvarmaq içün bağiban kimi
Hər bir yanayə qanlu yaşım dürlü çay olan.

Ah-vay ki, kamü vayəmi verməz, tükəndi ömr,
Eşqində gecə-gündüz işim ah-vay olan.

Qılsan bu xaki-payinə bir gəz nəzər nola,
Salmazmı xakə yüzüni xurşidü ay olan?

Vəslin nəvasın istəsə canım, əcəb degil,
Möhtac olur həmişə pəniyə gəday olan.

Aldın şikəstə könlünü miskin Xətayinin,
Çindir vəfalu bolmağı xubi-Xətay olan.

---

[1] Burada, ikinci beytdəki qafiyə təkrar edilmişdir, "binişandır" yerinə "gülüstandır"yazılsa, məna və qafiyə düzələr.

[2] Burada, ikinci beytdəki qafiyə təkrar edilmişdir, "binişandır" yerinə "gülüstandır"yazılsa, məna və qafiyə düzələr

***

Firqətin çəkdim, nigara, şimdi yar olmazmısan?
İxtiyarım getdi əldən, ixtiyar olmazmısan?

İntizarım həddən ötdü, hicr ilə oldum həlak,
Ğəmli könlüm halına bir ğəmgüsar olmazmısan?

Düşməni-dəmsərd əlindən bülbüli-can oldu lal,
Vəqtidir gül çöhrən açub novbahar olmazmısan?

Munca möhnət çəkdin, ey dil, zülməti-hicran ilə,
Ol məhin vəslinə yetdin, bəxtiyar olmazmısan?

Gər günahın çox isə miskin Xətayi, ğəm yemə,
Rəhmətinə xaliqin ümmidvar olmazmısan?

***

Qızılgül bağü bustanım, nə dersən?
Fəda olsun sana canım, nə dersən?

Qərarü səbrü aramım tükəndi,
Kəsildi külli fərmanım, nə dersən?

Əridi iligim, qaldı sümügüm,
Bu təni tərk edər canım, nə dersən?

Xamu dərdlülərə dərman bulundu,
Dəvasız dərdə dərmanım, nə dersən?

Xamunun küfr ilə imanı vardır,
Mənim küfr ilə imanım, nə dersən?

Sənin məqsudin oldur kim, mən ölüm,
Halal olsun sana qanım, nə dersən?

Əgər yatsam min il toprağ içində,
Dürüstdür əhdü peymanım, nə dersən?

Xətayi çün səni can ilə sevdi,
Sevən ölsünmi, sultanım, nə dersən?!

***

Çıxmaz, ey dilbər, sənin xeyli-xəyalın yaddən,
Könlümün şəhrini yıxdı eşqiniz bünyaddən.

Ta ki, düşdüm, ey pəri peykər, fəraqın dərdinə,
Dutdu avazım cahanı ah ilə fəryaddən.

Anca kim, dünya yüzündə xəstə canım təndədir,
Çıxmaya dərdi-fəraqin bu xərababaddən.

Ta ki, çeşmim qarşusundan ayru düşdün, ey sənəm,
Çıxmaya hərgiz xəyalın xatiri-naşaddən.

Bu Xətayi sözünə dəq dutma, ey nakəs həsud,
Ta əzəl tə'lim alıbdır bu həkim üstaddən.

***

Qulunam bəndə, şahın könlü bilsün,
Bu könlüm səndə, şahın könlü bilsün.

Şəhi görəndə şad olur, sevinir
Bu canım təndə, şahın könlü bilsün.

Hezaran dürlü-dürlü səndən ötrü
Ki, vardır məndə, şahın könlü bilsün.

Cahan xublarının içində gördüm
Səni tərvəndə, şahın könlü bilsün.

Necə miskin Xətayi kimi könlü
Alur bir xəndə, şahın könlü bilsün.

***

Vücudum şəhrində buldum dürr ilən dürdanə mən,
Mən ani ərz etmənəm hər cahilü nadanə mən.

Küfrü iman sirrini bildim ki, mə’nidə nədir,
Yüzümü döndərmişəm andan bərü rəhmanə mən.

Gör necə zari verür ol lə’nəti şeytan mana,
Dünü gün lə’nət oxurmən lə’nəti-şeytanə mən.

Versə idi kamimi ol şahü sultanım mənim,
Canımı qurban qılayım ol şəhü sultanə mən.

Mən Xətayi çəkmənəm ğəm, çünki ənəlhəq dedim,
Çəkmişəm Heydər təki meydanda hu mərdanə mən.

***

Behəmdullah, səfa bulduq cəmali-novbaharindən,
Könül mir’ati jəng olmaz anın xətti-qübarindən.

Görüb kuyində dildarın rəqibi çəkmə ğəm hərgiz,
Məsəldir güldərənlər ağlamaz gülşəndə xarindən.

Köçüb hər masəvadən talibi-didar olan aşiq
Əlin çəkmək gərək, ey dil, cəhanın cümlə varindən.

Xəyali-yar ilə qane olub meyli-vüsal etmə,
Şikayət eyləməz sadiq olanlar ruzigarindən.

Xətayi ölməgə can verməyüb meydani-eşq içrə,

***

Sübhdəm gülzar içində çaldı bülbül ərğənun,
Əyyuhəl-üşşaq, qumu innəküm layəsməun.

Ərğəvan dutmuş piyalə, nəstərən doldurdu can,
Mütriba, çal nəğməni, “la əyyiküm müstəğfirun”.

Hüsni-ruyin hər görəndə afərin təslim edər,
Labeşey’in əhsənün innə qəlilən təşkürun.

Gözlərin sərxoş olanda badələr ilən müdam
Ziri-ləb saqi deyər hər dəm vəlahüm yəhzənun.

Şah Xətayi dost yolunda təslim edər canını,
Hər olana sən görürsən “innə əleyhə raceun”.

***

Dilbəra, gördüm yüzün, heyranəm ol dəmdən bərü,
Göz yaşında qan ilən ğəltanəm ol dəmdən bərü.

Ta ayağın toprağından mən səadət bulmuşam,
Eşigində ruzü şəb dərbanəm ol dəmdən bərü.

Zərrə idim, gün yüzün mehrinə düşdüm nagəhan,
Aləm içrə şöhreyi-dövranəm ol dəmdən bərü.

Ta sənin ruzi-əzəldən eşqinə dedim bəli,
Əhdi pozman bər səri-peymanəm ol dəmdən bərü.

Ta sənin ahu gözün gördü Xətayi, ey pəri,
Məcnunam, viranələrdir xanəm ol dəmdən bərü.

***

Nigara, neyləyim mən səndən ayru?!
Bu könlüm xali olmaz ğəmdən ayru.

Vüsalın həsrətindən, ey dilaram,
Gözümdə nəstə gəzməz nəmdən ayru.

Quşum pərvaz edər hər dəm qəfəsdən,
Qərar etməz məgər vəslindən ayru.

Ki, səndən ayru heç yoxdur həyatım,
Qərar edər neçün can təndən ayru?

Xətayi gül yüzün heyranı bolmuş,
Xaçan bülbül durar gülşəndən ayru?

***

Yüzün gördüm sənin, ey yari-məhru,
Könüllər afəti, ya yüzmidir bu?

Dodağın həsrətindən xəstə haləm,
Axıtdı gözlərim yaşın behər su.

Həbəşdir kim, müsafir Rumə düşmüş
Yüzün səfhindəki ol xali-hindu.

Gözündən ahu tək dağlarə düşdüm,
Nə sehr etdi mana ol iki cadu?

Xətayi der yüzün xurşidə nisbət,
Sözü rövşən dedim yüzünə qarşu.

***

Kim ola göndərəm mən yerə qarşu
Ki, artır həsrət ilə yarə qarşu.

Qərarım qalmadı, səbr etdü həddən,
Dü çeşmim nərgisi-bimarə qarşu.

Gər uymaz gözlərim hicrin ğəmindən,
Nola ah eyləsəm bidarə qarşu.

Ki, sənisz olmuşam bülbüli-şeyda,
Nola fəryad edəm gülzarə qarşu.

Yüzündə zülfini gördüm, dedim ki,
İmani bağlama zünnarə qarşu.

Asıldım ənkəbut tək, ey dilaram,
Müənbər türreyi-tərrarə qarşu.

Mənimçündür əgər qılsan bəşarət,
Həmişə ğönçə, nar əğyarə qarşu.

Xətayi xəstədir, istər vüsalın,
Dəmadəm qıl nəzər bimarə qarşu.

***

Yüzüm sürüb varuram yarə qarşu,
Həbibü munisü dildarə qarşu.

Fəraqçin gözlərin könlüm apardı,
İki heyva bitibdir narə qarşu.

Boyun sərv ağacı bostan içində,
Qızılgüllər açılmış xarə qarşu.

Rəqibi görəyim nabina olsun,
Otursun ol müdam divarə qarşu.

Ləbindən şərbət içdi bu Xətayi,
Müdam sərməst gəzər didarə qarşu.

***

Qılur ğəmzən cəfalər dürlü-dürlü,
Verür lə'lin səfalər dürlü-dürlü.

Eşigində sənin hər gecə, ey şah,
Sürür yüz min səfalər dürlü-dürlü.

Asılmış zülfinin hər bir muyunda
Mənim tək mübtəlalər dürlü-dürlü.

Rəqiblər çəkdigim cəfalər içün
Qılurmən bəd dualər dürlü-dürlü.

Xərabə könlümün içində eşqin
Dutubdur çox binalər dürlü-dürlü.

Xətayi eşigində kəmtərindür,
Umar səndən ətalər dürlü-dürlü.

***

Canım tükəndi, həsrəti-cananəyəm yenə,
Şəm'i-rüxinə eşq ilə pərvanəyəm yenə.

Zahirdə gərçi dərdi-fəraq oldu həmdəmim,
Batin yüzində yar ilə həmxanəyəm yenə.

Dünya yüzündə eşq ilə zarəm, ey sənəm,
Bir söyləgil ki, üqbarə cananəyəm yenə.

Daim könül quşu ki, düşər dami-zülfinə,
Başdan-ayağa yaralu çün şanəyəm yenə.

Ta kim, Xətayi ahu tək düşdü bəndinə,
Səhradə dərdi-eşq ilə divanəyəm yenə.

***

Gül yüzün kim, düşmüş ol zülfi-pərişan üstünə
Bir bulutdur kim, düşübdür mahi-taban üstünə.

Arizin üstə düşübdür qətrə-qətrə ol ərəq,
Sanasan şəbnəmdürür, düşmüş gülüstan üstünə.

Zülf çin olmuşdurur, hər dəm düşər şol arizə,
Zülməti-dövrani gör kim, düşmüş iman üstünə.

Şol rəqibi-divi gör kim, kuyinə hökm eyləmiş,
Şoylə kim, qəsd eylər ol mülki-Süleyman üstünə.

Bu Xətayi yüzün üstə zülfini görgəc dedi:
– Zülməti görün, düşübdür abi-heyvan üstünə.

***

Gərçi hicrindən zəifü natəvan oldum yenə,
Pir ikən yüzünü gördüm, novcavan oldum yenə.

Dövri-hüsnindən günəş tək olmuş idim aşikar,
Hicr səhrasinə düşdüm, binişan oldum yenə.

Aqil idim dünyada Leyli cəmalın görmədən,
Eşq ilən Məcnun təki bixaniman oldum yenə.

Ta ki, asibi-fələkdən görməyə hüsnin zəval,
Eşigində gecə-gündüz pasiban oldum yenə.

Bu Xətayinin dilində eşqiniz pünhan ikən
Cümleyi-aləm dilində dastan oldum yenə.

***

Daneyi-xali-siyəh kim, düşdü rüxsar üstünə,
Lalyei-pür dağdir kim, düşdü gülzar üstünə.

Həlqələnmiş zülfiniz rüxsarın üstə, ey sənəm,
Gəncə bənzər kim, anın yatmışdurur mar üstünə.

Ta ki, zahid gördü yüzün, qılmadı bir gəz nigah,
Kafəri-mütləqdir ol kim, gəlməz iqrar üstünə.

Sanasın kim, çeşmeyi-heyvanın üstə gəldi Xızr,
Düşdü ta xəttin sənin lə'li-şəkərbar üstünə.

Ta ki, vəslin oldu vasil bu Xətayi xəstəyə,
Bir təbibə bənzər ol kim, gəldi bimar üstünə.

***

Mövsimi qış getdi, dövri novbahar oldu yenə,
Məclisi-gəştə əcaib ruzigar oldu yenə.

Saqiya, vəqti-tərəbdir, əldə dutgil cami mey.
Kim, bənövşə məst olub nərgiz xumar oldu yenə.

Mövsimi-gül gəldivü gülşən bəzəndi bəzm içün,
Bağü səhra cümlə yeksər laləzar oldu yenə.

Gəldi novruzü bəharü əhdü dövri-dustkam,
Yar əli tək yer yüzü nəqşi-nigar oldu yenə.

Əbri-neysan cuşə gəldi, tökdü rəhmət yağmurun,
Gög yüzündən yer yüzünə dür nisar oldu yenə.

Bağçaya seyranə çıxdı gəşt içün ol gülstan,
Gül xəcalətdən qızardı, şərmsar oldu yenə.

Qamətinlən bəhs edirdi daima ol sərvi-bağ,
Gör xəcalətdən ona mənzil kənar oldu yenə.

Gül yüzüni görəli artdı fəğanı quşların,
Lal ikən bülbüllərin sövti həzar oldu yenə.

Ey Xətayi, şad olub beytül-həzəndən çıx bu gün,
Bağü bağça suyinə vəqti-güzar oldu yenə.

***

Dərdi-eşqin, dilbəra, çün gəldi bu can üstünə,
Sanasan kim, Xızr gəldi abi-heyvan üstünə.

Bu cahan bağını bünyad etdi dəsti-ləmyəzəl,
Mən təki bir gül xaçan bitdi gülüstan üstünə.

Rahəti-vəslin dilərdim, gəldi hicran zəhməti,
Ey pəri, neyçün qoyursan dərdi dərman üstünə?

Sərvəri-hindudur ol kim, gəldi Rum iqliminə,
Ol siyəh xalın ki, düşmüş ruyi-xəndan üstünə.

Çün cəmalın mehri düşdü bu Xətayi könlünə,
Sanasan Yusifdir ol kim, gəldi Kən’an üstünə.

***

Ta yüzün üstündə zülfin sayə salmışdır yenə,
Arizin rəngi güli-həmrayə salmışdır yenə.

Eşqi-ruyindən könül istər xilas olmağ, vəli
Canimi zülfün siyəh sevdayə salmışdır yenə.

Çeşminə heyran olandan bərlü könlüm, ey pəri,
Ahu nisbət əqlimi səhrayə salmışdır yenə.

Şadəm andan bərlü kim, hicrində olmuşmən müqim,
Yüz məlamət bu dili-şeydayə salmışdır yenə.

Bu Xətayi canını qurban edər ol mahə kim,
Pərtövi-mehri-cəmalın ayə salmışdır yenə.

***

Yar, eşqin bağrımın ta çəkdi yüz dağ üstünə,
Atəşi-hicrin bu dağın çəkdi bir dağ üstünə.

Mən zəif, üştə fəraqın yüklədi bir dağ kimi,
Ol yükə qılmaz təhəmmül, qoysalar dağ üstünə.

Yüzün üstəz ülfüni gördükcə müshəfdir derəm,
Bu nə hikmətdir ki, yazılmış qara ağ üstünə?

Şol xətü xalın kənarında rüxün, ey dilrüba,
Ol gülə bənzər ki, düşmüş tazə yaprağ üstünə.

Bu Xətayi çeşmi yolunda anın toprağ olur,
Ta ayağın basa ol dilbər bu toprağ üstünə.

***

Xəyalın məskənidir can içində,
Yenə Yusif nedir zindan içində?

Gözüm içində ol əksi-cəmalın
Göhər nisbətlüdür ümman içində.

Yüzün səhmindən ol şəkkər dodağın,
Gülüstandır, güli-xəndan içində.

Rəqibi qoymagil qapunda, neylər
Bu kafər cənnəti-rizvan içində?

Xətayi görməmişdir qamətin tək
Xuraman sərv heç bustan içində.

***

Aydım qaşına: – Işvə qıl. Aydır ki, göz üstə.
Baxdım ki, görüm ol gözü, dedi ki, yüz üstə.

Bir tari-muyindir kəmərin altda miyanın,
Naziklik ilə kim deyə bir söz bu söz üstə.

Ey dil, yüzüni xak edə gör yar eşigində,
Ta daməni-dilbərdən anın düşə toz üstə.

Meyxanə ləbin istədi ta nəqlü kəbabi,
Eşq odunu yaxıb cigərim saldı köz üstə.

Yar etdi mana: – Aşiq isən xəstə Xətayi,
Bu cövrü cəfa kim, qıluram, şimdi döz üstə.

***

Könlümi çəkdi, şəha, daği-ğəmin dağ üstünə,
Yenə ol mahin fəraqi çəkdi bir dağ üstünə.

Zülfü ruyin xətti tək heç kimsə dəftər yazmamış,
Ta ki, aləmdə yazılmışdır qara ağ üstünə.

Gərçi güllər çox bitər aləm gülüstanında, leyk
Gül yüzün tək bitməmiş heç gülşənü bağ üstünə.

Ağ yüzünün üstən ol zülfi-siyahini götür,
Bilməzəm həmra gülün neyçün qonar zağ üstünə?

Bu Xətayi xəstədil hər dəm ümidi-vəsl içün
Döşəmişdir yüzüni qapunda toprağ üstünə.

***

Ey yüzün güldür, ləbin çün ğönçə xəndandır yenə,
Buyi-muyin aşiqə küfr ilə imandır yenə.

Anca əfğan etdim, ey dürri-məlahət, sənsizin,
Çeşmeyi-çeşmimdən axan bəhri-ümmandır yenə.

Ta ğəmi-hicran ilə düşdüm vüsalından irağ,
Ğəmlü könlüm hicr ilə çün beytül-əhzandır yenə.

Yüzüni zahid nədən səb'ül-məsanidir deməz,
Səfhəsində yazulu həm nuri-Qur'andır yenə.

Şol pərişan zülfüni ta görmüşəm, ey ruhi-qüds,
Dərdü həsrətdən mənim könlüm pərişandır yenə.

Onca çəkdüm firqətin xarini, ey gülyüzlü yar,
Yürəgimdür ğönçə nisbət, dopdolu qandır yenə.

Dün demişdin: – Məndən özgə yarə vermişsən könül.
Mən Xətayi xəstə halə bu nə böhtandır yenə?

***

Yarə yar olmaq dilərsən, qeyri sən yar istəmə.
Canü dildən keçməmişsən, yeri, dildar istəmə.

Varü varlıq varmayınca şahə varmaz varımız,
Sən özüni şahə dapşur, dəxi gəl var istəmə.

Aşiqin mə'şuq yüzüdür qibləsi, həm Kə'bəsi,
Sən yüzünü şahə döndər, qiblə divar istəmə.

Bu cəhanın bağçasında xarsiz gülmi olur?
Tikənindən qorxar isən, yeri, gülzar istəmə.

Ey Xətayi, yar yoluna canını etgil fəda,
Keç bu dünya şöhrətindən, sən onu var istəmə.

***

Ey könül, eşqində yarın naləvü ah eyləmə,
Dəgmə hər naməhrəmi sirrindən agah eyləmə.

Aşiqin imanıdır yarın cəmalı, ey rəqib,
Tanriçün get qarşudan mə'şuqi gümrah eyləmə.

Çün mənim üstümə doğdu afitabım, ey qəmər,
Gəzmə bir övci-fələkdə, adını mah eyləmə.

Çün sənin eşqi-məcazindən həqiqət bulmuşam,
Şimdisən xahi vəfa qılgil mana, xah eyləmə.

Mənzili-rəhmanilərdir asitanı dilbərin,
Getgil, ey şeytan rəqib, ahəngi-dərgah eyləmə.

Çün vüsalın xərmənindən bir cov olmaz hasilim,
Danə qılma yaşımi, çöhrəmni çün kah eyləmə.

Ey Xətayi, içdigün mey abi-kövsərdir müdam,
Nuşi-can et badədən, bir ləhzə ikrah eyləmə.

***

Gəl könül, pir istəyəli bu qədim ərkan ilə,
Gerçək oldur həq yoluna varə başü can ilə.

Canı tərkin qılmayan cananə vasil olmadı,
Qul gərək kim, məhrəm ola həzrəti-sultan ilə.

Qəhrinə şükr eyləgil kim, həq sana rəhm eyləyə,
Həmqərin olmuş əzəldən küfrü din iman ilə.

Öldürən sən, dirildən sən, saxlayan sənsən, həkim,
Yox imiş bir səndən özgə ayəti-Qur’an ilə.

Bu Xətayi ta əzəldən eşqinə yoldaş idi,
Könlünü şad eyləyibdir sən kərəmlü xan ilə.

***

Gər mənimlən ol məhi-namehribanım söyləşə,
Xəstə cismimdə bu cani-natəvanım söyləşə.

Mən öləndən sonra qəbrim üstə gər əzm etsə yar,
Qəbr içində dura anunlan imanım söyləşə.

Bu qərarı yox könül bilmən xaçan aram edə,
Ya məgər bir gün mənimlən dilsitanım söyləşə.

Zəhri-hicran birlə dəxi taleyim təlx olmaya,
Gər mənimlən bir gəz ol şirin zəbanım söyləşə.

Ğəmlü könlü bu Xətayinin cəhanda şad ola,
Gər mənimlən bir gün ol ömri-cəvanım söyləşə.

***

Məni sərgəştə heyran eyləyən şah,
Könül şəhrində seyran eyləyən şah.

Məni rüsva edüb saldın cəhanə,
Didəmni zarü giryan eyləyən şah.

Müsəxxər eyləyən cümlə cəhanı,
Yezid qövmin müsəlman eyləyən şah.

Özü bülbül olub gülzarə gəzdi,
Mən daşxaruda zar eyləyən şah.

Ənəlhəq çağuran Mənsur dilində,
Yenə Mənsuri bərdar eyləyən şah.

Həsən ilə Hüseyni Kərbəladə
Yəzid əlilə qurban eyləyən şah.

Çıxaran Yusifi çahi-bəladən,
Misir təxtində sultan eyləyən şah.

Günəş tək zahir olmuşdur gözündə,
Cahan bağın gülüstan eyləyən şah.

Xətasız yüzlərlə yüzigünəşdir,
Yenə günəşi pünhan eyləyən şah.

Xətayi səndən əfğan edəsidir,
Həşr günündə divan eyləyən şah.

***

Ya ilahi, sən məni bieşqi-canan eyləmə,
Eşq ilən şadəm, könül dərdimə dərman eyləmə.

Müddəilən və'də qılma, qövlinə qılmaz vəfa,
Hər yalançı yar ilən sən əhdü peyman eyləmə.

Gər vüsalından mədəd qılmazsan, ey arami-can,
Gözümü giryan edüb, bağrımnı büryan eyləmə.

Ləbləri dövrində ol gül yüzlü yarın dəmbədəm
Qönçəni, ey bağban, gülşəndə xəndan eyləmə.

Bu Xətayi xəstənin qılma müşəvvəş xatirin,
Ağ yüz üstə ol qara zülfin pərişan eyləmə.

***

Həq təala çaldı bir seyqəl bu güzgüm pasinə,
Könlümün sevdasi yoxdur bu cəhan ğövğasinə.

Neçələr dünyayə gəldi, neçələr dəxi gəlür,
Bir bəqa yurduni dutub yox degil fənasinə.

Canü baş tərkin qılub təcrid ol ğəvvas ilən,
Əlbəttə kim, uğraşur ol gövhərin dəryasinə.

Ey könül, tə'rif eylə, ğazilərdən al dua,
Şah edir ki, yarlığaram qulu qul duasinə.

Canını şükranə ver, başun ilə çox oynagil,
Ta yenüb nəfsini çalgil Kə’bəteynin tasinə.

Nəsnə kim, həqdən gələndir, ondan olgil bigünah,
Ey könül, var şadkam olgil həqin cəfasinə.

Ey Xətayi, bu yalançı dünyanın tərkini qıl,
Keç onun qalü qiyliyindən, şad ol səfasinə.

***

Ey ki, hicrin bəndəni zar etdi qayğulər bilə,
Çeşmi-fəttanın görüb heyranəm ahulər bilə.

İstəməz könlüm məşami zülfinizdən özgə müşk,
Müşki neylər kimsə kim, ögrəndi ol bulər bilə.

Ta gözüm ol fitnəli qaşü gözün gördü sənin,
Keçdi ömrüm ah edüb ol çeşmü əbrulər bilə.

Anca axdı gözlərimdən qanlu yaşım subəsu,
Axdı çeşmim zövrəqi hər suyə ol sulər bilə.

Şe’r içində nisbət olmaz, ey mühəddis, bilmiş ol,
Bu Xətayinin kəlamın hər xətalulər bilə.

***

Yenə bipərvalığı yad etdigin yə’ni ki nə?
Olur-olmaz sözü bünyad etdigin yə’ni ki nə?

Hər səhər ta sübh olunca tapmazam çün rahəti,
Bəndəni qayğudan azad etdigin yə’ni ki nə?

Ğüssəvü dərdü fəraq ilən, əya Şirin misal,
Aşiqi dağlarda Fərhad etdigin yə’ni ki, nə?

Yüz gəz ölsəm dünyada bir dəm mana yoxdur vüsal,
Firqətində ömrümü bad etdigin yə’ni ki, nə?

Səngdil yarın əlindən ah edübən dəmbədm
Yaxə yırtıb, baş açub dad etdigin yə’ni ki nə?

Ölmüşəm hicrində gecdən çürümüşdür üstixan,
Dirligi də mana bir ad etdigin yə’ni ki, nə?

Ta ki, fəryadinə yetməz lütf edüb ol şahi-hüsn,
Ey Xətayi, munca fəryad etdigin yə’ni ki nə?

***

Əgildim, səcdə qıldım xanədanə,
Nuş etdim şərbətindən qanə-qanə.

Zəhi dövlət bəşarət mən gədayə,
Yürüdüm, uğradım dürli dükanə.

Sərraf olan bilür gövhər bəhasın,
Mübah olmuşdurur pirü cəvanə.

Ərənlər asimanın dirəgidir,
Dirək yerdən dayanır asimanə.

Ululuğ istər isən, qulluğ eylə,
Ayağ bir-bir basarlar nərdibanə.

Cəhanı açdı Sultan Heydər oğlu,
İrişdi qazilər kövnü məkanə.

Yürüdüm bağına, qıldım təfərrüc,
Ərənlər yatağı nəqşi-cəhanə.

Sürər Düldül, çalar şah Zülfiqarı,
Əlidən qaldı bu zərbü nişanə.

Xətayiyəm bu gün meydan içində,
Şahın mədhin oxuram dərvişanə.

***

Diyari-eşqə sultanəm, dila, mən də zəmanimdə,
Vəzirimdir ğəmü ğüssə, oturmuş iki yanimdə.

Fəraqü atəşü dərdü ələmlər bağrımı yaxdı,
İliklər qarə su oldu, əridi üstixanimdə.

Mən ol canbaz sərbazəm, fələk fövqindədir darim,
Neçə həllac Mənsuri yürütdüm risimanimdə.

Mən ol şəhbazi-kuhsarəm, baş əgməm qülleyi-Qafə,
Neçə ənqa kimi yavru uçurdum aşiyanimdə.

Həmən əl arxası yerdə cahanın padşahidir,
Xətayi həp keçən sərdən, qədəm qoyan nişanimdə.

***

Çeşmin atanda ğəmzə məgər can dilər yenə?
Cəlladi gör ki, tökmək içün qan dilər yenə.

İstər rəqib vəsli-dəhanın xəyalini,
Ol divi gör ki, mülki-Süleyman dilər yenə.

İstər könül ki, nuş edə lə’lin zülalini,
Ol Xızrı gör ki, çeşmeyi-heyvan dilər yenə.

Zülfün yüzün kənarını dutmuşdurur, vəli
Kafər çərisi ğarəti-iman dilər yenə.

Miskin Xətayi qapuna gəldi, inayət et,
Vəslin gədası vayeyi-ehsan dilər yenə.

***

Əya könül quşu, derlər imiş, mana nə?
Büsati-eyş əcəb ruzigar imiş, mana nə?

Deyirlər oldu dil[1] Leyli zülfinə Məcnun,
Dəmində ol dəxi bir biqərar imiş, mana nə?

Axıtdı yaşımı dövran, batırdı qanıma əl,
Rəqib əlindəki dəsti-nigar imiş, mana nə?

Ləbin zülalinə süzdü, tükəndi ömri-əziz,
Həyati-Xızr əgər paydar imiş, mana nə?

Bu bəxti-bəd ki, mənimdir, Xətayi, ol şuxi
Ğəm əhlinə deyələr ğəmgüsar imiş, mana nə?

***

Çin düşübdür çin saçın ol yüz tümən çin üstünə,
Ənbərin çin-çin düzəltmiş müşki-pürçin üstünə.

Bir xuraman sərv qamət girdi nəsrin dərməgə,
Avc ilən doldur bənövşə, saç bu gülçin üstünə.

Gər dilərsən Leyli tək yüzün görən Məcnun ola,
Ay tək qaldır niqabın gün təki Çin üstünə.

Bir pəri peykərni gördüm, can fəda qıldım ona,
Eylə nazikdir ki, qılmış Çinü Maçin üstünə.

Bu Xətayi könlüni yəğmayə verdi çin içün,
Çin çərisi basdı Rumi, gəldi Maçin üstünə.

***

Çeşmimə gəldi, şəha, nəqşi-xəyalın bu gecə,
Qıldı aşüftə məni zülf ilə xalın bu gecə.

---

[1] Burada dil sözü yerinə əsir sözü yazılsa vəzn düzələr və məna daha aydın olar. Dil yerinə burada könül sözünü yazmaq da olar.

Duşdə gördüm məni-sevdazədə çin-çin yapuşur
Boynuma silsileyi-zülfi-çü dalın bu gecə.

Riştеyi-canimi şövq oduna pərvanə kimi
Yaxdı ta vəqti-səhər şəm’i-cəmalın bu gecə.

Qıldı sevda ilə peyvəstə zəif, ey məhi-növ,
Tənimi şol xəmi-əbruyi-hilalın bu gecə.

Gözlərim yaşini hər suyə çü su qıldı rəvan
İşvəvü naz ilə ol sərvi-nihalın bu gecə.

Munca kim, ahü fəğan eylədi, bir gün, sənəma,
Sormadın: – Xəstə Xətayi, necə halın bu gecə?

***

Mənəm sultani-aləm can içində,
Yerim vardır xamu canan içində.

Oxuyurlar onu bəhr ilə bərdə,
İraqü Şamü həm Şirvan içində.

Gəl ey talib, mana canın fəda qıl
Ki, keçmişdi günün hicran içində.

Könüldə küfrü iman dopdoludur,
Yəqin bil, küfr var iman içində.

Şəriətdir, təriqətdir həqiqət,
Mə’rifət bir gözidir can içində.

Bu gün çövkani-eşq aldım əlimə,
Gəlibmən top çalam meydan içində.

Xətayiyəm özüm şah Heydər oğlu,
Bu mehri görməsi sindan içində.

***
Eynullahəm, eynullahəm, eynullah,
Gəl imdi həqqi gör, ey kuri-gümrah.

Mənəm ol faili-mütləq ki derlər,
Mənim hökmümdədir xurşid ilə mah.

Vücudim beytül-Allahdır, yəqin bil,
Sücudum sanadır şamü səhərgah.

Yəqin bil əhli-iqrarın yanında
Yerü gög cümlə həqdir, olma gümrah.

Vilayət bağının bir meyvəsidir,
Xaçan üzə ani hər dəsti-kutah?

Dilərsən həqqi həqqə vasil etmək,
İrişdi fi məqami li məallah.

Üluqi pak üzə seyran edər ki,
Xətayi uğradı bir gəncə nagah.

***

Nəfəsi əhli-dilin gövhəri-candır bilənə,
Nitqimiz qüdrəti-həq, ruhi-rəvandır bilənə.

Mə'rifət gövhərinin kaninə mə'dən ola gör,
Üştə bu gəncü hünər elmi-nihandır bilənə.

Şərbəti-həqdən içən eşq əri azad olur,
Eylə sərməst olanın küfri imandır bilənə.

İstədi abi-həyat çeşməsi kim, irdi Xızr,
Ol verür doğru xəbər, cümlə əyandır bilənə.

Ələ girməz, xanı ol əsrükü divanə aşiq,
Leyk ol mə'şuqənin dərdi amandır bilənə.

Qövli yalançı ilə olma müsahib, çək əlin,
Həmdəm olmağ div ilə külli ziyandır bilənə.

Ey Xətayi, həqi sən tani, özündə sakin ol,
Dəxi söz söyləmə, var, bu söz əyandır bilənə.

***
Genə əzm eylədi könlüm, gedər ol şahi-ə'layə,
Vücudim eşqi məhv oldu səmək tək düşdü dəryayə.

Vücudim şəhrinə girdi, vilayət şahini gördi,
İkilik qəl'əsin yıxdı, ulaşdı zati-yektayə.

Gəl, ey könlüm, səfər eylə, bu gün yövmi-hidayətdir,
Cəhanü canı qoy, filcümlə, getsün külli yəğmayə.

Gözü yəğmaçılar gəldi, məni yəğmaladı külli,
Əlimdən varlığım aldı, götürdü ani səhrayə.

Şəha, minnət! Şəha, minnət! Bu gün yövmül-hesab oldu,
Maariflər hesab verdi, münafiq qaldı fərdayə.

Xətayi ta səni gördü, vücudun sərbəsər gəzdi,
Çü şahın qulların gördü, yüzün xak etdi ol payə.

***

Şəha, qılgil tərəhhüm mən gədayə,
Eşigündə yetirgil bir nəvayə.

Nola hüsnin zəkati busə versin,
Zəifəm, dərdməndəm, mən gədayə.

Dişün incü, gözün nərgis, ləbin lə’l,
Sənin ol xoş cəmalın bənzər ayə.

Humayun qəsrinizdən, şahi-xuban,
Nola salsan mənim üstümə sayə?

Sənin cövründən, ey sultani-aləm,
Xətayi baş alur, varur Xətayə.

***

Qatı müştaq idim sən məhliqayə,
Könül gördü gözün, düşdü xətayə.

Şu dəmdən kim, səni gördüm cəmalın,
Giriftar olmuşam yüz min bəlayə.

Düşübdür ənbərəfşan kakilindən
Sənin ta ol güli-həmranə sayə.

Mənim vayəmi ta verməzsən, ey dost,
Salubsan aşiqi ah ilə vayə.

Xətalı qulunam, rəhm eylə, ey yar,
Xətayini buraxmagil Xətayə.

***

Biz ol cani-yeganəyüz, yeganə,
Nə bilür bizi hər naşı, biganə.

Bizə saqi dolu sundu qədəhni,
İçübən əsriyib olax divanə.

Talibin mənzili bizə dikəndir,
Nişan piruz olur həm binişanə.

Divanəyüz, divanəyə qələm yox,
Bizə nə saçü saqqal, nə xo şanə.

Xətayinin nəfəsni eşidənlər
Olardadır səadət, gər inanə.

***

Mən ol məsti-liqayəm, gəldim imdi,
Həmişə ba xudayəm, gəldim imdi.

Cəhan içində bir aqil məni bil,
Mən ol sidqü səfayəm, gəldim imdi.

Məni zinhar sən bir ğeyr bilmə,
Haman ol dilrubayəm, gəldim imdi.

Münafiq caninə ba zərbi-şəmşir
Bu gün həqdən bəlayəm, gəldim imdi.

Zi ğeyri-həq məni biganə bilgil,
Behəzrət aşinayəm, gəldim imdi.

Məni bilgil həmişə vasili-həq,
Zi ğeyri-həq cüdayəm, gəldim imdi.

Məğarib əhliçün övci-fələkdən
Bemə'ni çün hümayəm, gəldim imdi.

Öküş canlar içün can almağa mən
Xətayi can fədayəm, gəldim imdi.

***

Xəstə canım olmayasan sevgili canan kimi,
Höqqeyi-lə'lini gördüm dərdimə dərman kimi.

Eylə kim, zülmat içində afitab olur əyan
Küfri-zülfin arasında rüxlərin iman kimi.

Arizinin nisbəti-vəsfin cahanda söylərəm,
Gülşəni-cənnətdə bitmiş şol güli-xəndan kimi.

Külbeyi-Yə'qubə nisbət məskənim boldu xərab,
Ta ki, səndən ayru düşdüm Yusifi-Kən'an kimi.

Bu Xətayi verdi övsafi-həqiqətdən xəbər
Ta gözüm gördü cəmalın surəti-rəhman kimi.

***

Asdı zülfin tək ğəmin şol qəddü baladən məni,
Ruy göstər mahi-mən, qurtar bu sevdadən məni.

Mehri-ruyin məh təki qarşumda dutmuş ol pəri,
Ey fələk, dur etməgil ol hüsni-zibadən məni.

Zahida, vermə nəsihət, eşqi mən tərk eyləmən,
Və'z ilən qorxutmagil imruzü fərdadən məni.

Göz yaşım rudxanəsi axdı ğəmindən, oldu bəhr,
Vəsl ilən dutgil əlim, qurtar bu dəryadən məni.

Bu Xətayinin yeri oldu ğəmindən daği-hicr,
Qurtara vəslin məgər bu kuhü səhradən məni.

***

Dilbəra, gül görmədim gülşəndə rüxsarın kimi,
Mehri mah olmaz fələk yüzündə didarın kimi.

Gər siyəhdir dünyada leylilə zülmatü siyəh,
Olmuya bunlar siyah ol türreyi-tarın kimi.

Al ilən aldı mənim könlümni məndən, duymadım,
Sehr içində görmədim ol çeşmi-məkkarın kimi.

Sormuşam, qəndilə şəkkər ləzzəti xoşdur, vəli
Ol dəxi şirin degil lə'li-şəkərbarın kimi.

Bu Xətayi xəstəyə neyçün vəfalər qılmadun,
Yoxdurur mehrin təki könlündə iqrarın kimi.

***

Dilbəra, eşqində mən tək kimsə məşhur olmadı,
Ya sənin tək hüsninə heç kimsə məğrur olmadı.

Hur ilən baği-beheşti qıldılar tə'rif, leyk
Eşigin tək cənnətü hüsnin kimi hur olmadı.

Ta ki, eşqin gəlmədi, şaha, bu könlüm təxtinə,
Ey sənəm, şəhri-vücudim beyti-mə'ur olmadı.

Nuri-eşqin, dilbəra, könlümə ta kim düşmədi,
Zülməti-könlüm evi aləmdə pür nur olmadı.

Xaki-payini Xətayi ta ki çəkdi çeşminə,
Görmədin bu dövləti düşmən gözü kur olmadı.

***

Dilbəra, eşqini təndə saxlaram canım kimi,
İstərəm mehrini can təxtində sultanım kimi.

Yasəmən tək rüxlərin gördüm, əya ruhi-rəvan,
Yaşlarım gözdən rəvan oldu yenə qanım kimi.

Qəddini can bağçasında istərəm hər dəmbədəm,
Çeşmeyi-çeşmimdə bit sərvi-xuramanım kimi.

İncimən dərdindən, ey könlüm alan nazik sənəm,
Vardurur mehri-ləbin könlümdə dərmanım kimi.

Ey Xətayi, eşidib hər dəm mənim fəryadimi
Nalə qıldı nöh fələklər ahü əfğanım kimi.

***

Dilbəra, hicrində kim ki, didə giryan olmadı,
Atəşi-eşqində hər dəm bağrı büryan olmadı.

Gül yüzün əzminə dün getdim, gülüstan gəştinə,
Səndən ayru xar boldu gül, gülüstan olmadı.

Ta sənin xurşid ruxsarını gördüm, çeşmimə
Bir bulut oldu qəmər, ol mahi-taban olmadı.

Munca kim, gördü səni zahid, yüzüni sevmədi,
Lacərəm, ol kafərin könlündə iman olmadı.

Bu Xətayi eşqinə neyçün xəlayiq tə'n edər.
Ol məhi kim gördü kim, hüsninə heyran olmadı?

***

Heç sənin tək görmədim bir dilbəri-hurü pəri,
Sərv boylu, lalə yüzlü, ğönçə ləb, məh peykəri.

Ta səni gördü gözüm, oldum özümdən bixəbər,
Xanda gördü gözlərim bilmən sənin tək dilbəri?

Eşigin rizvan, özün huri, cəmalındır pəri,
Rüxlərin cənnət, boyun tuba, dodağın kövsəri.

Mərhəba ey dilbəri-Şirazü şuxi-mülki-Çin,
Söylədi hər kim səni gördisə Allah əkbəri.

Qaşların qanımni tökdü, su kimi ötdün rəvan,
Xancəri gedərsən, ey xunxarə dilbər, xancəri?

Ey Xətayi, şol Xötən türki saçının şəmməsi
Nafeyi-səhrayə saldı bəlkə müşkü ənbəri.

***

Ey məni heyran edən, dər xab gördüm mən səni,
Ey pəri, nə adəmi, məhtab gördüm mən səni.

Görəli mehri-rüxin çeşmim münəvvərdir mənim,
Dünyada xurşidi-aləmtab gördüm mən səni.

Eşqinin dəryasinə qərq olmuşam qəvvas tək,
Bəhri-dildə lö'löi-sirab gördüm mən səni.

Yüzün üstə göz ilən qaşını ta kim görmüşəm,
Qibleyi-üşşaq içün mehrab gördüm mən səni.

Ey Xətayi, dilbərin xurşidi-tabandır məgər
Kim, baxanda didəsi pür ab gördüm mən səni.

***

Bu sürahi dilbəri-rə'na kimidir qaməti,
Ruh tək hər kim ki, rahin içər, artar rahəti.

Vəsfinin şərhin deməkdə nitqi yoxdur kimsənin,
Həq humayun eyləmiş bəzm içrə sahib dövləti.

Lə'lü cövhərdən mürəssə qılmış ani həq təmam,
Bu səadətdən müdami kimsənin yox minnəti.

Gecələr məclis içində oturur ol sərfəraz,
Eylə mehmandır k-anın[1] hər yerdə vardır izzəti.

---

[1] K-anın – ki, anın; ki, onun.

Ey Xətayi, deməgil anın şərabın sən həram,
Sinəsinə nurtək dolmuş ilahin rəhməti.

***

Dəmbədəm yol gözlərəm, ol sevgi yarım gəlmədi,
Qalmışam qış möhnətində, novbaharım gəlmədi.

Xeyli müddətdir ki, mən ta ayru düşdüm yardən,
Görmək içün həddən ötdü intizarım, gəlmədi.

Ta ki, gördüm uyxuda mən ol pərişan zülfini,
Yerinə andan bəri səbrü qərarım gəlmədi.

İxtiyarım getdi əldən, canü dildən əl yudum,
Ol mənim canü könüldən ixtiyarım gəlmədi.

Xəstədir miskin Xətayi bir misali-əndəlib,
Hüsn bağında cəmalı gül'üzarım gəlmədi.

***

Ta mənim gül yüzlü yarım əzmi-seyran eylədi,
Lalətək hicri yarası bağrımı qan eylədi.

Ta ki qıldı bir nəzər ol dilrüba yarım mənim,
Neçə üşşaq əhlini sərməstü heyran eylədi.

Ta ki, dün gülzar içində bir təbəssüm qıldı yar,
Ağzı püstə qönçəni gülşəndə xəndan eylədi.

Damə saldı can quşun, səd parə qıldı dilləri,
Ta qəmər yüzində ol zülfin pərişan eylədi.

Afərin ol dilrübayi-nazənin dildarə kim,
Bu Xətayiyə vüsalin lütfi ehsan eylədi.

***

Ta səni gördüm, nigara, dil mana yar olmadı,
Gərçi yar oldu, vəleykin yari-ğəmxar olmadı.

Gərçi şirin ləb cəhan mülkində çoxdur bişümar,
Höqqeyi-lə'lin kimi hərgiz şəkərbar olmadı.

Gül gülüstan içrə çoxdur nazikü ziba, vəli
Arizin tək, ey sənəm heç güldə rüxsar olmadı.

Xanda kim, mə'şuq ola, kuyində vardır çox rəqib,
Xansı güldür kim, anun yanında bir xar olmadı?

Ta səni gördü Xətayi, valehü şeydayidir,
Xansı gözdür həq yüzin görgəc ki, bidar olmadı?

***

Sirri-eşqindən sənin hər kim ki, agah olmadı,
Qaldı məhrum ta əbəd, məqbuli-dərgah olmadı.

Bilməyən kəndu vücudin həqqi bilməz, lacərəm,
Kim ki bildi nəfsini, aləmdə gümrah olmadı.

Güzgüsi pak olmayanın çarə yoxdur pasinə,
Qaldı məhrum ta əbəd, Fəzl ana həmrah olmadı.

Hər nə qılsan nikü bəd, axir sana ol tuş olur,
Çəkmədi şərməndəlik, hər kim ki bədxah olmadı.

Zirqinə aldanmagil, məkri yüküşdür dünyanın,
Xansı gün xoş keçdi ki, sonu ğəmü ah olmadı?

Zövqü şövqin günlərində kim, olar yarım dedi,
Bir məlamət güni gəldi, kimsələr yar olmadı.

Çün qul oldun, ey Xətayi, bəndəfərman ol, yəqin,
Bəndəfərman olmayanlar layiqi-şah olmadı.

***

Cana, cəhanda olmuya məhru sənin kimi,
Məhrudə dəxi gəlmiyə niku sənin kimi.

Qandır mənim susuzluğum, ey abi-lə’li-yar,
Girməz əlümə dünyadə bir su sənin kimi.

Əhsən cəmali-hüsninə kim, bağbani-hüsn
Gülşəndə görmədi bitə gülru sənin kimi.

Ey zülfi-dust, dünyadə dur, həm oturma kim,
Düşməz dimağə ənbəri-xoşbu sənin kimi.

Getmə Xətayi çeşmidin, ey əksi-qəddi-yar,
Nəmnak yerdə bitməyə qarğu sənin kimi.

***

Ol dilrüba ki, təndə çəkərmən cəfasini,
Vermən cəhanə şəmməcə zülfi bəhasini.

Munca dua qılur bu könül, qılmaz iltifat,
Ol bivəfa məgər kim, eşitməz duasini.

Heyranü valeh oldu bu könlüm ələddəvam,
Bir qatla ta ki, gördü anın xub liqasini.

y dil, təbibə sorma əlacin bu dərdimin,
Dünya həkimi bilmiyə eşqin dəvasini.

İxlasi-dildən ayəti-tə’viz oxur müdam,
Yad eyləgəc Xətayi cəhanda xətasini.

***

Ey gül yanağlu, ləblərinə can desəm, yeri.
Zülfinə küfrü yüzinə iman desəm, yeri.

Sordum təbibə, dərdimə dərman bulunmadı,
Bu dərdi-eşqə lə’lini dərman desəm, yeri.

Kim eşiginə yastana, dövlət bulur müdam,
Ol asitanə sayeyi-sübhan desəm, yeri.

Bir muri-xəstənin ki, qapunda məqami var,
Mən ol məqamə mülki-Süleyman desəm, yeri.

Buldu Xətayi zikri cəmalında nuri-həq,
Səhni-rüxini səfheyi-Qur’an desəm, yeri.

***

Əksi-sayəndir vücudim, ey saçı zilli-humay,
Nişə kim, sən padşəhsən, mən qapunda bir gəday.

Kövkəb olmuşdur mənim çeşmim cəmalın görməgə,
Bir nəzər doğgil gözüm qarşusinə, ey yüzi Ay.

Ol məhin eşqinə düşdüm, tə’nə qılma, zahida,
Qaçmazam eşqin yolundan çün mana həq qıldı tay.

Ta əzəldən var mənim guşimdə eşq avazəsi,
Çalma, ey mütrib, dəxi məclisdə udü çəngü nay.

Bu Xətayi oldu Məcnun, dağə düşdü ahu tək,
Naseha, dağdan ani ürkütmə, qılma huyi hay.

***

Yoxdurur aləmdə bir dəx hüsn ilən yarım kimi,
Ya cəmal əhlində kim var ol vəfadarım kimi.

Həsrətindən qəddinin eylə zəif olmuş sənin,
Yel əsəndə titrəşür bu cismi-bimarım kimi.

Ta ki, dün məclisdə ney fəryadü zarım dinlədi,
Ağlaşur bağrın dəlüb bu naləvü zarım kimi.

Əbri-neysandan sorun əhvalimi kim, ol dəxi
Qətrə-qətrə yaş tökər çeşmi-göhərbarım kimi.

Ey Xətayi, gərçi xublar çoxdurur aləmdə, leyk
Olmaya bir dilbər ol şuxi-sitəmkarım kimi.

***

Ey cəmalındır sənin Allah nurin məzhəri,
Uştə beytüllah qaşın mehrabi, qəddin mənbəri.

Sən nəçük sün'i-xudasən, ey mələk yüzlü bəşər,
Yüzini görgəc oxur üşşaq "Allah əkbəri".

Ta yaratdı yer ilən gögi təala şanəhu,
Görmədi heç kimsə sən tək dilbəri-məh peykəri.

Çin çərisi sanasan kim, dutdu Rum iqlimini,
Ta yüzün girdinə düşdü zülfi-müşki-ənbəri.

Ruzü şəb ayü günəş girdi-fələkni dövr edən,
Şəbçırağ olmuşdur, istər isən bütinin əxtəri.

Qamətin pəst eylədi sərvi çəməndə, ey sənəm,
Arizin qıldı xəcil bağlarda vərdi-əhməri.

Dünyada hər kim qılur bir padşahın xidmətin,
Bu Xətayi bəndədir sidq ilə şahın çakəri.

***

Ta gördü gözlərim səni, ey hüsn ilən ğəni,
Məcnun misali əqlim ilən görmədim səni.

Kuyindən özgə mürği-könül dutmadı qərar,
Bülbül nə yerə varə görüb tazə gülşəni?

Yüzümni xaki-pa qıluram asitaninə,
Ta kim, dəgə yüzümə səadətlü daməni.

Xublar cəhanı cümlə dutarsa, əya sənəm,
Can olduğunca mən dəxi tərk eyləmən səni.

Getməz Xətayi cövr ilə qapundan, ey pəri,
Gülşən bilürmən ol səri-kuyində külxəni.

***

Ey mələk surətli insan, ey günəş yüzli pəri,
Görmədi aləmdə mərdüm bir sənin tək dilbəri.

Sanma ancaq müşkə verdi bu siyəhruluğ saçın,
Məh yüzün qıldı xəcil bağlarda vərdi-əhməri.

Eşqinə düşən könüllər sanma kim, abad ola,
Onlarun şəhrin xərab etdi fəraqin ləşkəri.

Oldu səhradə yerim, insan içindən dur olub,
Ta ki gördü gözlərim sən ahu gözlü dilbəri.

Uş bu mə’nidən Xətayi hur söylər hüsnini
Kim, ləbin peymanəsi bəxş eylər abi-kövsəri.

***

Ey sənəm, yolunda bu aləm fədadır, can dəxi.
Bəlkə quldurur sana aləmdə hər sultan dəxi.

Ey pəri, hüsninə insan necə heyran olmasun,
Gögdə sərgərdan olubdur ol məhi-taban dəxi.

Ey günəş, hüsnin sənin bir övcə yetmişdir bu gün,
Ayağın altında toprağ kimidir Keyvan dəxi.

Mövci-eşqindən sənin ğərq olmuşam bir bəhrə kim,
Gözlərim yaşı qatında qətrədir ümman dəxi.

Necə yanmasun Xətayi arizin hicrində kim,
Ğərqeyi-xun oldu cövrindən güli-xəndan dəxi.

***

Ta ki axşam vəqti gördüm, ey büti-məhru səni,
Gündüzin ta şam olunca istərəm hər su səni.

Ta ki, sən getdin mənim qarşumdan, ey sərvi-rəvan,
Dəmbədəm istər rəvan olub gözümdən su səni.

Gəldi yüz min dürlü sövdayi-pərişan başimə,
Xanda gördü gözlərim, ey türreyi-hindu səni?

Yarəb, ol çöhrən nə tazə vərdi-əhmərdir sənin,
Gül qızarmış xiclətindən, lal edibdir susəni.

Ey Xətayi, sən nə bülbülsən ki, baği-rövzədə
Görməmişdir bağban dər gülşəni-minu səni?

***

Mana dərdü bəlalər yaxşı gəldi,
Sana zövqü səfalər yaxşı gəldi.

Sana xoş oldu, yarın yar boldu,
Mana ol aşinalər yaxşı gəldi.

Sənin yüz qiymətin bir pula düşdü,
Mana bu pürbəhalər yaxşı gəldi.

Mən ol pərvanə tək həsrət odunda,
Sana şəm'i-ziyalər yaxşı gəldi.

Sana cövrü cəfa bolsun müsəlləm,
Mana əhli-vəfalər yaxşı gəldi.

Xətayi vəslə yetdi çinü təhqiq,
Sana yardan xətalər yaxşı gəldi.

***

Ğəmindən gözlərim ümman degilmi?
Vüsalın can içində can degilmi?

Yazılmış xəttü xalın bimürəkkəb,
Əcayib surəti-rəhman degilmi?

Əgər Tövrat, əgər Incilü Zəbur,
Be hökmi-ənbiya fürqan degilmi?

Əgər dərviş, əgər mirü səlatin,
Bu beş gün dünyada mehman degilmi?

Cəhanə eşq ilən üryan gələnlər,
Gedəndə həm yenə üryan degilmi?

Bu günün fürsətin danlayə verən
Yolunda cahilü nadan degilmi?

Gedənni xoş keçir, miskin Xətayi,
Gələn dövran əcəb dövran degilmi?

***

Dünyəvü üqbadə birdir yar, dutman yar iki,
Yar isən, ey ğəmli könlüm, dutmagil, zinhar, iki.

Zülfini yüz üstə gördüm həlqələnmiş, söylədim:
Gənc birdir, üstə neyçün yatmış ol şəhmar iki?

Mürği-dil gahi rüxün, gəh arizin məskən dutar,
Bülbüli-dilxəstə birdir, neyləsün, gülzar iki?

Quşanur könlüm səri-zülfin xəyalən dər miyan,
Gör nəçük kafərdir ol kim, bağlanur zünnar iki?

Eyləməz hərgiz Xətayi sirri-həqqi xəlqə faş,
Çünki birdir sirri onun, saxlamaz sirdar iki.

***

Mənim könlüm alan dilbər degilmi?
Ləbi mərcan, dişi gövhər degilmi?

Yüzü zülfün mənim imanım aldı,
Zəhi çin düşməni, kafər degilmi?

Məni heyran edən ol hurizadın
Boyu tuba, ləbi kövsər degilmi?

Şərabi-eşq içən üşşaqə, ey dust,
Ləbin noğul, sözün şəkkər degilmi?

Xətayi şahi-aləm eşigində
Qulami-kəmtər əz Qənbər degilmi?

***

Vəchinə baxgəc göründü gözümə məh parəsi,
Olmuşam ruzi-əzəldən firqətin biçarəsi.

Dərdimə dərman gərək qapuna gəldim, ey həbib,
Bimişəm səndə yəqindir uşdə dərdim çarəsi.

Görəli şirin ləbin eşqində Fərhad olmuşam,
Olmuşam Məcnun kimi ol Leylinin avarəsi.

Diləgim bu idi həqdən, ey həbibim, sübhü şam;
Yar əlindən ola yarə canda, eşqin yarəsi.

Ey Xətayi, firqətin çək, ta vüsalın bulasan,
Bəs yavuq qılmış vüsalin birlə hicran arəsi.

***

Təalallah, gəl ey gör kim, yenə nuri-xuda gəldi,
Cəmii-ənbiya xətmi Məhəmməd Mustafa gəldi.

Sevindi cani-aşiqlər, açıldı bəxti-sadiqlər,
Oyandı ruhi-mö’minlər, səfa gəldi, səfa gəldi.

Zəminlərdə, zəmanlarda səlahül-xeyr məqdəmdir,
Fələklərdən, mələklərdən hezaran mərhəba gəldi.

İrişdi mürşidi-kamil, qamu əhli-aman oldu,
Sevindi ğazilər cümlə ki, xətmi-ənbiya gəldi.

Həqə məzhərdürür Adəm, sücud et, uyma iblisə
Ki, Adəm donuna girmiş xuda gəldi, xuda gəldi.

Firiştə endi göglərdən, bəşarət əhli-ürfanə,
Xəvaricə əcəl yetdi, Yezidlərə bəla gəldi.

Zəlalət içrə zülmətdə itirmişdin çırağını,
Gözün aç, çıx bu zülmətdən ki, bir bədri-düca gəldi.

Xəlilullah donin geymiş, verilmiş adı Ismail,
Ona qurban olun canlar ki, Allahdan nida gəldi.

Gözəl şahım, qəmər mahım, muradgahım, könülxahım,
Cəmali-məzhərrüllahım, kərimi-övliya gəldi.

Əzazil adlı şeytanın, yetər, təqlidinə uyma,
Əlin dut, həq yolun görsət, imami-rəhnüma gəldi.

Cəhanı sehr ilə Fir’on özinə tabe etmişdi,
Oları yutmağa Musa əsası əjdəha gəldi.

Bahadır qazilər qoydu, başında taci-dövlət var,
Budur Mehdi zəman dövri, cəhan nuri-bəqa gəldi.

Gözü sadü dili taha, yanağı qaf vəlqur’an,
Qaşu nunü saçı vəlleyl, yüzi şəmsüz-züha gəldi.

İmami-Heydər oğluna dilü candan riza ver gəl
İmamım Cə’fəri Sadiq, Əli, Musa, Riza gəldi.

Xətayi xəstə şol şahin cəmalın vəslini istər,
Rəvan ver can satun algil ki, elmi-can bəha gəldi.

***

Rüxün bədr ayə bənzər, bənzəməzmi?
Saçın sevdayə bənzər, bənzəməzmi?

Fəqirəm, ol gəzəldir hüsn içində
Ğənidir, bayə bənzər, bənzəməzmi?

Xədəngi-kirpigün oxdur ki, qaşın
Qurulmuş yayə bənzər, bənzəməzmi?

Zahidin qarğışı aşiq həqində
Yalan də’vayə bənzər, bənzəməzmi?

Xətayi, firqətindən ağlamaqdan
Du çeşmim çayə bənzər, bənzəməzmi?

***

Yəqin bil ki, xudayidir Xətayi,
Məhəmməd Mutafayidir Xətayi.

Səfi nəsli, Cüneydi-Heydər oğlu,
Əliyyəl-Mürtəzayidir Xətayi.

Həsən eşqinə meydanə gəlibdir,
Hüseyni-Kərbəlayidir Xətayi.

Əli Zeynəlibad, Baqirü Cə'fər,
Kazım, Musa Rizayidir Xətayi.

Məhəmməd Təqidir, Əli Nəqi həm,
Həsən Əskər liqayidir Xətayi.

Məhəmməd Mehdiyi-Sahib Zəmanın
Eşigində gədayidir Xətayi.

Mənim adım vəli Şah İsmayıl dır,
Təxəllüsü Xətayidir, Xətayi.

***

Şəha, səndən səfa istər Xətayi,
Kərəm, lütfü əta istər Xətayi.

Ayağın toprağın, ey şahi-aləm,
Gözünə tutiya istər Xətayi.

Götürgil ağ yüzündən qara zülfi,
Niqabın aç, liqa istər Xətayi.

Diləməz asitanından cüdalığ,
Cəfa qılma, vəfa istər Xətayi.

Şəha, bu doğru yola varmaq içün
Sənin tək rəhnüma istər Xətayi.

Yezidü kafərü Mərvanə hər dəm
Qazilərdən qəza istər Xətayi.

Məhəmmədü Əlinin hörmətiçün
Yəqin bilgil, xuda istər Xətayi.

***

Bahar oldu ki, aləm gülşən oldu,
Gözün aç, gör cahan nə rövşən oldu.

Bəzəndi hər bir ağac bir gül ilə,
Ağaclar cümlə gül pirahən oldu.

Açıldı yazilər, bitdi çiçəklər,
Gül ilə şol bənövşə, susən oldu.

İrişdi və’dəsi badi-baharın,
Behər su gül hezaran xərmən oldu.

Mana ol dust bolsa dost ancaq,
Nə ğəm gər cümlə aləm düşmən oldu.

Çox əgləndin gələndə, ey Xətayi,
Məgər sana bu yerlər məskən oldu?

***

Mən buti-Leyli əlindən olmuşam Məcnun kimi,
İştiyaqindən dəmadəm ağlaram məhzun kimi.

Çeşmeyi-çeşmim suyundan seyl dutdu aləmi,
Munca gəlmişdir Fəratü Dəcləvü Ceyhun kimi.

Gər cəmalın əksini uyxudə gördü ayü gün,
Şol xəcalətdən qızardı qeyrətindən xun kimi.

Xameyi-qüdrət ki, çəkdi arizin lövhində xətt,
Xansı katib yaza bildi şol xəti-mövzun kimi.

Bu Xətayi bir gün almışdı ləbindən busələr,
Gəldi çox günlər, vəleykin gəlmədi ol gün kimi.

***

Vücudin rövzeyi-rizvan degilmi?
Cəmalın nəzhəri-insan degilmi?

Budur ərşin məcidi qülhüvəllah,
Kişi kim, bilməyə, heyvan degilmi?

Vücudi-Mustafadan oldu Adəm,
Risalət qapusu Qur’an degilmi?

Əli sirrin nə bilsün hər münafiq,
Münafiq qibləsi şeytan degilmi?

Xətayi sirridir tahavü yasin,
Durubdur ortada mizan degilmi?

***

Ey boyun tuba, dodağın abi-heyvan nisbəti,
Abi-heyvan demən ani, çeşmeyi-can nisbəti.

Qamətü rüxsarın hər kim ki, gördü, söylədi:
– Biri güldür, birisi sərvi-xuraman nisbəti.

Eşigin toprağinə hər kim qul oldu sidq ilə
Padşahdır bəndeyi-fəğfuri xaqan nisbəti.

Bəhri-eşq içrə səninçün necə qəvvas olmuşam,
Dişlərin dürdür, dodağın abi-heyvan nisbəti.

Bu Xətayi ta ki, yüzün üstə gördü zülfini,
Gözlərindən yaş tökər barani-neysan nisbəti.

***

Nələr gəldi, gələsidir, mədəd hey.
Cəhan əhli öləsidir, mədəd hey.

Gəlir hökmi-ilahi İsrafilə,
Ulu suri olasıdır mədəd hey.

Günəhkarlar günahı sormağ içün
Ulu divan durasıdır mədəd hey.

Qurulur ədl içün mizan, tərazu,
Əməllər dartılasıdır mədəd hey.

Peyəmbərlər qaçar ümmətlərindən
Ki, nəfsa nəfs olasıdır, mədəd hey.

Sürə-sürə ilitərlər Siratə,
Necələr süriləsidir, mədəd hey.

Bu bədbəxt adəm oğlundam təmamət
Yedi damu dolasıdır, mədəd hey.

Xətayi dərdinə dərman bulunmaz,
Yarəb, halı nolasıdır, mədəd hey.

***

Gəl ki, cana, səndən ayru gözlərim qan ağladı,
Cigərim yandı, tutaşdı, can içün can ağladı.

Firqəti-hicran əlindən şöylə ah etdim bu gün,
Gögdəki cümlə məlayik, yerdə insan ağladı.

Kim ki, aşiq olmadı, əhvali-aşiq bilmədi,
Dilbərin şirin ləbindən abi-heyvan ağladı.

Atəşi-eşqə düşən pərvanə tək yanmaq gərək,
Şöylə kim, tərsa içün ol Şeyx Sən’an ağladı.

Hər zaman zari qılur miskin Xətayi yar içün,
Eylə kim, Yusif içün Yə’qubi-Kən’an ağladı.

***

Ey şəha, mən səndən özgə sevmədim, sevmən dəxi.
Mahi-rövşən səndən özgə sevmədim, sevmən dəxi.

Hər kimin bir ahu gözlü dilbəri seyrandadır,
Göz dəxi ceyrandan özgə sevmədim, sevmən dəxi.

Cigərim səd parədir qəmzən oxundan, ey sənəm,
Kirpigi müjgandan özgə sevmədim, sevmən dəxi.

Bu həqiqət məclisində mən sənəm, sən dəxi mən,
Eylə sanma, səndən özgə sevmədim, sevmən dəxi.

Dilbər aydır: – Ey Xətayi, bir dəxi sevdin məgər?
– Həq bilür ki, səndən özgə sevmədim, sevmən dəxi.

***

Həqi könlündə sir saxla, özündən bixəbər sufi.
Bu dəryadən dərin sirri nə bilsün dəngəsər sufi.

Tanımamış o, nəfsini, necə bilsün ki, rəbbini,
Qalıbdır ladə, illadə, görün nə zikr edər sufi.

Sevibdir sim ilə zərri, qoubdur vəsli-dildari,
Əgər doğrusunu dersəm, olur xəşm ilə nər sufi.

Özüni bilən ər sufi, həm oldur sufiyi-safi,
Desən rəvadurur anə, gəl ey sahib nəzər sufi.

Xətayi, mürşidü pirlər əlini tutub ar etmə,
Əgər arif isən, anla, kərəm qıl, olma xər sufi.

***

Ey müsəlmanlar, əsiri-zülfi-yarəm, doğrusu,
Bu siyəhkarın əlində biqərarəm, doğrusu.

Derdim, ol dilbər yanında e'tibarım var mənim,
Yoxladım, etdim yəqin, bie'tibarəm, doğrusu.

Bir quru candan nolur, qurban edim cananimə,
Ol pəri rüxsardən çox şərmsarəm, doğrusu.

Şah Xətayi seyrə çıxdı, açdı Hürrin qəbrini,
Bar-ilahi, əfv qıl kim, tövbəkarəm, doğrusu.

***

Qara zülfinə boynun hindi düşdi,
Sənin sevgin könülə indi düşdi.

Əzəldən sevgini, var idi canda,
Sən eylə sanmagil kim indi düşdi.

Tuti yarım durub bağçaya gəzər,
Utandı sərv ağacı endi, düşdi.

Dilər dal boynuna don biçə xəyyat,
Gözündən yaş ələndi, sındı, düşdi.

Bu gün ulaşdılar xublar xubanı,
Bizə xublar xubanı rindi düşdi.

Nə qayğım var rəqibin fitnəsindən?
Eşitdim quyu qazan kəndi düşdi.

Xətayi, sən güvənmə malə, gəncə,
Neçələr malə, gəncə mindi, düşdi.

# *Q ə s i d ə l ə r*

***

Ey ki, yoxdan bu cəhanı var edən pərvərdigar,
Yeri qaim, gögləri dəvvar edən pərvərdigar.

“Küntü kənz”in ayəti vəsfində olmuşdur nüzul,
Varlığına kün fəkan iqrar edən pərvərdigar.

Cümleyi-aləmdə sən gündən dəxi zahir, vəli
Dildə daim adını səttar edən pərvərdigar.

Mö’minə məskən qılıbdır bаği-cənnatü nəim,
Kafəri-münkir məqamin nar edən pərvərdigar.

Cümlə əşyalər gözin dər xab edəndir gecələr,
Gögdə kövkəblər gözin bidar edən pərvərdigar.

Bir qulunu odə yaxub qıldı fi-nari-səqər,
Bir qulunu məhrəmi-əsrar edən pərvərdigar.

Misr içində Yusifi bir qul ikən sultan edən,
Dərd ilə Yə’qubini bimar edən pərvərdigar.

Yunisi dərya içində yudduran bir balığa,
Atəşi Ibrahimə gülzar edən pərvərdigar.

Yağduran dəryayə gögdən əbri-neysan yağmurun,
Qətrəsindən lö’löyi-şəhvar edən pərvərdigar.

Ənbiyalər bəxşinə yazduran ə’lan mərtəbə,
Mustafanı cümlədən muxtar edən pərvərdigar.

On iki mə’sumi-paki piş edən ümmətlərə,
Murtəzani heydəri-Kərrar edən pərvərdigar.

Lütf ilə əhvalinə qılgil Xətayinin nəzər,
Eşq içində valehi-didar edən pərvərdigar.

***

Şol mübarək zatına işim sənadır, ya nəbi.
Asiliğ bimarinə adın şəfadır, ya nəbi.

Ayağın toprağının qədrin nə bilsün hər kişi,
Kün-fəkan ol toprağa kəmtər bəhadır, ya nəbi.

Ol məqamin kim, mələk yetməz süqufi-nə’linə,
Ayağın altında ol bir xaki-padır, ya nəbi.

Qaldı sidrül-müntəha, keçdin fələkdən ta zəmin,
Kim yetər, bu qədri-həqqə müntəhadır, ya nəbi.

Ey günəş yüzlü, səni hər kimsə ki, həq bilmədi,
Danla məhşərdə anın yüzü qəradır, ya nəbi.

Çün sənin xoşluğuna yaratdı sane’ aləmi,
Ayağın toprağına canım fədadır, ya nəbi.

Hər münafiq kim, sana könlündə inkar eylədi,
Ta əbəd yanmağ cəhənnəmdə rəvadır, ya nəbi.

Həm sənin tə’rifin etdin, həm Əlinin ol ilah,
Nişə kim, sən Mustafa, ol Murtəzadır, ya nəbi.
Bu Xətayi xəstəyə qılgil şəfaət ruzi-həşr,
Çünki əslindən səninlən aşinadır, ya nəbi.

***

Qönçə tək lə’lini xəndan etdigin, yə’ni ki, nə?
Lalə tək bağrımı pür qan etdigin, yə’ni ki, nə?

Qarə zülfin ağ yüzün üstündə əfşan eyləyib,
Könlümi ğəmdən pərişan etdigin, yə'ni ki, nə?

Qılmağ içün tazə hüsnin bağın, ey sərvi-rəvan,
Gözümü kuyində giryan etdigin, yə'ni ki, nə?

Tökmək içün qanimi başim kəsib hər dəmbədəm,
Şəhsüvarım, əzmi-meydan etdigin, yə'ni ki, nə?

Aşiqin vəsl ilə bir dəm könlüni şad etməyib,
Bu xərababadı viran etdigin, yə'ni ki, nə?

Gülşən içrə cilvələnmişsən yenə gəşt etməgə,
Can quşun dutmağa seyran etdigin, yə'ni ki, nə?

Bitəvəqqüf hər bəla oxun ki, atsan hər yana,
Sən məni qarşuda qalxan etdigin, yə'ni ki, nə?

Gər yüz il kuyində can ver, meyli yox hər dəm sənə,
Ey könül, sən munca əfğan etdigin, yə'ni ki, nə?

Ayağın yüzində dirlik istədim mən, öl dedin,
Müşkilimni beylə asan etdigin, yə'ni ki, nə?

Dil quşuna daneyi-xal üstə dam etmiş saçın,
Yarəb, ani bəndi-zindan etdigin, yə'ni ki, nə?

Çünki qılurdun mana min tövr ilə cövrü cəfa,
Eşqini könlümdə mehman etdigin, yə'ni ki, nə?

Arizini zülfiniz birlən hicab edib müdam,
Ey günəş, yüzüni pünhan etdigin, yə'ni ki, nə?

Mehr ilə rəhm etməyübən, qəhr birlən öldürüb
Bəndəyə lütf ilə ehsan etdigin, yə'ni ki, nə?

İstəmişdin qətlimi, can müjdə verdim mərdana,
Gözü könülni peşiman etdigin, yə'ni ki, nə?

Ğönçə gül xəndan olub nərgislə susən bitməgə
Arizin bağin gülüstan etdigin, yə'ni ki, nə?

Pərdəsindən kəşf edüb ol vərdi-əhmər yüzini,
Bülbüli aləmdə dastan etdigin, yə'ni ki, nə?

Çünki can verməzsən, ey ömrüm, bu cansız cismimə
Suyi-lə'lin abi-heyvan etdigin, yə'ni ki, nə?

Vargil, ey badi-səba, ol ənbərəfşan, zülfə de,
Bu qəmər dövrində dövran etdigin, yə'ni ki, nə?

İstərəm gəldükcə ğəmdən qurtarasan rəhm edüb
Günbəgün dərdim firavan etdigin, yə'ni ki, nə?

Ləşkəri-eşqin çəkib üstümə hər dəm, dilbəra,
Xaneyi-könlümni talan etdigin, yə'ni ki, nə?

Xalların filfil, yüzün gül, ləblərin mül, ey snəm,
Xətlərini dəstə reyhan etdigin, yə'ni ki, nə?

Bəhrə döndü çövrəniz əşkimdən, ey ayinəru,
Göz yaşından böylə ümman etdigin, yə'ni ki, nə?

Seyr edərkən mürği-dil bağı-rüxində bənd edüb,
Ani dər çahi-zənəxdan etdigin, yə'ni ki, nə?

Çalmaq içün başımı top eyləyib meydan ara,
Hav edib zülfini çövkan etdigin, yə'ni ki, nə?

Çünki zülmətdən çıxarmaz könlümi şəm'i-rüxün,
Sən anı şəm'i-şəbistan etdigin, yə'ni ki, nə?

Mən gədayə çünki yoxdur rəhmin, ey can, eşqini
Könlümün təxtində sultan etdigin, yə'ni ki, nə?

Eydi-yüzinçün, şəha, müjgan oxilən canımı
Qaşların yayinə qurban etdigin, yə'ni ki, nə?

Mə’dəni-yüzündə bir höqqə dəxanındır dişin,
Ləblərin tərfini mərcan etdigin, yə’ni ki, nə?

Aldı zəmzəm Kə’beyi-vəslin səfasindən gözüm,
Tövfi-dil dərdinə dərman etdigin, yə’ni ki, nə?

Hər sütunin qəsri-baği-dildə can miqdarini
Nisbəti-hənnanü Mənnan etdigin, yə’ni ki, nə?

Bu Xətayi könlüni, ey nərgisi-cadu nigar,
Özünə sehr ilə heyran etdigin, yə’ni ki, nə?

***

Ey könül, kuyində mə’va qılduğun, yə’ni ki, nə?
İtlərin kuyində qövğa qılduğun, yə’ni ki, nə?

Sakin olmaq Kə’beyi-kuyində yegdir dilbərin,
Hər gərəkməz yerə pərva qılduğun, yə’ni ki, nə?

Qanlu yaşımnı yüzüm üstə rəvan edib müdam,
Razi-pünhanım hüveyda qılduğun, yə’ni ki, nə?

Könlümi qıldun müşəvvəş bir tükənməz fikr ilən,
Bu pərişan zülfi sevda qılduğun, yə’ni ki, nə?

Əşki-xunin bəhrə döndü çeşməsindən çeşmimin,
Subesu yaşımnı dərya qılduğun, yə’ni ki, nə?

Vəchin əyyamında bu bəxti-siyahimni, şəha,
Nibətini leyli-yəlda qılduğun, yə’ni ki, nə?

Hər dəm, ey Leyli nigarım, bəndəni Məcnun təki
Valehi ğəmginü şeyda qılduğun, yə’ni ki, nə?

İstədim kuyində can verəm, şəha, tə’xir edib,
“Innə ənhəlhüm rüveyda” qılduğun, yə’ni ki, nə?

Xaki-payində məni ədnadən ədna eyləyib,
Özüni ə'ladan ə'la qılduğun, yə'ni ki, nə?

Öldürüm derdin bu gün – danla məni, çıxdın xilaf,
Bilməzəm imruzü fərda qılduğun, yə'ni ki, nə?

Lövhi-dildə böylə təskin dapmış ikən qəmləri
Bir dəxi yenlədən inşa qılduğun, yə'ni ki, nə?

Çünki rəhmin yox məzarim üstinə bir daş edib,
Ey vəfasız ani tuğra qılduğun, yə'ni ki, nə?

Gül yüzün övraqini gülşəndə xəndan eyləyib,
Bülbüli-məhzuni guya qılduğun, yə'ni ki, nə?

Asmağ içün canımı bir qıl ilən, ey novnəhal,
Sərv tək qəddini peyda qılduğun, yə'ni ki, nə?

Çünki dildən yoxdurur meylin məni-dilxəstəyə,
Mərhəba əhlən və səhla qılduğun, yə'ni ki, nə?

Çak edib gün tək giribanini hər dəm gözünə
Sübhdəm yüzini peyda qılduğun, yə'ni ki, nə?

Çünki dövr etməz əyaği məclisi-üşşaq ara,
Ləblərin cami-müsəffa qılduğun, yə'ni ki, nə?

Qüdrətidir sanei-pakin, ona insan demə,
Sən ani manəndi-əşya qılduğun, yə'ni ki, nə?

Leyli zülfinin xəyali-eşqilən Məcnun təki
Məskənini kuhü səhra qılduğun, yə'ni ki, nə?

Səcdə qılmağçün dilərsən qaşları mehrabini,
Özünü sən əhli-təqva qılduğun, yə'ni ki, nə?

Valideynin mə'nisin yad eyləyib hər dəmbədəm
Cahidül-ləfzində fənna qılduğun, yə'ni ki, nə?

Ayağı tozunda ol sərvi-rəvanın, ey könül,
Vermək içün can mühəyya qılduğun, yə’ni ki, nə?

Sidrə birlən müntəhayə qəddini təşbih edib,
Qədrini “Vətturi-Sina” qılduğun, yə’ni ki, nə?

İstər idim qurtulam gəldikcə bir-bir qüssədən,
Günbəgün dərdim müsənna qılduğun, yə’ni ki, nə?

Eşigində binəvayə iltifatın kəm qılıb,
Hüsn ilən özüni qərra qılduğun, yə’ni ki, nə?

Ey Xətayi, xak ilən yeksan olub ol mah içün,
Əzmi-sevdayi-Sürəyya qılduğun, yə’ni ki, nə?

## *MÜREBBELƏR*

***

Xubların sultanısan aləmdə, var, xan ol, yürü,
Aşiqin canında cansan, var, acanan, ol, yürü,
Sən rəqibin məclisində şəm kimi yan, ol, yürü,
Könlümüzü bizə ver də, Misrə sultan ol, yürü.

Yerdə qalmaz çün biləsən, ey mələk, ahım mənim,
Yalqıza yardım edər: vardır Allahım mənim,
Bivəfalıq rəsmini əldən gedər şahım mənim,
Könlümüzü bizə ver də, Misrə sultan ol, yürü.

Neçə kərrə demədimmi gözləri ahu sana,
Bivəfalıq etməmək gərək idi canu sana,
Yürü, var ömrüm haman şimdən gerü yahu sana,
Könlümüzü bizə ver də, Misrə sultan ol, yürü.

Ya ilahi, bilməzəm kim, nolisər halım mənim,
Könlüm aldı, müslimanlar, şimdi bir zalım mənim,
Sevdigim, ömrüm, əfəndim, hey gülüm, balım mənim,
Könlümüzü bizə ver də, Misrə sultan ol, yürü.

Ey Xətayi, bulmadım bir yarü həmdəm dünyada,
Ahü vahi keçdi ömrüm, neyləyim, mən dünyada,
Sərv kimi sərkəş olasan haman sən dünyada,
Könlümüzü bizə ver də, Misrə sultan ol, yürü.

***

Və’deyi-vəsl edəli bir qılca qaldı canımız,
Göglərə irsə, iribdir, naləvü əfğanımız,
Yola baxmaqdan çıxıbdır dideyi-giryanımız,
Xanı, a zalım, səninlə əhdimiz, peymanımız?

Gülşəni-bağı-cinansan, eşq ola didarına.
Mən dəxi bir bülbüli-şuridəyəm gülzarına,
Yürü, ey yari-vəfasız, durmadan iqrarına,
Xanı, a zalım, səninlə əhdimiz, peymanımız?

Hər xaçan cami-şərabi-şiveyi nuş eylədin,
Etdigin qövlü qərarı həp fəramuş eylədin,
Çeşmi-məxmurinlə mən miskini sərxoş eylədin,
Xanı, a zalım, səninlə əhdimiz, peymanımız?

Al səhabi-ruyini hüsnin tək olsun hər zaman,
Mehr ilə dolsun, mənim mahim, əzminü asiman.
Söylədin könlüm alınca mənə min dürlü yalan,
Xanı, a zalım, səninlə əhdimiz, peymanımız?

Əbri-baran kimi ağlarkən Xətayi zar-zar,
Gözünün yaşı edərdi, durma, derdin aşikar,
Dün gecə kuyində oldum sübh olunca intizar,
Xanı, a zalım, səninlə əhdimiz, peymanımız?

## TƏRCİBƏND

Layi isqat eyləyüb bir bilməyən illasini,
Bilmədi nəfy ilə isbatın nədir mə’nasini,
Vadiyi-üsyanda qaldı, anmadı mövlasini,
Abi-tövhid ilə tahir qılmadı ə’zasini,
İçmədi bəzmi-ələstin badeyi-həmrasini,
Açmadı nuri-vilayət çeşmi-nabinəsini,
Görmədi gün türrəsindən leylətül-əsrasini,
Bulmadı rahi-yəqinin mənzili-ə’lasini,
Qabi-qövseynin yanıldı qürb ilə ədnasini,
Silmədi ayineyi-dildən qübari pasini
Müftiyi-eşq öylə vermişdir bunun fitvasini;
– Ya çək əl sərdən, ya gəl cinlətmə eşqin tasini.

Yox ikən kövnü məkanü sahilü ağü qara
Cuşə gəldi şövq ilə bəhri-məhəbbət ibtida,
Daşə çaldı şişəsin, etdi təməvvüc hər yana,
Sərbəsər əşyayi seyran eylədi çunü çəra,
Eşq Mənsurini gördü ol arada aşina,
Bir fəna abdal gəldi yanıma, dedi mana:
– Var fərağət guşəsin edən məqami-dilguşa,
K-oldüri darüş-şəfadır dərdməndanə dəva,
Ələmi-bəhri-təhəyyürdə gəzərkən binəva,
Guşimə girdi ğeyibdən bir nidavü xoş səda,
– Müftiyi-eşq öylə vermişdir bunun fitvasini;
– Ya çək əl sərdən, ya gəl cinlətmə eşqin tasini.

Şol zaman kim, bətni-ümdə nütfeyi-mədfun idik,
Əmri-bari ilə anda pərdeyi-pürxun idik,
Qətreyi-naçiz idik, müdğə uyuşmuş xun idik,
Kasəsin kəsr eyləmiş bir Leyliyə Məcnun idik,

Sərsəri idik əgərçi, talibi-biçun idik,
Sə’y ilə dəryayə irmiş bir düri-məknun idik,
Özümüz fərq etməyüb, dəm bəstəvü məhzun idik,
Kuhi-təndə sə’y ilə Fərhad ilə hamun idik,
Acizü zarü zəlilü müflisü mədyun idik,
Dəstgir olmasa bir kani-kərəm, məğbun idik,
Müftiyi-eşq öylə vermişdir bunun fitvasini:
– Ya çək əl sərdən, ya gəl cinlətmə eşqin tasini.

Adəmi-xakinin anladımsa tinü masini,
Batil inkari gedər, fəhm et xəyalın xasini,
“La’də qalma, sufiya, bil tövhidin illasini”,
Uyma şeytani-ləinə, dinləmə vəsvasini,
Yeni ğəmdən aça gör mir’ati-qəlbin pasini,
Dəxi əşk içrə bulasan mənzili-ə’lasini,
İbni-vəqt ol, alma dəhrin imruzü fərdasini,
K-o bu dün hümmət fənanin şurü şər qövğasini,
Göricək etsin gərək gərçəklərin də’vasini,
Anladınsa, əhli-eşqin sözünün mə’nasini,
Müftiyi-eşq öylə vermişdir bunun fitvasini:
– Ya çək əl sərdən, ya gəl cinlətmə eşqin tasini.

Aşiq ol, ol gül’zarın bülbüli-nalani ol,
Can verüb yolunda sidq ilə qulü qurbani ol,
Künci-ğəmdə dərdü möhnət mə’dənini kani ol,
Keç fərağət təxtinə, gəl aləmin sultani ol,
Ruzü şəb ol məhliqanın valehi heyrani ol,
Baqidir sanma fəna darin, haman mehmani ol,
Gər səadət küncini bulmaq dilərsən, fani ol,
Kuyi-fəqr içrə gədalıq mülkinin sultani ol,
Əhli-eşqin asitani babinin, dərbani ol,
Baş açıq meydani-eşqin soyunub üryani ol,
Müftiyi-eşq öylə vermişdir bunun fitvasini:
– Ya çək əl sərdən, ya gəl cinlətmə eşqin tasini.

Həmdlillah, irişib cananəyə can olmuşuz,
Sər verüb meydani-eşqə girib üryan olmuşuz,

Qətreyi-naçiz ikən dəryayi-ümman olmuşuz,
Fəxr edib dərvişligi aləmdə sultan olmuşuz,
Təkyeyi-fanidə bir qaç gün ki, mehman olmuşuz,
Də'viyi-xam etməziz, rahi-təəyyün bulmuşuz,
Ey bəradər eşq əsrarilə heyran olmuşuz,
Der isən kim, dəhr pirindən nəsihət almışuz,
Irişib feyzi-ilahi bizə, təslim olmuşuz,
Canü dil tərkin urub, meydani-eşqə gəlmişüz,
Müftiyi-eşq öylə vermişdir bunun fitvasini:
– Ya çək əl sərdən, ya gəl cinlətmə eşqin tasini.

Pərdeyi-pindardən keç aləmin sultani ol,
Hər gədayə şəfqət edib cani içrə cani ol,
Cövhəri-əqli-məaindən çəkər gəl kani ol,
Kuyi-eşqin sən dəxi bir başı açıq üryani ol,
Nə reyi-yahu ilə doldur cəhani fani ol,
Gah məstü gah əsrük bir məhin heyrani ol,
Can verib eşq ilə yolunda qulu, qurbani ol,
Baş açıq bir padşahın bəndeyi-fərmani ol,
Müftiyi-eşq öylə vermişdir bunun fitvasini:
– Ya çək əl sərdən, ya gəl cinlətmə eşqin tasini.

Vəsfi-yarə, ey Xətayi, söz demək şanımdadır,
Cilvələr qılmaq mənim təb'i-süxəndanımdadır.
Həmdəmim, həmməşrəbim dərdü bəla yanımdadır,
Yar içün ölmək mənim ayinü ərkanımdadır,
On səkiz min aləmin əsması divanımdadır,
Kainatın sabitati qəsrü eyvanımdadır,
On iki şahzadənin imlası pünhanımdadır,
Sayə salmış üstümə, mehri-dirəxşanımdadır,
Mustafanın ümmətiyəm, sevgisi canımdadır,
Həm Əliyyəl-Murtəzanın dərdi dərmanımdadır,
Müftiyi-eşq öylə vermişdir bunun fitvasini:
– Ya çək əl sərdən, ya gəl cinlətmə eşqin tasini.

## TUYUĞLAR

Ya Əli, canım sana olsun fəda,
Qulkəfadır şə'ninə həqdən nida.
Bu Xətayi könlünə qıldın nüzul,
Mərhəba, ey şahi-aləm, mərhəba.

Mustafa fəxri-cəhan, sən həmdəmi,
Zatunuz həm ləhmi anın həmdəmi.
Ey Xətayi, bil Əlidir, bigüman,
Qabi-qövseynin rümuzi məhrəmi.

Zati-həqq məfhumi-nəssi lafəta,
Qullara səndən gərək lütfü əta.
Bəndədən kəsmə inayətlən nəzər,
Bu Xətayi bir qulundur pür xəta.

Bu Xətayi bəndənin gör halini
Kim, yolunda qoydu başü malini.
Pürgünahəm, tə'nə qılma, zahida,
Bəndəsinin həq bilür ə'malini.

Mən Hüseyni məzhəbəm, şahın qulu,
Yə'ni kim, mə'nidir Allahın qulu.
Ey Xətayi, padşah olmaz kişi,
Olmayınca uş bu dərgahın qulu.

Zatın Allah məzhəridir, ya Əli,
Kibrü kin səndən bəridir, ya Əli.
Bu Xətayi qeysərü xaqanü Cəm
Qənbərinin Qənbəridir, ya Əli.

Sayeyi-xurşidi-sübhandır Əli,
Əhli-fəqrə şahi-mərdandır Əli,
Ey Xətayi, geymiş aslan kisvətin,
Laləkan qəsrində dərbandır Əli.

Ol Əlidir aləm ümmid olan,
Ol Əlidir dünyada təcrid olan.

Ol Əlidir, ey Xətayi, bixəta,
Dünyəvi üqbadə (həm) cavid olan.

Gər Əlinin mülki-insandır yeri,
Dər həqiqət ərşi-rəhmandır yeri,
Ey Xətayi, kimdə var mehri-Əli,
Rəhməti-həq, baği-rizvandır yeri.

Mən məvali məzhəbəm, rahım Əli,
Hacətim, zikrim, nəzərgahım Əli,
Oldu ənqa tək Xətayi bivücud,
Qafi-qüdrət, sirri Allahım Əli.

**RÜBAİ**

Ta badeyi-xoşgüvar var, ey saqi,
Ta vardır əlində ixtiyar, ey saqi,
Bir dövr elə kim, dövrü dolanmış dövran
Nə badə qoyar, nə badəsar, ey saqi.

**QİT'Ə**

Eşq dəryasında qəvvas olmasan mərdanəvar,
Keçmə namərd körpüsündən, qoy aparsın su səni.
Dün bənövşə seyr edə gördüm nihani gəşt edir,
Dilbərim əgninə geymiş bir qəbayi-susəni.

***
Sığın fəzli-həqə, ey talibi-rah
Ki, dost eşqin özünə eylə həmrah.
Təvəccöh qıl, təvəccöh ol kərimə,
Cəmali-ənvəri, zati-qədimə.
Təvəkkül qapusunda sən müqim ol,
Təriqi-eşq içində müstəqim ol.
Təfərrücəhli ol aləmdə sadiq,
Təhəyyür şö’leyi-didarə aşiq.
Hər iş kim, dutasan, eşq ilə dutgil,
Iki sanmaqlığı, ey can, unutgil.
Niyazmənd ol müdamyol içrə doğru
Ki, surət təbdil edib olma oğru.
Yəqin bil doğruluq dost qapusudur,
Həqiqət aləminin dapusudur.
Ola sidqilə kim ki, əhli-niyaz,
Yol içində ol ola saf şahbaz.
Kimin ki, olmasa üzrü niyazi,
Qəbul olmaz niyazi, həm nəmazi.
Özüni məskənət babində xak et,
Bu cismi mə’rifət abində pak et.
Ki, mənlik mənzilin məhv eylə daim,
Ola gör eşq ilə xidmətdə qaim.
Irə ta Fəzli-həqdən sana ən’am,
Düşə qəlbinə rəhmət feyzi-ilham.
Xəbərdar olasan həq canibindən,
Çıxar zati-şərifin kibrü kindən.
Irişə halinə eşqi-ilahi,
Ola canində daim dərdü ahi.
Dilində fəthü dövlət ola yahu,
Künüldə hikməti-yahu yamənhu.

Dilərsən kim, olasan əhli-tövhid
Ki, səndə qalmiyə bir şəmmə təqlid,

Könül saf ilə saf ol sadiqanə,
Səfa birlə həqiqət aşiqanə.
Qədimü layəzalü fərdü yekta
Ki, misli yox onun zatinə həmta.
Şəriki yoxdur anın zati hudur,
Mübərradır xamudan şöylə hudur.
Münəzzəhdir xamudan eyni-zati,
Vəli hər şeydə zahir mö'cüzati.
Ikilikdən bəridir zati-mütləq,
Kəmali-qüdrətinə söylə səddəq.
Özidir hər işə sərkarü me'mar,
Bu rəmzi anlagil, ey əhli iqrar.
Cəhani tarü mar etmək əlində,
Yenə bir dəmdə var etmək əlində.
Görünən, göstərən, gözdə görən ol,
Aparan, gətürən, alan, verən ol,
Dəxi kimdən görərsən munca işlər?
Öz işidir ki, işlər munca işlər.
Gəhi məzhər cəmalə, gəh cəlalə,
Əcəb sirdir bu sir, cəllə gəlalə.
Ki, həqdir səgdə çün zikrinə fikrin,
Kəlisa, məscidü küfrinə küfrin.
Kim, oldur hər işin eynində mövcud,
Özidir cümlə məxluq içrə mə'bud.
Bəhanədir vəleykin işi xəlqə
Ki, qulağda bu pəndi eylə həlqə.
Onun hikmətlərinə qüdrəti çox,
Nə deyim, binəhayət, payani yox.
Təriqi-əhli-hal bir özgə haldır,

Qalanı yüz elə çox qeylü qaldır.
Kim, ol tövhid məqamidir bu yollar,
Bu yoldan çıxanı yol əhli yollar.
Həqiqət içrə gər var gənc, özidir,

Deyilən dildə xami öz sözidir.
Vəli sitri-ədəbdür görmək andan,
Bəşər fe'lini, yə'ni bilmək andan.
Çıxarma pərdədən dışra bu sirri,
Eşid, ey seyr edən bəhr ilə bərri.
Keçit gözlə, sağın keçəm bu bərri,
Deyü naməhrəmə açma bu sirri.
Məqami-heyrət içrə eylə seyran,
Divanə, əsrükü sərməstü heyran.
Olasan ta kim ol didarə məhrəm,
Visali-həzrəti – dildarə həmdəm.
Əzəldən bir məsəldir kim, demişlər,
Təriqət pirləri şəkkər yemişlər.
Zahirin nə isə batinin oldur,
Zahirdən batinə dos-doğru yoldur.
Nəzər eylə həqin hikmətlərinə,
Təaləllah, zəhi qüdrətlərinə.
Yaratdı canını uş bu nəfəsdən,
Muni bil çıxmadın sən bu qəfəsdən.
Ki, bir gövhərdurur əşyanın əsli
Ki, onun mə'dənü mənbəü nəsli.
Ki, hər kim dürr ilədir kani-gövhər,
Nə gövhərdür həqiqət həqqə məzhər?
Cəhan qətrə onun bəhri yanında
Ki, qərq olur əqillər payanında.
Vəli qətrə dögil dəryadən ayri,
Ulaşıcaq bir olur, sanma qeyri.
Əlünə alıcaq bir saf ayinə,
Yenə oni görərsən hər ayinə.
Görünən güzgüdə həm öz cəmalın,
Dəxi nədir sana səndən xəyalın?
Yaxın bax kim, sana səndən yaxındır,
Irax baxma sana səndən sağındır.
Yüzündəvü sözündəvü gözündə
Özidir can olan, ey can, özündə.
Xamuya dövr edən bir dövri-həqdir,
Özin bilənə bu yaxşı səbəqdir.

Bu mə’ni hər kimin həqqi degildir,
Ki, hər oxici lafəqqi degildir.
Əgər seyr edəsən uş can elini,
Sərayi-gülşəni-canan elini,
Kim, özi canə can olmuş bu canə,
Nihani gəşt edər xanə be xanə.
Yəqin ayru degildir kəndudən can,
Ki, bir mə’nidədir dəryavü ümman.
Günəş zərrəvü həm zərrə günəşdir,
Özinə özini, ey can, ulaşdır.
Bu cismi eşq ilə can eylə rövşən,
Ki, zülmət rəf’ olub cism ola rövşən.
Kimin ki, eşqi yox, varma yanınca,
Keçər fürsət o bu eşqə yanınca.
Ki, ol eşq ilə sərməstü divanə
Ona yoxdur qələm, varsa divanə.
Yeri, eşqi özinə pişə eylə,
Yetər uzaği fikr əndişə eylə.
Bu dəmi xoş gör, ey can, həqqə şükr et.
Bu fikrin tərkin et, var, özgə fikr et.
Niyə gəldin, nə götürdün cəhanə,
Nə iltərsən axirət cavidanə?
Nə idin aləmi-vəhdətdə söylə,
Bu kəsrət evinə düşdünmi böylə?
Muni bildün isə irdün məqamə,
Axirət mənzili darüssəlamə.
Muni sən istə bir əhli-nəzərdən,
Verə lütf eyləyüb gizlü xəbərdən.
Əlində var ikən bir ixtiyarlıq
Həqqin aşiqləriylə eylə yarlıq.
Əlini alalar bir dar məhəldə.
Gərəkdir ancalayın yar məhəldə.
Yaram deyən çox olur munda, ey yar,
Sağın, hər yetənə aldanma, zinhar.
Kimi sevsən, həm onunla qoparsan,
Onu kim, canü dildən sən taparsan.
Uzaqdır mənzilin azuq qazangil,

Yetər bu dünya mülkinə uzangil.
Xəyali-eşq özünə həmdəm eylə,
Anınla xoş səfa sür həm dəm eylə.
Hər an canda ki, ola eşq xəyali,
Degildir haldan ol hal içrə xali.
Olur bu eşq ilə can həqqə vasil.
Ki, eşqi olmıyan candan nə hasil.
Təşəbböh eylə, ey can, xanədanə,
Yolunda qalma onun cismü canə.
Cəmali-Mustafayə ver səlavat,
Olasan cümlədən sağü səlamət.
Ibadətlər başıdır, ey qarındaş,
Səlavat eşq ilə gər ola yoldaş.
Kimin eşqinə yaratdı cəhani,
Budur eyni-ibadət tani ani.
Təvəkkül qıl təfəkkür ilə idrak,
Nədür ol aləmi-mə'nidə lövlak.
Məhəmməd ümməti qalmaz damuda,
Səlavət ver, canın yanmıya oda.
Ona ixlas ilə ümmət ola gör,
Ona münkir olanın gözləri kor.
Həqin dostunu bilgil dost olasan,
Şaha ulaşuban peyvəst olasan.
Kimin əlindədir bu cümlə aləm,
Bu hikmətə ulaşur gerçək adəm.
Nəbi me'racə çıxdı, kimi gördi?
Məqami-müntəhadə kimə irdi?
Yol üstündə duran aslani gördi,
Çıxardı yüzügini ona verdi.
Dedi ki, aramuzda bu nişanə,
Bu sözümə məvalilər inanə.
Munu fəhm eylə ki, özgə xəyaldır,
Xəyal içrə, vüsal içrə məaldır.
Dəxi sir var deyilməz xəlq içində,
Yenə söz var deyəsi xülq içində.
Yeri şaha müdam könlün açılsun,
Lətif söylə dilindən dür saçılsun.

Ki, dəgmə kimsə olmaz şaha məqbul,
Nişan göstər ki, olasan şaha qul.
Nədir, söylə mana, şahin nişanı?
Əgər mö'min isən sən şahi tanı.
Kimin əmrilə çizginir fələklər?
Ona səcdə elər gögdə mələklər.
Mürüvvətü kərəm, lütfü səxavət
Nişani şahın, ey əhli-səadət.
Həsən-Hüseyni sev candan həmişə,
Zəhi dövlətlü can şahə buluşə.
Əli, Zeynəlibad, Baqirü Cə'fər –
Olardır mö'minə mürşidü rəhbər.
Musa Kazım, Əli, Musa Rzayə,
Rza vergil yəqin ali-əbayə.
Təqiyyü ba Həqi şah əskəridən,
Ola görgil imamlar gövhəridən.
Irişdi və'deyi-əhdi-Məhəmməd,
Zühur edə özün məhdi-Məhəmməd.
Bu on iki imamə qıl e vallah.
Əgər mö' min isə yarıcın Allah.
Yəqin oldu çıxa sahib zəmanə,
Vilayət ləşgərilə xanədanə.
Ədlamətlər göründi cümlə əhval,
Ki, təbdil görünür qövl ilə əqval.
Cəhan əksinə döndi, ey bəradər,
Dilər div ola insanə bərabər.
Xaçan dürüst ola bu xam xəyallar?
Yaxışmaz yol içində uş bu hallar.
Bu bikar iyəsi mülkini gözlər,
Görər bu mə'nini işıqlu gözlər.
Zühur olmaz cəhan qarışmayınca,
Bu aləm cümlə küfrə düşməyincə.
Yenə oynayə şahin zülfiqari,
Müti ola onun əmrinə vari.
Gəl imdi bir dəxi söhbəti dinlə,
Qulax dut bu sözün mə'nisin anlə.
Edərsən mundan axır seyran onda,

Nə köşkü təxt yaparsan yə’ni munda?
Yükün zülm isə arxandan buraxgil,
Təfərrüc eyləyib didarə baxgil.
Irəsən mənzilə oynayə, gülə
Ki, şəklin bənzəyə gülşəndə gülə.
Bu dünya möhnətin vəhdətə dəgşür,
Özüni sidq ilə sən şaha dapşur.
Həqi ərdən, əri mö’mindən istə –
Budur pəndim sana şikəstə bəstə.
Ərə yetən həqə yetər, yəqin bil.
Əgər talib isən bu rəmzi bilgil.
Bil ol can kim, həqiqət pirimizdir,
Yolunda təslim ol, əmirimizdir.
Əgərçi qətreyi sudan yaratdı,
Vəli öz eşqini ona yar etdi.
Bevəz’ullah, qılgil sən sücudi,
Münəvvər eyləgil uş bu vücudi.
Zəhi surət muni canlar göricək,
Yanınca sürünür, olur salicək,
Gərkdürür sana hər işdə tə’zim,
Mələk adəmdən alur elmü tə’lim.
Könül gözilə bax, didar görəsən,
Necə bir sən dərü divar görəsən.
Nə kim vardır bu surətdə göründi,
Təcəlla şövqini munda gör indi.
Ki, munda görmiyən can onda görməz,
Qalur ol vəslini, cananə irməz.
Bu vəchin təfsiri Tövratü Incil,
Edərlər oni fürqan əhli tə’vil.
Şəriət və təriqət yollarıdır,
Ki, mə’rifət, həqiqət hallarıdır.
Budur bu dört kitabın mə’nisi həm,
Özün bilüb olsan yolda möhkəm.
Yəqin əhli yanında yol birikdi
Ki, münkirlər bu dərgahdan sürükdi.
Mürid oldur ola əhli-iradət,
Hər işdə var ala pirdən icazət.

Haram edə yuxusun dost aduna,
Yana pərvanə tək eşqin oduna.
Təriqi-övliya bir doğru yoldur,
Yetər hər yetənə kənduni yoldur.
Əgər olmaz isən bu yolda gerçək,
Vilayət süfrəsindən sən əlin çək.
Kərəm kani Əlidən, haşalillah,
Xaçan öz çakərini edə gümrah?
Mühibbi-şah olan möhnətdə qalmaz,
Çıxar aydınlığa, zülmətdə qalmaz.
Calanma dört yana, bağlan Əliyə,
Ərənlər sərvəri, şahi-vəliyə.
Mizan, tərazu, sorğu, həşrü məhşər,
Əli əlindədir filcümlə yeksər.
Keçirən ol siratül-müstəqimi
Anın ümmətidir əzəl qədimi.
Vilayət şəhrinin qədri Əlidir.
Həqiqət bəhrinin dürri Əlidir.
Yedi damu, səkiz cənnət nişani
Xamusi səndədir anla bəyani.
Vücudundan gedər damu sifatin,
Yaman xudur birax əldən bəratin.
Sifati-əhli-cənnət yaxşı xudur,
Ki, xuyi yaxşı olan bəxtludur.
Kəmal əhli ilə olgil müsahib
Ki, ondan mə’rifət kəsb et əcaib.
Özünbilməz ilə durma, oturma,
Ömür zaye keçər, əqlin itirmə.
Qoma şah damənini daim əldən,
Yapış silsiləsinə canü dildən.
Kimin ki, mə’ni içrə zati yoxdur,
Çürükdür sözünün bünyadi yoxdur.
Yəqin sidq aşiqin sərmayəsidir,
Bu rəmzi bil ki, ol can ayəsidir.
Iman əhli isən, ey can, vəleykin,
Ki, cismü canü dildə dutmagil kin.
Budur sözüm sana, məndən əmanət,

Könül yıxma, vəli eylə imarət.
Dəxi yoldaş ilə qonşunu gözlə,
Ki, xəlqin eybini sən açma, gizlə.
Yoldaş oldur rəhm edə yoldaşinə,
Yoldaşın uğratmıya yol daşinə.[1]
Xamu fəzli-həqə oldu betovfiq,
Ola taliblərə həq yolu təhqiq.
Xamu əməldən əfzəldir bir insaf,
Həqin öz evidir olsa könül saf.
Həqin ol həqliği həqqi həqiçün,
Ki, fəzli-zati-mütləqi həqiçün,
Cəmali-pərtövi-şövqi həqiçün,
Kəmali-qüdrəti-eşqi həqiçün.
Kəmali-ismi-əsmasi həqiçün,
Həm ol ismül-müsəmmasi həqiçün.
Müsəlla, ərşü fərş naxış həqiçün,
Həm ol gögdən enən yağış həqiçün,
Imam Həsən şəhid canı həqiçün,
Tökülən şah Hüseyn qanı həqiçün,
Ənəlhəq söyləyən Mənsur həqiçün,
Şəhidlər üstə düşən nur həqiçün,
Ki, üçlər, yedilər, qırxlar həqiçün,
Bu vala qövmi-sərməstlər həqiçün,
Səfa əhli sufü safi həqiçün,
Ənəllah əhli insafi həqiçün,
Ki Rum abdalları sidqi həqiçün,
Xorasan pirləri nitqi həqiçün,
Nihan dərvişlərin sirri həqiçün,
Bu yolda pirlərin sirri həqiçün,
Aşiqlər atəşi-ahi həqiçün,
Ki, təsbihi-səhərgahi həqiçün,
Müdam çağırduğun ol şah həqiçün,
Hacat qəbul olan dərgah həqiçün,
Suçum bağışla şahi-Kərbəlayə,
Qamu aşiqlərə şah övliyay,

---

[1]Bu beyt ayrı ölçüdə yazılmışdır. Ola bilsin ki, artırmadır.

Qəbul et bu duayi, ya ilahi,
Ki, sənsən cümlə aləm padşahi.
Nə ərbabəm, nə zahid, xaki-payəm,
Behəmdullah ki, dust eşq ilə bayəm.
Ğənidir lütf iyəsi padşahim,
Ümidgahim, şahım, püştü pənahim.
Nəsihətnamə yazdım dərvişanə,
Cəhanda olmaq içün bir nişanə.
Təvəccəh qıl, təvəkkəltü ələllah,
Qulaq çəkdim, dedim ərənlərə şah.
Həqin fəzlinə bağlandıq əzəldən,
Təmənnamız didardır ləmyəzəldən.
Xətayi dərdməndəm bir kəminə,
Ancaq hu dəniz şahın dəminə.

***

Ba ismi-ilahü fərdi-yəzdan,
Rəhmanü rəhimü heyyi-sübhan
Hər karını, ey dil ibtida qıl,
Çün əhdə bəli dedin, vəfa qıl.
Ta hər bir işin yetə kəmalə,
Şükr eylə cəlili-zülcəlalə.
Vird eylə sənayi-Mustafanı,
Zikr eylə kəmali-Murtəzanı.
Ta ola işin dürüstü kamil
Əz fəzli-əimmeyi-əfazil.
Bəs söylə nə boldu həsbi-halın?
Dil şadlığın, ğəmü məlalın?
Eşq əhlinə ta ki, pənd bolsun,
Bəzm əhli ara pəsənd bolsun.

Tövhidi-həqq

Allah kərimü ləmyəzəldir,
Zati əbəd oldu, həm əzəldir.
Var etdi cəhani yox ikən ol,
Kimsə bulamaz bu sirrə heç yol.
Nuri-nəbidən yaratdı qəndil,
Qıldı nəzər ona neçə min il.
Kəsb etdi kəmali ol nəzərdən,
Ol dürri pür etdi bəhrü bərdən.
Su boldu həyadən ol cəvahir,
Dutdu qamu fövqü təxti vafir.
Yaratdı gögi təfindən anın,
Xəlq etdi yeri kəfindən anın.
Qüdrət qələmilə yazdı kafi,

Ol kafə ulaşdı nuni-safi.
Bəs gəldi vücudə kün fəkan həm,
Xətm oldu zəman ilən məkan həm.
Fövq oldu məqami-ərşi-ə’la,
Təxt oldu məqərri-ərzi-süfla.
Ol boldu mələklərin məkani,
Bu oldu məqami-insü cani.
Çün bunlara əqlü dil verdi,
Qur’anı bizə dəlil verdi.
Zatından anın nişan bilələr,
Bir olduğunu əyan bilələr.
Cənnəti yaratdı rəstkarə,
Damunu düzəltdi əhli-narə.
Munun həvəsindən ola taət,
Anın xətərindən ala heybət.
Fikr eylə kəmali-qüdrətin gör,
Yad eylə həkimi, hikmətin gör.
Bir gəz nəzər etdi müşt xakə,
Bəs boldu qəfəs bu mürği-pakə.
Bəxş etdi könül ki, qıla fikrin,
Lütf etdi zəban ki, edə zikrin.
Göz verdi ki, ta bəsir olasan,
Doğru gedəsən bu haq yola sən.
Eşitməgə səm’ü guş verdi,
Fəhm etməgə əqlü huş verdi.
Elm olmaz isə bularə təhsil,
Heyvan der anıvü əvvəlin bil.
Toprağə bitürdü dürlü əşcar,
Hər bir şəcər üstə bitdi əsmar.
Hər biridə bir kəmalü ləzzət,
Lövnü nəzərü təriqü heybət.
Daşdan çıxarur zülal suyi,
Görsətdi zi nafə müşk buyi.
Qan içrə bitürdü şiri-şirin,
Qıldı be kərəm cəhanizərrin.
Gər qılmaz isən bu ne’mətə şükr,
Vər etməz isən bu ne’mətə fikr,

Bəs bil ki, yəqin zəlalət etdin,
Həq nemətünün həqin unutdin.
Ol xacəyə, bil ki, qul degilsən,
Həq dərgəhinə qəbul degilsən.
Allah deməyən təriqə getdin,
Şeytani-rəcimi rəhbər etdin.
Bu yolda imami rəhbər etgil,
Bu zikri həmişə əzbər etgil.

Zikri-tələbi-rəhmət
*(Bağışlanılmağını istəmək haqqında)*

Yarəb, bizə bağışla tövfiq,
Nə rahi-məcazi, bil ki, təhqiq.
Iman ilə qıl dilimni məqrun,
Zikrinlə sözümni eylə mövzun.
Mən bəndeyi-acizəm, günəhkar,
Olmadı işim becüz günəh kar.
Sən fəzli-əmimü pür kərəmsən,
Qıl fəzl edübən mana kərəm sən.
Çün mö'tərifəm yüküş günahə,
Qəhr eyləməgil bu ru siyahə.
Gər bəndədə var bəsi cərimə,
Dutarmən ümidi sən kərimə.
Latəqnətü boldu əmrin, ey həq,
Ümmid neçük kəsəm mühəqqəq.
Hər qüdrətə var hezar fikrim,
Hər ne'mətə var hezar şükrim.
Bir ol ki, ədəmdən eylədin var,
Verdin kərəm ilə əqlü göftar.
Bir ol ki, inayət etdin iman,
Bildik səni, ey kərimü dəyyan.
Lütf eylə nişaneyi-kərimi,
Görsət bizə rahi-müstəqimi.
Bir yaxşı məta' əlimdə yoxdur,
Səndə kərəm ilə lütf çoxdur.
Kəsmə kərəmin bu binəvadən,

Ayırma livayi-Mustafadən.
Kim, xoşluğuna düzəldi aləm,
Əflakü mələk, zəminü adəm.

*Dər nə'ti-rəsul*

Ol şəm' ki, nuri-ənbiyadır,
Ol nur ki, mahi-övliyadır.
Dedi ana heyyi-sanei-pak:
Lövlak lima xilqətül-əflak.
Müştaqi anın qamu peyəmbər,
Mə'muri anın mülukü Səncər.
Ol izi türabi-qürrətül-eyn,
Ol mayə məqami-qabi-qövseyn.
Ol qıldı münəvvər afitabi,
Şəqq etdi əlilə mahtabi.
Kafir dilədi dəlili-tövzih,
Rik etdi anın əlində təsbih.
Çün badi-səhər pəyamə gəldi,
Ahu yügürüb səlamə gəldi.
Qəsd etdi ana çü xəsmi-bədxu,
Şəhd oldu anın önündə ağu.
Gül verdi anın düri-sifatın,
Qumrular oxudu mö'cüzatın.
Daş mö'cüzü birlə dilə gəldi,
Həm sayəsi nuri bilə gəldi.
Ayağı basan yer oldu sər tac,
Cövlani-Buraqi suyi-me'rac.
Tə'n etdi fələkdə mehrü ayə,
Salmadı vücudi yerə sayə.
Din ləşkərinə himayət etdi,
Həq yolu bizə hidayət etdi.
Öz ümmətini qılıb güzidə,
Oldu dü cəhanda nuri-didə.
Həm şə'ninə münzəl oldu Qur'an,
Qərq eylədi küfrü, oldu fürqan.
Çün xətmi-dəlili rövşən oldu,

Əşcar əgildi, səcdə qıldı.
Nur etdi yeri yüzi çırağı,
Pür etdi saçı qamu dimağı.
Ol şəb ki, yeridi suyi-cəbbar,
Cəbril önüncə ğaşiyədar.
Həq həzrəti saru yol varanla,
Rəfrəflə töküldü səndəs anda.
Xətm oldu cəmin-ənbiyadə,
Oldu mələkut ana piyadə.
Ruhül-qüdüs oldu ğaşiyədar,
Keçdi yedi gögləri səbəbkar.
Nə’lini-xücəstə basdı ərşə,
Nuri-rüxi doldu ərşü fərşə.
Gər cümlə peyəmbər etdi mö’ciz,
Mö’cüzdə qamuni qıldı aciz.

Dər mənqəbəti-şahi-mərdan əli
*(Əlinin tə’rifi*)

Ol şah ki, məzhəri-xudadır,
Həqdən kim anı deyər cüdadır.
Cümlə səbəqaldı övliyadən,
Piş oldu kəmalı ənbiyadən.
Məqsudi-cəhan cəmin sənsən,
Ey gövhəri-pak, sən nədənsən?
Adəm nə bilür həqiqətini,
Bilməz çü mələk təriqətini.
Gəldi süvəri-vücudə həq sən,
Həq səndə zühur, eyni-həqsən.
Ey sirri-hidayətü vilayət,
Bu bəndənə qıl kərəm inayət.
Qədrin ki, göründü müntəhadə,
Ərş oldu çü kürsi üstivadə.
Məzduti-yəqin məqami səndə,
Cəbrili-əmin kəlami səndə.
Ruhül-qüds oldu ismi-zatın,
Münkir nə bilür nədir sifatın.

Həm səndə bulundu ismi-ə’zəm,
Həm səndə göründü ruhi-Adəm.
Tiğində yazıldı sətri-lolak:
Lövlak lima xilqətül-əflak.
Dərya qamusı mürəkkəb olsa,
Katib mələkut mürəttəb olsa,
Yazmaya olar qamusı vəsfin,
Həqdən həq olur nəsibü qismin.
Könlün sənin oldu bəhri-qüdrət,
Ol bəhr ki, oldu mövci rəhmət.
Ayırma həqiri rəhmətindən,
Dur eyləmə şükri-ne’mətindən.
Mən tək sana bəndə ola bihəd,
Kəmtər zi kəmin, ğulami-biəd.
Lütf eylə fəqirə, ya ilahi,
Əzl eyləməgil bu rusiyahi.
Kuhi-kərəmü livayi-rəhmət,
Dəryayi-fütüvvətü mürüvvət.
Çün nuri-zəminü asimansan,
Məqsudü muradi-kün-fəkansan.
Təndir bu cəhan, içində sən can,
Yalğuz nə can ki, cani-canan.
Sən məzhəri-lütfi-həqsən, ey şah,
Ol bəndələrin işindən agah.
Çox rəhmətinə ümidvarəm,
Kim var dəxi, bəndə kimə varəm?
Gər məqbul isəm, məni qəbul et,
Həq dərgəhinə kəminə qul et.
Vər müdbir isəm, həman səninəm,
Gər yaxşı və gər yaman səninəm.
Heç yox mənim əlimdə nəstə,
Biçarə qulam şikəstə bəstə.
Sən şahi-kərimi-pür kərəmsən,
Ümmidi-əmaimü üməmsən.
Həqqin sağ əli sənin əlindir,
Allah yolu sənin yolundur.
Həq yoldan azıtma, ya ilahi,

Kim, sənsən iki cəhan pənahi.
Həq gördü nəbi beşəkli-ərslan,
Yeddinci fələkdə sizni dərban.
Kəsmə nəzərin bu natəvandan,
Ayırma məni ol asitandan.
Sənsən yaradan bu xasü ami,
Küstax demən dəxi kəlami.
Ey nuri-xuda, çırağı-aləm,
Qoyma məni zülmət içrə qaləm.
Ey iki cəhanın afitabi,
Var eylə çü zərrə mən türabi.
Qıl baqi məni fəna yüzündə,
Sən həqsənü mən xəta yüzündə.
Sən kani-mürüvvətü ətasin,
Bağışla Xətayinin xətasin.

Mürəbbe

Şah iki cəhanın əfzəlidir,
Allahın əli anın əlidir,
Ol söz ki, zəmanə heykəlidir,
Allahü Məhəmmədü Əlidir.

Olmağ diləsin işin mülayim,
Olgil Əlinin işinə qayim,
Kim, əhli-həqin dilində dayim
Allahü Məhəmmədü Əlidir.

Ol sirri-vilayətü kəramət,
Sahibhünərü düri-vilayət,
Həqqi sevənə qılan himayət
Allahü Məhəmmədü Əlidir.

Gər dilər isən olasan adəm,
Xəlq içrə sözün ola mükərrəm,
Yad et ki, duayi-ismi-ə’zəm:
Allahü Məhəmmədü Əlidir.

Övqati-cəmadü virdi-heyvan,
Bər ruyi-zəminü çərxi-eyvan,
Təsbihi-mələk, duayi-insan
Allahü Məhəmmədü Əlidir.

Səhradə zəbani-hər giyahi,
Dəryadə həmişə zikri-mahi,
Hacət diləyəndə, ya ilahi,
Allahü Məhəmmədü Əlidir.

Murü məgəsü tüyurü zənbur,
Hüşyarü divanə, məstü məxmur,
Hər şamü səhər dilində məzkur
Allahü Məhəmmədü Əlidir.

Əsrari-məqami-qabi-qövseyn,
Gözlərdə rəvaqi-qürrətül-eyn,
Dillər diləgi, muradi-kövneyn
Allahü Məhəmmədü Əlidir.

Hər şey ki, yaratdı dər du aləm,
Adəm dəmidin be dövri-xatəm
Zikrində həmin səbahü əxşəm
Allahü Məhəmmədü Əlidir.

İqbali-üməm, kəmali-taət,
Ənvari-hüda, çirağı-dövlət,
Miftahi-kəlid, babi-cənnət
Allahü Məhəmmədü Əlidir.

Yazıldı vəlilər adı üstə,
Həm zülfiqarın poladı üstə,
Cəbrili-əmin qanadı üstə
Allahü Məhəmmədü Əlidir.

Mö’mində nihadi-əsli-iman,
Həm dəf’i-bəlayi-şərri-şeytan,

Həqdən səbəbi-nüzuli-fürqan
Allahü Məhəmmədü Əlidir.

Qalxani-qəza-zəmani-möhlət,
Tiği-kərəmü kəmani-nüsrət,
Ümmidi-cəhan, şəfii-ümmət
Allahü Məhəmmədü Əlidir.

Həm mö’təkifin könüldə fikri,
Həm sufilərin dilində şükri,
Həm qazilərin qəzadə zikri
Allahü Məhəmmədü Əlidir.

Mö’minlərə yarü ğəmgüsari,
Üsyan qışının gözəl bəhari,
Ərşin dirəgi, yerin qərari
Allahü Məhəmmədü Əlidir.

Başlarda hümayi-taci-dövlət,
Mərvanə bəla, Yəzidə lə’nət,
Həm qazilərin qolunda qüvvət
Allahü Məhəmmədü Əlidir.

Fəxrü şərəfü nüfusi-əyyam,
Zikrü həvəsi-xəvasü ə’vam,
Nəqşi-ələmi-dəvazdəh imam
Allahü Məhəmmədü Əlidir.

Mətlubi-ibadətü şəriət,
Məzmuni-iradətü təriqət,
Məqsudi-həqaiqü həqiqət
Allahü Məhəmmədü Əlidir.

Musayə mədəd qılan əsanı,
Həm Xızra həyati-cavidanı,
İsa dəmi, Nuh kəştibanı
Allahü Məhəmmədü Əlidir.

Yəqubi ğəm ilən ağladan zar,
Yusifə verən cəmali-rüxsar,
Həm odu qılan Xəlilə gülzar
Allahü Məhəmmədü Əlidir.

Qəmxari-əmanü hövli-məhşər,
Əllər dutuban siratə rəhbər,
Mizanda ağır, behiştə yavər
Allahü Məhəmmədü Əlidir.

Şəh qullarının ümidgahı,
Dünya bilə üqba padşahı,
Biçarə Xətayinin pənahı
Allahü Məhəmmədü Əlidir.

*Fi zikri-əsmai-əimme*

Övsafi-əimmeyi-məfaxir,
Ümmət olarunla boldu faxir.
Ol nur ki, adı Mustafadır,
Kövneyi ümidi Murtuzadır.
Bəs nuri-həsən livayi-ədyan
Kani-kərəmü dili-rizadır.
Fəxri-şühəda Hüseyni-məqtul,
Məzbuhü şəhidi-Kərbəladır.
Bəs zini-zəmanə Abidin şah
Dər cəm'i-əimmə müqtədadır.
Baqir sifət ol imam Məhəmməd
Kim, doğru imamü pişvadır.
Bəs Cə'fəri-sadiq, ol dili-sidq
Ba fəzlü ülum mühtədadır.
Bəs Musa gəlür, sifatı Kazim,
Nuri-kərəmü dəmi-xudadır.
Bəs Musiyi-ben riza ki, dər din
Safi dilü şəm'i-əsfiyadır.
Bəs gənc Təqi Məhəmməd, ol kim,
Dər mülki-əimmə müttəqadır.

Bəs kani-Təqi Əliyi-Nəqi
Məcmuyi-cəhanə rəhnümadır.
Bəs şah Həsən, sifatı Əskər,
Ədyanü miləldə padşahdır.
Bəs xətmi-zəman Məhəmmədi-din
Kim, Mehdiyi-mülki-ənbiyadır.

Sifəti-gülşəni-bahar
*(Bahar güllüyünün təsviri*)

Qış getdi, yenə bahar gəldi,
Gül bitdivü laləzar gəldi.
Quşlar qamusu fəğanə düşdü,
Eşq odu yenə bu canə düşdü.
Yer geydi qəbayi-xizrpuşan,
Cümlə dilə gəldi ləbxəmuşan.
Sərvin yenə dutdu damənin su,
Su üstə oxudu faxtə gu-gu.
Ğönçə dəhəni çəməndə xəndan,
Gülmaxdan ənar açıldı dəndan.
Bülbül oxudu sifati-hicran,
Dəryadə dür oldu əbri-neysan.
Durna uçuban həvayə düşdü,
Laçın aluban ovayə düşdü.
Alma ağacı dibində sayə
Tə’n eylər did bulutda ayə
Yaşin yerə tökdü əbri-neysan,
Bülbüllər oxudu səd hezaran.
Mey bəslədi jalə hər vərəqdə,
Türrac kitab oxur təbəqdə.
Qum-qum der idi ağacda qumri,
Məst oldu bənövşə içdi xəmri.
Şax üstə qabaqlar hali,
Qu gərdənindən verür misali.
Quş beççələri ünü yuvadən
Məktəb ünü tək gəlür həvadən.
Boyandı zəmin hezar rəngə,

Övraqi-şəcər də təngə-təngə.
Nilufər açıldı, suyə girdi,
Pirahənini başına sardı.
Çinar əlini çü rəqsə açdı,
Gül xurda zərin şəbaşə saçdı.
Çaylar bulandı, yıxdı arxın,
Bağlar ağacı göğərtdi şaxın.
Gilas ağacı dibində mahüm,
Çün mah idi dər miyani-əncüm.
Yüz dürlü qəba geyib çəmənlər,
Ağ donunu geydi yasəmənlər.
Şax üstə şükufeyi-şəcərlər
Musa əlidən verür xəbərlər.
Sirabi gülün yüzündə abi,
Nərgis oturur gözündə xabi.
Hər ğönçədə vərdi-ərğəvani,
Qumri gözüdən verür nişani.
Ta çalmaya dan yeli tapınçə,
Yüzinə niqabın örtdü ğönçə.
Yaşıl çəmən üstə jalə çin-çin,
Əxzər fələk üstə rəşki-Pərvin.
Sərv etdi çəməndə sərfərazi,
Gül cilvələnir başında nazi.
Çıxmış budağ üstə əndəlibi,
Mənbərdə oxur çəmən xətibi.
Cular axadır çəməndə hər su,
Nərgis gülünün gözündə uyxu.
Lalə oturur başında taci,
Heç sərvərə yoxdur ehtiyaci.
Sünbül daramış başın be şanə,
Ənbər qoxusun qılur fəşanə.
Cular axadır kənari-bağdan,
Su içməgə ahu gəldi dağdan.
Lalə gecələr yaxıb çirağı,
Aşiq cigərinə çəkdi dağı.
Naz ilə bəzəndi bağ sərvi,
Sancıb başına dümi-təzərvi.

Güllər vərəqinə doldu şəbnəm,
Çün birgeyi-hövzi-abi-zəmzəm.
Al ilə yaşıl geyindi bağlar,
Ağ ləçəgi sərpə saldı dağlar.
Susən qılıc aldı, bid xəncər,
Eyş etməyənin gözinə sancər.
Pərvaz qılur havadə turğu,
“Ya rafe” oxur, kimisi yahu.
Sayrar ağac üstə yüz sığırçın,
Ahəng dutar ona gögərçin.
Əsməkdə nəsimi-ənbərəfşan,
Yaprağnı qılur budağda lərzan.
Ötkün quşu köçdü, qıldı pərvaz,
Durnavü üqabü qurqura, qaz,
Murçinü cürəvü nərgə, sona
Yaydı qanadın ki, gölə qona.
Kəklik gülür idi dağda qah-qah,
Bayquşlar oxurdu “li məallah”.
Sərv öz ayağına sayə salmış,
Zilli-saçını hümayə salmış.
Novruz gülünün açıq dəhanı,
Mürğ anda hezar oxur zəbanı.
Daylar tülədi, buraxdı yalı,
Kişnər çalağan qulun misalı.
Quzladı qoyin, töküldü döllər,
Yaylağ həvəsini qıldı ellər.
Düşmən qanı tək qızardı hər su,
Ötkün saruya yeridi ahu.
Bir-birini qavur keyiklər,
Bala dölümün qılur peyiklər.
Durmuş çəmən üzrə sərv ayağə,
Qılmağa təmaşa solü sağə.
Gül düxtəzinin ərusu yetmiş,
Gülgün duvağın başına örtmüş
Ahu quzu doydurub uyutdu,
Oğurlanıb özü ota getdi.
Səhrayə buraxdı nafə ahu,

Xaki-siyəh oldu müşki-xoşbu.
Durna uçub ün çəkib həvadə,
Gedər ünü qırx ağac ziyadə.
Bağrı qaranın qarardı bağri,
Şahbaz ona varanda doğri.
Quşlar yuvadan uçurdu balə,
Ahu yenə sür verür gəzalə.
Çıxdı günəşə yer əjdəhası,
Buynuzunu saldı dağ buğası.
Hər bir çiçək üstə qondu zənbur,
Dövşürməgə çıxdı danəsin mur.
Hər şey günəşə qurutdu yaşin,
Qövsi-qüzeh açdı tər qumaşin.
Şəb cü-cü edir ağacda sərçə,
Uçanda, qonanda beylə parçə.
Yaprağı ağaclar üstə lərzan,
Kimisi çü tir, kimisi peykan.
Şəh tuti oxur şəkər kəlamin,
Qənd ilə pür etdi bəndü damin.
Döndü vətəninə cümlə quşlar,
Gəldi yuvasına qırlaquşlar.

Dər zikri-ünvani-aşiqi və əhvali-xod
*(Bir aşiqin ünvanı və öz halı haqqında*)

Aləm qamusu bu dəmdə xoşhal,
Mən öz işimdə fariğül-bal.
Gəh yerir idim çü ahu dağda
Gəh axar idim çü cuy bağda.
Gəh könlüm ilən çəməndə xürrəm,
Gəh həmdəm ilən gəzəndə biğəm.
Mə’şuq ilə eşqi tanımazdım,
Heç kimə könül verim deməzdim.
Derlərdi bu eşq qissəsini,
Dil zərrə yeməzdi qüssəsini.
Öz pişəmə, öz işimə qane,
Heç kim yox idi kim, ola mane.

Kim desə mənə ki, aşiq oldum,
Rüsvayi-dili-xəlayiq oldum,
– Əbləh, – deyübən gülərdim ana,
Hər tə'nə ki var, qılardım ana.
Key əbləhü kəcxəyalü biəql,
Bu sözmidürür ki, eylədin nəql.
Ol odə salamı canı kimsə,
Ğeydə verəmi inanı kimsə?
Çün düşməmiş idi dil bu qalə,
Yüz tə'nə qılurdum əhli-halə.
Yanmıyan oda nə bilsün odi?
Başdan çıxarur düşəndə dudi.
Yə'qub oxurdu dər təəssüf
"Inna əcəda berihi-Yusif".
Məcnun ögünə düşəndə Leyli,
Gözdən axıdardı qanlu seyli.
Fərhadə dəyəndə eşqi-Şirin,
Eylərdi fəğani-zəhragin.
Əlqissə, bu sözü bilməz idim,
Üşşaqi gözümə almaz idim.
Bir gün çəmən içrə seyr edirdim,
Pərvanə misali teyr edirdim.
Bir sayeyi-sərvi-nazə yetdim,
Bir ləhzə orada xabə getdim.
Ruhaniyə ruh qıldı seyran,
Gəl gör ki, mana nə qıldı dövran?
Göründü gözümə bir pəriru,
Xoş ləhcəvü xubcəmalü xoşru.
Çün seyr ilə gəldi mana yetdi,
Canü könül aldı beylə getdi.
Hüsnü sifətin nə qılım anın,
Nuri fələkin, gözü cəhanın.
Xoş qaməti kəşki-sərvi-rə'na,
Xaşak yüzündə vərdi-həmra.
Qaşları kəmanü kiprigi ox,
Aləm gözü qatda nərgisi-şux.
Nə şəkli-pəri, mələk, nə insan,

Rövşən yanağında nuri-rəhman.
Oldum beməsəl divanə bidar,
Nə məstü nə aqiləm, nə hüşyar.
Bilmən özümi ki, xandəyəm mən,
Ya mürdəmi, yoxsa zindəyəm mən.
Bağrım yaralu misali-lalə,
Ğəmdən yürəgim dolu piyalə.
Sona kimi göz yaşında qərqab,
Səyyarə kimi du çeşmi bixab.
El lalə təki piyalə nuşan,
Susən kimi mən zi ləb xəmuşan.
Göglərdə sədayi-əbr ünüm tək,
Aləm gözümə qara, günüm tək.
Bağlarda nəsim ənbərəfşan,
Sünbül təki mən könül pərişan.
Gər dağda, əgər çəməndə idim,
Heç bilməz idim ki, xandə idim.
Işim gecə-gündüz ahü zari,
Dutmazdı dəli könül qərari.
Nə fikri-yemək, nə xab dər çəşm,
Xabim yerin aldı ab dər çeşm.
Nə ab gözümdə, bəlkə xunbar,
Qan doldu yaşımla kuhü gülzar.
Bülbülni fəğanım eylədi lal,
Boynumda səlasil oldu əğlal.
Uzun gecələr səhər görünməz,
Zülmətdə mana qəmər görünməz.
Bu yola, ilahi, yoxmu payan?
Bu dərdə, ilahi, yoxmu dərman?
Biçarəvü zarü natəvanəm,
Mən taqəti-ğəm nəmitəvanəm.
Yar zülfi təki günüm qarardı,
Yar ağzı kimi yerim darardı.
Qanlar yuduram yüzündən ayru,
Bimar tənəm gözündən ayru.
Bilmən necədir kəminə halım,
Artır dinü gün ğəmü məlalım.

Səbrin səbəbnini pişə qıldım
Kim, mən bu xəyalı nişə qıldım?
Qıldım könülə hezar nifrin,
Kim, şad ikən etdi bizni ğəmgin.

Şe'r berəsmi-şekayət əz del
*(Ürəkdən şikayət yolu ilə şe'r)*

Ey eşqə özin fəda qılan dil,
Əz səbr məni cüda qılan dil,

Üşşaqı cəhanda xürrəm ikən
Pür möhnətü pür bəla qılan dil.

Məhbubi-xücəstə zülfi çinin
Bəndinə düşüb xəta qılan dil.

Dilşadləri könül gözündən
Ğəm kuyinə aşina qılan dil.

Xoş xatir ikən fərağət əhli
Dərdü ğəmə mübtəla qılan dil.

Yüz dürlü bəlayi-eşqə hər dəm
Könlün verübən riza qılan dil.

Hər busəsinə gözəl nigarın
Can ilə cəhan bəha qılan dil.

Sidqi-dil ilən yolunda yarın
Öz ölməginə dua qılan dil.

Mə'şuqədən alsa qərz busə,
Canü sər ilən əda qılan dil.

Bir zərrə təki günəş yolunda
Yüz min həvəsü həva qılan dil.

Yarın diləyib bəqayi-ömrin,
Öz varlığını fəna qılan dil.

Yüz hökm ilə şah ikən Xətayi,
Yar eşiginə gəda qılan dil.

Dər vəsfi-hali-xod quyəd
*(Öz vəziyyəti barədə deyir*)

Bu növ ilə iş kim, oldu bəd hal,
Hər ruz mana keçirdi bir sal.
Naləm gecələr olurdu yahu,
Incəldi tənim misali-yek mu.
Həm yox mana bir rəfiqü həmdəm
Kim, eyləyə bu yaramə məhrəm.
Həm səbrü qərarə taqətim yox,
Həm dəxi kişilə ülfətim yox.
Yüz dutdum ilah həzrətinə,
Ol cümləyə şah həzrətinə.

Dər təzərröi-həzrəti-həqq
(*Tanrıya yalvarış)*

Dedim ki, əya kərimi-biçun,
Qoyma məni sən bu halə məğbun.
Bu eşqə məni düçar qıldın,
Işimni fəğanü zar qıldın.
Bu mur gəzərdi binəva tək,
Eşq ağzına saldın əjdəha tək.
Lütf eylə məni-fəqirə bari,
Öldürmə ğəm içrə zar-zari.
Odu buraxan bu canə sənsən,
Məqsudi verən cəhanə sənsən.
Məqsudə yetir məni-fəqiri,
Sənsən qamunun çü dəstgiri.
Ya hicri mana vüsal qılgil,
Ya həsrəti bu könüldən algil.

Bu növ ilə kim, niyaz qıldım,
İxlas ilə kəşfi-raz qıldım,
Hatifdən eşitdi guşim avaz
Key sidqilə eşq evində sərbaz,
Ol könül alan gözəl pəridir,
Gülzari-cinan anın yeridir.
Oldur oturur filan çəməndə,
Çün sərvi-çəmən, çü ğönçə xəndə.
Cövlandadurur qamu pərilər,
Gün təl'ətü mah peykərilər.
Dur, şimdi anın saru səfər qıl,
Fərxəndə cəmalına nəzər qıl.
Çün görə gözün rüxi-dilaram,
Ol vəchlə duta könlün aram
Kim, ayrulığ atəşi-səqərdir,
"Əlqürb" civari-mö'təbərdir.
Göz görməsə, dil gətürməz aram
Kim, gözə verür məhəbbət ilham.
Şayəd səni hər göréndə ol yar
Könlündə mürüvvət edə izhar.
Canın məgər anda bula rahət,
Didarə baxıb edə qənaət.
Bu sözə hezar şükr qıldım,
Varmağa yolumni fikr qıldım.
Yarəb, mana sən o yari vergil,
Əğyardən ayru yari vergil.

Rəftəne-aşeq besuye-mə'şuq
*(Aşiqin mə' şuqəyə tərəf getməsi)*

Ol gülşəni soruban yeridim,
Yarəb, nə ola işim der idim.
Hər dəm yürəgim qılırdı tıp-tıp,
Canım zi həvəs edirdi gup-gup.
Özümni yetirdim anda naçar,
Ol bağə ki, bəzm edirdi dildar.
Bir şəkl göründü, bir şəmail,

Huşum bilə əqlim oldu zail.
Gün kimi cəmalı tab salmış,
Zülfi yüzinə niqab salmış.
Yüz hurü pəri, hezar qılman
Qulluqda durur mütii-fərman.
Sərv anın içün əyağə durmuş,
Xublar qamu solü sağə durmuş.
Gül yüzi qızarmış infialdan,
Bənövşə yerə baxır məlaldan.
Nərgislər önündə cam dutmuş,
Bülbüllər oxur, nizam dutmuş.
Əflak yüzündə kaxü eyvan,
Bir təxti-səradə bürci-Keyvan.
Gül yastanuban nigar oturmuş.
Qanlardan əli nigar oturmuş.
Əz bərgi-səmən sərirü təxti,
Gül kimi güşadə ruyi-bəxti.
Məhlər qamusu əyağə durmuş,
Kim solavü kimi sağə durmuş.
Çakərlər içində şah nisbət,
Kövkəblər içində mah nisbət.
Şəhlər qamusu yanında nökər,
Yusif yüzinə ğulami-kəmtər.
Iskəndər ana bir ayinədir,
Darab qatında bəndə kirdar.
Cəmşid anın piyalə giri,
Cəm bəzmi-şərabının əsiri.
Yüz qeysər ona ğulami-Rumi,
Rüxsarı günəşmi, yoxsa rumi?
Əngüştəridar ana Süleyman,
Insanü pəri sözinə fərman.
Bir zərrə yüzi qatında xurşid,
Bir ləm'ə cəmal qatında Nahid.
Peyvəstə qılur itabü nazi,
Dəstində inani-sərfərazi.
Durdu, yeridi çəməndə rə'na,
Başından ayaba candır ə'za.

Gül ğönçəsi tək niqab yüzündə,
Məh kimi hezar tab yüzündə,
Heç kimsə anın yanına varmaz,
Heç mərdüm anın yüzini görməz.
Doğru baxanın alırdı canın,
Gözü görənin tökürdü qanın.
Çün gördüm anı bu səltənətdə,
Eyvani-kəmali-mənzələtdə.
Vəhşət ətəginidutdu könlüm,
Öz halətini unutdu könlüm.
Dedim ki, diriğ, neyləyim ah.
Mən zərrə ilən nə nisbət ol mah.
Ol gögdə yerir, bəndə bər xak,
Bu xak necük yetər bər əflak?
Mən bir qulam, ol bir ulu sultan,
Sultan ilə qul məqami xandan?
Bu gücləri mana eşq qıldı,
Bu vərtəyə canı eşq saldı.
Fəryad ilə ah eşq əlindən,
Ömr oldu təbah eşq əlindən.
Eşqi anuban şikayət etdim,
Ğəm şərhini binəhayət etdim.

Dər sefəte-atəşe-eşq
*(Eşq atəşinin səciyyəsi haqqında)*

Eşq odu yamandır, ey xirədmənd,
Bu bəndə dolaşma, gəl eşit pənd.
Eşq uğraşur olsa kuhi-Qafə,
Ənqa qıla Qafə irtihafə.
Gər eşqi götürsə nöh fələklər,
Çərx üzrə fələk yana, mələklər.
Gər eşqin odu düşər zəminə,
Suzi yetə ərzi-həftüminə.
Bir zərrəcə eşq canə düşsə,
Ya rəglər içində qanə düşsə,
Bir dəm tən içində durmaya can,
Həm rəglər içində xüşk ola qan.

Gər atəşi-eşq başə düşsə,
Bir zərrəcə suzi daşə düşsə
Qatlanmaya ana, çatlaya daş,
Meydani-həvadə oynaya baş.
Gər atəşi-eşq dilə düşsə,
Bir qətrəcə bəhri-Nilə düşsə,
Bir ləhzədə oda yana dillər,
Hirqətdə quruya bəhri-Nillər.
Gər eşqin odu düşərsə bəhrə,
Səbr etməyə bəhr uş bu qəhrə.
Ol oddur odu çıxardı daşdan,
Əqli gəlicək apardı başdan.
Ol oddur o kim, Xəlili Nəmrud
Ba Məncəniq atdı anə çün dud.
Eylərdi ol od Xəlili Möhrəq,
Yanar günüdə deməsə "ya həq".
Uğraşdı ol od beqəlbi-Məcnun
Fərhadı ğəm ilə qıldı məhzun.
Vətfindən anun yetərdi neylər,
Fərhadə son ucu gör ki, neylər?
Oldur ki, ana sataşdı həllac,
Mahmud misali sahibi-tac.
Bir darə birini mənzər etdi,
Bir qula birini çakər etdi.
Oldur ki, ana yıxıldı Yə'qub,
Həm çəkdi anın bəlasin Əyyub.
Ağlatdı birini, kur qıldı,
Birin bəlaya səbur qıldı.
Bir oda sataşdı Şeyx Sən'an,
Həm cani-Züleyxa Misrə sultan,
Ol birini kafir etdi, bidin,
Ol biri şəh ikən oldu miskin.
Bu eşq ilə kim, əsir boldum,
Dər vəqti-cəvani pir boldum.
Qalmadı dəxi tənimdə taqət,
Qəsd etdi mana hücumi-firqət.
Eşq oduna bir rəvayət etdim,
Adın dutuban şikayət etdim.

Şe’r be rəsme-şekayət əz eşq
*(Eşqdən şikayət yolu ilə şe’r)*

Ey canü dili xərab edən eşq,
Üşşaqı kəm əz türab edən eşq.

Odlarə salıb fərağət əhlin,
Yaxıb cigərin kəbab edən eşq.

Mə’şuqə müdam içmək içün
Dillər qanını şərab edən eşq.

Divanələrin dutub təriqin,
Tərki-vər’əü səvab edən eşq.

Bir zərrə təki vücudə düşsə,
Məşhur çü afitab edən eşq.

Dünyadə hər əhli – xanümani
Biməzkənü xürdü xab edən eşq.

Zöhd əhli sual edəndə hər dəm
Min höccətə bir cəvab edən eşq.

Mə’şuqə saruya baxsa aşiq,
Bəxti-siyəhin niqab edən eşq.

Bir dəmdə Xətayi xəstə halə
Səd naz ilə min itab edən eşq.

Didənə-bağban aşeqra və azad kərdən
*(Bağbanın aşiq görməsi və azad etməsi)*

Bu vəhşət ilən ki, baxar idim,
Vəhşətdə könülni yaxar idim.

Nomid bolub könül pərişan,
Giryanü nizarü sinə büryan.

Nagah yoluxdu bağbani,
Bağ saxlamağa qomişdi ani.
Pünhani yeridi, gəldi qarşu,
Aydır: – Sorayım, nə kişidir bu.
Kim, munda əqilli kimsə gəlməz,
Bu dəli məgər özüni bilməz.
Xişm etdi, itab ilən yeridi.
Həddin tanigil mana der idi.
Çün yetdi mana, salam qıldım,
Öz dərdi-dilim təmam qıldım.
Nə baxdı sәlamә, nә kәlamә,
Nə alqışıma, nə xod duamə,
Bir yumruğ urub qəfamə möhkəm,
Başumə dəxi yetirdi üç bəm.
Usum yeridi, bulandı beynim,
Öz yolunu görməz oldu eynim.
Der: – Kimsən, əya xəsisi-bədru?
Gör kim, gəlicək yerinmidir bu?
Kim burada muş olur qəzənfər,
Tülküyə dönər hünərvər əjdər.
Bu yerdə nəmir olur çü xərguş
Gögdən uçamaz qanad çalıb quş.
Divanəmisən və yaxud əhməq,
Get, yoxsa yeyərsən əlli toxməq.
Casusmisən ki, yoxsa oğru,
Ya əgrimisən və yoxsa doğru?
Bildir mana kim, nə pişəsən sən?
Əlqissə, buradə nişəsən sən?
Ya yolmi azub burayə düşdün?
Bir dəm bizim ilə xub dürüşdün.
Çox qılma mənimlə höqqəbazi,
Min müşt sana urarmən azi.
Bir ursam, on ol qədər sürəyim,
Fəryad edəsən ki, mən durayım.
Bir bəndədürür bu yerdə səhlər,
Bir zərrədürür buradə mehlər.
Əflakə qaxar ki, sərnigunsan,

Pa yerə dögər ki, gunə-gunsan.
Kövneyn munun qatında bir çub,
Xublar qamusu yanında mə’yub.
Oldur bu ki, kəfşi payə qoymaz,
Həmrah özinə sayə qoymaz.
Bu yerdə muradü halətin nə?
Nerdənsənü əsli-millətin nə?
Gər munda səni duyarsa ol mah,
Işlər qıla sana, Allah, Allah!
Ancaq nə səni sürür, məni həm,
Hərgiz gəzəmi bu yerdə adəm?
Munda nə muradü məqsudun var?
Gəlməz bu arada hiç dəyyar.
Baği-pəridir bu bağın adı,
Qoymaz bu yerə firiştə zadı.
Sözün var isə, yeri var özün,
Nə qala yüzün bütün, nə gözün.
Yüzün qanadına yetə qaşın,
Qarışa burun suyilə yaşın.
Çeşmin genənə misali-qazğan,
Sarxa dodağın besani-ənban.
Bilinməyə önün, ardü yanın,
Əngində zühur ola dəhanın.
Canın sağ ikən yeri buradən,
Söyləmə dəxi bu macəradən.
Baxdım ki, munun qırımı özgə,
Mənimlə alum-verimi özgə.
Varmağ həvəsini tərk qıldum,
Qurtulmağa şimdi razı boldum.
Düşdüm yüzüm əyağına sürdüm,
Könlüm xəbərini cümlə verdüm.
Dedim ki, mən ol pəri nigarə
Heyranəmü bağrı parə-parə.
Bir gün gözümə göründü nagah,
Canü dilimi apardı həmrah.
Səbr ilə qərarım aldı, getdi,
Nə səbr ki, varım aldı, getdi.

İşim gecə-gündüz ah boldu,
Eşqimə cəhan güvah boldu.
Qalmadı qərarü xurdü xabım,
Qan oldu axub gözümdən abım.
Həq dərgəhinə niyaz qıldım,
Ixlas ilə kəşfi-raz qıldım.
Hatifdən eşitdi guşim avaz:
– Bu razi-dilin ki, qıldın ağaz,
Həzrətdə qəbul düşdü hali,
Dildən götür ol ğəmü məlali.
Verən sana bu fəğanü ahi
Ol gülşən içində bəzmgahi.
Baği-pəri derlər ol məkanə,
Bənzər dərəcati asimanə.
Dur, imdi anın məkanına var,
Durmagil iraxda, yanına var.
Gər görməginə düşə məcalın,
Kəşf eyləgil anda ərzi-halın.
Mundax dura-düşə yola düşdüm,
Gəh açuğa, gahi kola düşdüm.
Yetdigim ol idi sizni buldum,
Ancağ sizi gördügümni bildim.
Gər bir igidin düşə məlali,
Yetər sənə bildirincə hali.
Başuma mənim nələr gətürdün?
Ərzi-dilim ana xub yetürdün.
Yüz dürlü mana ğəramət etdin,
Aləmdə məni məlamət etdin.
Səbr etməgə hiç çarə yoxdur,
Bağrımda nə dürlü yarə yoxdur.
Bəs neyləyim, ey hərimi-gülşən?
Həll eyləmədin bu müşkülüm sən.
Bu həsrət ilən həlak oluram,
Bu dərd ilə dərdnak oluram.
Ol dəxi eşitdi uş bu hali,
Aşiqliğimi, ğəmü məlali.
Bir ol dəxi aşiq olmuş imiş,

Eşqin hünərini bilmiş imiş.
Ah eyləyübən təəssüf etdi,
Üzrin diləyib təkəllüf etdi.
Aydır ki, əya ğəribü bikəs,
Bildim sözüni nə olduğun bəs.
Amma ki, yetirmək olmaz anə
Kim, xişm edər ol mana, nə sanə.
Çox eyləmə dəxi fikri-fasid,
Gər sana gərək bu yolda qasid,
Bir qutlu nəfəs, Səbadır adı,
Aşiqlərə ol verir muradı.
Mə'şud ilə aşiqə rəsuldur,
Hər yerdə ki, var sözü qəbuldur.
Anı bula gör nə yerdə kim var,
Desən varur ana xanda kim var.
Mə'şuq ilə aşiqə rəsuldur,
Əzrayə gedər zi suyi-Vamiq.
Mən dəxi görüm gələndə ani,
Bilim sözü necədir nihani.
Varmı diləgin məhəlli billəm,
Gər könlü xoş olsa, ərz qıllam.
Olmasa qəbul, ola mərdud,
Gər qılsa, yetə muradə məqsud.

Baz gəştəne-aşeq əz dəre-mə'şuq be tələbe-səba
*(Aşiqin səbanı tapmaq üçün mə'şuqənin qapısndan geri qayıtması)*

Allaha şükür qılub yer öpdüm,
Bulmağa Səbanı yola qopdum.
İstəməgə anı bağə düşdüm,
Eşq ilə, nedim ki, dağə düşdüm.
Həm bərgi-bənövşə, lalə gördüm,
Xinzalə yüzündə jalə gördüm.
Həm firqələrin ləçəklərini,
Həm tutiyənin çiçəklərini.
Həm dəstə bütük vərdi-qaymaq,
Sünbül çiçək ilə oymaq-oymaq.

Quzuqulağı, gülü qərənfil,
Təkəsaqqalivü göy sünbül.
Sordum bulara dəmi-səbanı,
Uzatdı cəvab içün zəbanı.
Derlər ki, nedir bu dağ içində?
Var istəgil ani bağ içində.
Hər gülşəni ol müzəyyən eylər,
Gülzar içində məskən eylər.
Bu sözü eşitdim, ağladım zar,
Yetdim yügürüb besəhni-gülzar.
Gördüm çəmən içrə bağbani,
Sordum ki, xanı ana səbanı.
Der oldur əsər budağlar üstə,
Titrətmə salur vərəqlər üstə.
Pərvazi müdam olur çəməndə,
Pərvasi səndədir, nə məndə.
Öz eyşinə, öz dəminə məşğul.
Bu aləm anın qatında bir pul.
Görsətməz özin, gəzər nihani,
Bari de ki, sən nedirsən ani?
Dedim ki, sən ani sorma məndən,
Məndən sana bu cəvab xandən?
Bir bağbanına söylədim söz,
Nə qaldı ağız, nə yüzü, nə göz.
Heç görməmisən bu hey'ətimni,
Bu şəkli-bədiü surətimni.
Gər munda işimni sorasan sən,
Andan qalanın bitürəsən sən.
Hər nə sözüm olsa, hər nə vayə,
Pünhani derəm ani Səbayə.
Sən varmaz isən, vararum özüm,
Ərz eylərəm ana gizli sözüm.
Əlqissə, varub Səba qatinə,
Yetürdüm özümni xidmətinə.
Gördüm ki, gəzər çəməndə xoş dəm,
Güllər vərəqini eyləmiş nəm.
Sərvin yenə təprədir budağın,

Güldən çü ərus alır duvağın.
Nərgis gözün açmış, ana baxər,
Sünbül yüzinə tapança qaxər.
Bir gülşən içində buyi-güldən,
Şəbnəm pür edir səbuyi-güldən.
Gəh qəddi-bənövşə xəmdir andan,
Gəh dideyi-əbr nəmdir andan.
Meydanda atı həmişə tövsən,
Uzatmış ana zəbanı susən.
Gülzari-çəmən münəvvər andan,
Eylər damağı müəttər andan.
Şax üstə şükufələr açırdı,
Boyunu çiçəklərin saçırdı.
Bürqə götürürdü ruyi-güldən.
Isar qılurdu buyi-güldən.
Çün bülbüli-aşiqi-xoş avaz
Eylərdi çəməndə nəğmə ağaz.
Dutmuş qulağın çiçəklər ana,
Zikr ögrədədir mələklər ana.
Gəh dağda əsərdi, gah bağda,
Gəh solda əsərdi, gah sağda.
Dedim ki, əya Səbayi-xoş dəm,
Allah dəmini qılmasun kəm.
Başuma mənim bir iş gəlibdir,
Eşq atəşi yürəgim dəlibdir.
Biçarəvü zarü müstəməndəm,
Hicranın əlində dərdməndəm.
Uğraşdı gözümə bir pəriru,
Dağlara düşüb olubmən ahu.
Derlər ki, bolur bu çarə səndən,
Məqsudə yetər biçarə səndən.
Çoxların işini bitirənsən,
Çoxlarni muradə yetirənsən.
Hər sübh dəmində zikri-yahu
Söylərsən, əya nəsimi-xoşbu.
Səndən irişir məşamə ənbər,
Aləmni qılur dəmin müəttər.

Sən yari qılanda Mustafayə
Dedi ki, "nəsərtə bissəba"yə.
Ey mərkəbü-mövkəbi-Süleyman
Nəfxinlə hava pür oldu yeksan.
Səndən dutadır zəmin qərari,
Səndən çıxadır fələk buxari.
Əz lütf degil tənin hüveyda,
Olmaz vücudun çü ruh peyda.
Manəndi-hüma yerin həvadır,
Məcruhlərə dəmin dəvadır.
Isayi-zəmanü xoş nəfəssən,
Kim qalsa piyadə, sən fərəssən.
Ey Xızra mədədçi hər aradə,
Yetir bu fəqiri sən muradə.
Vəlfəcr nəsimisən behişti,
Çün Nuh yerir dəminlə kəşti.
Yerlər yüzüni sən eylədin çak,
Çox vardır əgərçi qiylü qalın,
Heç kimsənə anlamaz məqalın.
Dilin sənin, ey nəsimi-xoşxan,
Gahi ərəb oldu, gahi imran.
Sən rih degilsən, ey verən ruh,
Bağlı qapı səndən oldu məftuh.
Bu dəmdə qatında hacətim var,
Aləmcə bu işdə minnətim var.
Bu müşkülümü gər eyləsən həl,
Həq duta əlin ki, dutasan əl.
Bir dilbəri-dilrübayi sevdim,
Mən zərrə bu gün bir ayi sevdim.
Lütfü kərəm eylə, var ana sən,
Qatında anın məni anasən.
Aydır: – Varayım, bu canə minnət,
Mən xeyrə yetəm, sana nə minnət.
Bu yola gedəm piyadə səd bar,
Üşşaq işinə mənəm vəfadar.
Amma ki, mənimlə namə yazgil,
Dərdi-dilini pəyamə yazgil.

Mən aparayım anı nigarə,
Şayəd ki, bulam bu dərdə çarə.
Qıldım mən ana yügüş dualər,
Adın dutub oxudum sənalər.

Şe’r berəsme-tə’rife-cəba
(*Səbanı tə’rif yolu ilə şe’r)*

Dedim ki, əya Səbayi-xoşdəm,
Xublar hərəminə yarü məhrəm.

Oldun çü mənim işimə qəmxar,
Ayruluğ odunda çəkmənəm qəm.

Hicran oxidən bulam səlamət,
Gər sən qılasan yaramə mərhəm.

Hər xanda ki, var qəbul nəfəssən,
Aşiqlərə qılma hümmətin kəm.

Buldu bu Xətayi nəfxinizdən
Buyi-nəfəsi-Məsihü Məryəm.

Rəftəne-səba bexabqahe-xod ke fərda beyayəd
(*Sabah gəlmək üçün Səbanın öz yatağına getməsi*)

Dedim ki, əya qamudan uli,
Oldu bu sözə könül təsəlli.
Əzm etdi həvəs ki, yazə namə,
Baş qoydu günəş məqami-şamə.
Xurşid çü məğribinə batdı,
Bəs vardı Səba yerində yatdı.
Qövl etdi mənə ki, dan atan çağ,
Bülbül budağə qonub ötən çağ,
Olmuş ola namə cümlə təhrir,
Hər ərzə ki, var içində təqrir.
Gəlim aparım anı nigarə,

Başəd ki bula bu dərdə çarə.
Ol getdivü bəndə bağda qaldım,
Məcnun təki dəştü dağda qaldım.
Aldım qələmi ki, namə yazəm,
Əhvali-dilim kəlamə yazəm.

Yari xastəne-Aşeq dər name neveştən
əz dəvato qələm və ə'zaye-xod
(Aşiqin məktub yazarkən mürəkkəb, qələm
və öz bədən üzvlərindən kömək istəməsi)

Yadıma mənim zi fikr əksər
Gəlməzdi hüruf şəkli əzbər.
Yar ilə özüm müqabil etdim,
Yazmağa özümni qabil etdim.
Əqlimə dedim ki, hazir olgil,
Gözümə dedim ki, nazir olgil.
Bir dəm dedim, ey qərarım əylən,
Getmə bu gün ixtiyarım, əylən.
Ey səbr, dedim bu gün cəmil ol,
Bir dəm dedim, ey süxən dəlil ol.
Gözümə dedim ki, tərki-xab et,
Qoy fikri-xətayi, bir səvab et.
Dedim ki, qələm, yüzün siyah et,
Yusif tək özün beqə'ri-çah et.
Dedim: – Sağ əlim, al imdi xamə,
Dedim: – Sol əlim, dut imdi namə.
Qıldı sözümü qamusu məqbul,
Lövhi-dilim oldu eynə mənqul.
Yondum qələmi, dilini dəldim,
Həm yonub anın yüzüni sildim.
Lövh üstə sürüb bu başın anın,
Tökdüm vərəq üstə yaşın anın.
Kafurə qarışdı müşkü ənbər,
Bilməzdi hürufi fikrim əzbər.
Zülfin anuban çü "cim" yazdım,
Ağzını ananda "mim" yazdım.

Yazdım pitigi “əlif”, “he” yazdım,
Almamış ikən anı “xe” yazdım.
Eynini ananda “sadı” çəkdim,
Xal üstə gözündə “zadı” çəkdim.
“Rey” yazdım ananda şəkli-qaşın,
Çeşmim həvəs ilə tökdü yaşın.
“Lam” oldu beşəkli-zülfi-hindu,
“Nun” hərfi çəkildi şəkli-əbru.
Çəkdim bir “əlif” çü qaməti yar,
Yazdım xəmi-qəddimi digərbar.
Piçidə qılub oları bahəm,
Yazdım bilə lam əlifni ba həm.
Bu növ ilə hərfi cümlə yazdım,
Bir nöqtə demən ki, sözdə azdım.
Dilim dutulur gəh əz təhəyyür,
Ğəm könlüm ara qomaz təfəkkür.
Yazdım pitigi qamu sərasər.
Dutdum anı qarşuma bərabər.
Oxudum anı ki, qalmaya şək,
Nəqs oldu gümani-zayidi-hək.
Kəsdim qulağın türabə tökdüm,
Çərtib yüzinə donunu bükdüm.
Hər növ ilə bari yazdım anı,
Dedim ki, Səba bu dəmdə xanı?
Kim, gələ apara namə yarə,
Bir mərhəm ola bu dilfikarə.
Gəldi qulağıma sazi-bülbül,
Şəb pərdəsin açdı çöhrədən gül.
Sübh oldu, dedim irişmədi bad,
Üşşaqi məgər çıxardı əz yad?
Miskin dil edirdi dəm-dəm ahi,
Gözlərdi gözüm begiryə rahi.
Gördüm ki, Səba irişdi nagah,
Görgəc anı dərdəm eylədim ah.
Dedim: – Sana təhsin, ey vəfadar,
Oldun yenə canıma mədədkar.
Gəl şimdi apar nigarə peyğam,

Ta bola fəqirə vəsli ən'am.
Gəldivü əlimdən aldı məktub,
Əzm etdi, yeridi suyi-məhbub.
Aydır ki, bizimlə bağla hümmət,
Yar etmiyə ta bu işdə höccət.
Dedim ki, yeri, xuda biləncə,
Ər hümməti həm dua biləncə.

Ozr xastəne-aşeq əz səba və cəvab dadən beərəbi
*(Aşiqin Səbadan üzr istəməsi və ərəbcə cavab verməsi)*

Üzr etdim anınla pür mükafat,
Ta ortada qalmaya münafat.
Dedim: – Irəmi rikabın əz rah?
"Nəsr" ayətin oxudu, "minəllah".
Dedim: – Yetəmi dəva nəsibi?
Der: – Leytəni küntü min təbibi.
Dedim ki, işimdən eyləmə ar,
Der: – Lillahü rəbb fərdü qəffar.
Qəm etdi dedim zi şadi tərcih.
Der: – Heysə yəşa yüksəkkünürrih.
Dedim ki, "Vəcəd fəcud səvabən?"
Aydır ki, "Ləəlləni turabən".
Dedim: – Bu sitəm olurmi kəsrən?
Der: – Ğəm yemə, "beynə üsr yüsrən".
Dedim: – Əvəzin necük qılına?
Der: – Allahü əcr aləminə.
Dedim ki, işim neçük bola, ah?
La təqnətü, der, zi rəhmətullah.
Dedim: – Sana qıldım e'timadi.
Oxudu dəlili-ya ibadi.
Dedim ki, təbarək, ey süxəndan,
Sana yaraşur süxən du çəndan.

Nameyi-əvvəl. Rəftəne-səba besuye-mə'şuq
*(Birinci məktub. Səbanın Mə'şuqun yanına getməsi)*

Gəldi və əlimdən aldı məktub,
Əzm etdi, yeridi suyi-məhbub.

Der: – Hümmət edin bizimlə həmrah,
Etməyə məlamət ol şahənşah.
Dedim ki, rəfiqin ola mərdan,
Tən munda qalıb, səninlədir can.
Ol getdivü qaldım anda giryan,
Səd nalə konanü zarü əfğan.
Gəh dağ üzə əsdi, gahi daşda,
Gəh xüşk üzə əsdi, gahi yaşda.
Sürdü qatı atın ol vəfadar,
Ol bağə irişdi k-andadır yar.
Gördü ki, bir adlı şah imiş ol,
Nə yerdə, fələkdə mah imiş ol.
Gülşəndə bülənd otağü eyvan,
Səncərlə səlatin ana divan.
Yüzinə baxarsa, gün dutar yüz,
Hər gün saçı birlə dil dutar yüz.
Qarşudadurur mələk yasavul,
Hər kimi görür, edir ki, savul.
Dutmuş yüzü birlə nur bağı,
Eyvani-fələkdədir otağı.
Çün gördü anı Səbayi-miskin,
Çəkdi cilovunu, oldu ğəmgin
Kim, bu pəridir cəhanda məşhur,
Xudbinü cəmalü hüsnə məğrur.
Necə varım imdi həzrətinə,
Ta irişə ərzə xidmətinə?
Dərman edə yar o dərdməndə,
Kar etdi anın bu dərdi məndə.
Durmuşdu Səba qılıb təfəkkür,
Barmağını dişlib əz təhəyyür.
Nagah önünə çü gəldi bir pir,
Xoş şəklü şəmayil, özü dilgir.
Yanına gəlib Səba rəvani,
Söylədi ana sözün nihani.
Sordu ana kim, Səbamısan sən?
Eşq əhlinə aşinamısan sən?
Kim, aşiqi-xəstədən gəlirsən,

Halından anın xəbər bilirsən.
Aydır ki, bəli, Səba mənəm der,
Sözüm yetürüm, xanı Sənəm der.
Ta andan ola bu iş sərəncam,
Kim məndən ana yetürə peyğam.
Aydır ki, mənəm ol, ey xoş avaz,
Ölmüşlər içün Məsihi-dəmsaz.
Mən dəxi nigarə bağbanəm,
Aşiqlərə yarü mehribanəm.
Mən demişidim, sana ki, gəlsin,
Mə’şuqə nə der, sözünü bilsin.
Oldur oturur otağ içində,
Sən bir dəm otur bu bağ içində.
Mən varayım ol nigar qatına,
Ol dilbəri-gül’üzar qatına.
Könlün görəyim neçükdür anın,
Sözün deməgə o natəvanın.
Oturdu Səbavü ol yeridi,
Söz deməgə fürsət istər idi.
Qulluğa irişdi, durdu bir dəm
Könlüni aradı, gördü xürrəm.
Xəndan çəmən içrə tazə gül tək,
Boynu sürahi, dodağı mül tək.
Aydır ki, deyim sözü, məhəldir,
Könlü fərəhü dəmi gözəldir.
Qorxar yürəgivü gah edər dəf’
Der ərzə edim, yenə qılur rəf’.
Bir qatla özünə eylədi fərz,
Bəs qıldı nigarə sözləri ərz.
Aydır ki, əya dəm afitabi,
Bir söz desəm, eyləmə itabi.
Bir qasidi-xəstə hali gördüm.
Yox gəlməgə heç məcali gördüm.
Gəlməz yavuğa, həzər qılur ol,
Dərgah saru nəzər qılur ol.
Vardım yanına, dedim nə kəssən?
Kim əhli-səfər, zəbun fərəssən.

Var yazılı əldə bir kitabi,
“Ə’teyni” dedimü bilxitabi.
Qıldım aluban nəzər be məktub,
Gördüm yazılu kəlam be məhbub.
Yaş ilən anın donu nəm olmuş,
Qan ilən anın yüzü dəm olmuş.
Çəkmişdi bəsi rəhi-bəid ol,
Çıxmış zi zəbani-müstəid ol.
Nəzm ilə sözü behəm müqabil,
Göftari cəmii-yerdə qabil.
Yazılmış, əya əmiri-xuban,
Dərd ilə ölürmən, eylə dərman.
Oldu ğəm ilən belim xəmidə,
Rəhm eylə mana, e nuri-didə.
Ol dəm ki, mən ol cəmali gördüm,
Özümdən özümni xali gördüm.
Biəqlü kəlamü huş boldum,
Yüz dərdü bəlayə tuş boldum.
Ol dəm ki, mən ol pəriyə baxdım,
Canü dilimi ocağə yaxdım.
Ol dəm ki, yüzünü gördüm anın,
Qalmadı dəxi qərarı canın.
Rə’na bəzinüb çü bağə düşdü,
Dil eşq ilə dərdü dağə düşdü.
Nomidi buluban əz dilü can
Məcnun təki kuhlərdə üryan.
Yox dəxi cəhanda ğəmgüsarım,
Səhradə keyiklər oldu yarım.
Çox oldu könüldə fikri-fasid,
Qıldım bu yola Səbanı qasid.
Öz halımı ərzü faş qıldım,
Yaşımla bitikni yaş qıldım.
Bu vəch ilə halım etdim e’lam,
Şəhlərdən olur gədayə ən’am.
Gögdən yer üzə yağar yağışlar,
Qullar günəh etsə, şah bağışlar.

Soxən şənidəne-mə’şuq
və etab kərdəne-bağban və səbara
*(Mə’şuqənin sözü eşidib bağbanı və Səbanı danlaması*)

Eşitdi bu sözü çün pəriru,
Aydır: – Nə söz idi söylədin bu?
Sən bilməmisən nə vəhşiyəm mən,
Bihudə sözə nə yəxşiyəm mən.
Sən bilməmisən ki, mən nə nazəm,
Söz əhliyəmü nə əhli-sazəm.
Sən bilməmisən gözüm nə gözlər,
Könlüm dilər eşidim nə sözlər.
Sən bilməmisən ki, mən nə şahəm,
Huri həşəmü mələk süpahəm.
Sən bilməmisən ki, mən nə şuxəm,
Kirpigi, qaşı yay ilə oxəm,
Ol bilməz isədə sən bilürsən,
Bu həsrəti bəs nədən qılursan?
Vargil degil ol rəsulə gəlsün,
Ol sözləri naqəbulə gəlsün,
Kimdir görəyim gəlür buradən,
Vaqif olayım bu macəradən.
Bir xoş qulağını burayım mən,
Yüzinə tapançə urayım mən.
Ta görə əzabi-guşmali,
Başdan çıxara çürük xəyali.
Öz naməsi tək qılam siyəhru,
Ta getməyə hərzə yerə hər su.
Qayıtdı çü bağbani-miskin,
Yardan naümid, könlü ğəmgin.
Çün bu xəbəri Səbayə verdi,
Ol miskini yüz bəlayə verdi.
Aydır: dedi ol nigari-bədxu,
Hey, hef, nə dedin, nə sözdürür bu?
Mən xandanü ol gəday xandan?
Gün zərrə məqami ay xandan?
Gəlsün dedi ol özü burayə,
Şayəd ki, sözün ana yarayə.
Hala yeri, var özün qatinə,

Ərz eylə pəyami xidmətinə.
Şayəd ki, oxuya namən ol yar,
Bir və’deyi-vəslə qıla iqrar.
Kim, namədə xoş kəlam vardır,
Söz yaxşılığı tamam vardır.
Bir müstəidin şüarıdır ol,
Rəhm edüb apara könlünə yol.
Allaha Səba qılıb təvəkkül,
Yeridi rəvani bitəəllül.
Görsətdi səlamü izzü ikram,
Istərdi kəlamın edə e’lam.
Öpdü ədəb ilə asitani,
Ol sərvi-səhi çü gördü ani,
Sordu: – Nə gərək, e hərzə-mərzə,
Kim dedi sana ki, gəl bu mərzə?
Aydır ki, əya şəhi-zəmanə,
Yüz sürməgə gəldim asitanə.
Nəvvabü qapuçivü süpərdar,
Qəsd etdi Səbayə cümlə yekbar
Kim, öldürübən həlak edələr,
Xəncərlə tənini çak edələr.
Qaxıdı sənəm oları varın,
Der: – Mən verəyim cəzayi-karın,
Məcnun çanağın uşatdı Leyli,
Bil kim, var idi onunla meyli.
Gər aşiq olursa eşqə sadiq,
Mə’şuqi qılur özinə aşiq.
Əlqissə, sözünü guş qıldı,
Bəs cami-itabi nuş qıldı.
Yırtdı əlidən alıb kitabın,
Saydı yüzinə üyubi babın.
Eybini varın şümar qıldı,
Gül yüzlü Səbanı xar qıldı.

Ğayeb şomordəne-mə’şuq Səbara
*(Mə’şuqənin Səbanı qovması)*

Aydır: – Niyə gəldin, ey qədəmsiz?
Bisəbtü səbat, kal, ədəmsiz

Olsan ki, məkanü millətin yox,
Biçarələr üstə heybətin yox.
Yox səndə vüqarü ğeyrətü ar,
Tü yüzinədir nə yerdə kim var.
Kim qarşuna varsa, gözün örtər,
Ancağ nə gözün ki, yüzin örtər.
Şaxlar çiçsəgin yerə tökərsən,
Ağac budağın iki bükərsən.
Saru qıluban nihal bənzin,
Süst etdi dəmin hilal bənzin.
Yol kəsmək işin bu zirvələrdə,
Qoparma könülni girvələrdə,
Məsturların açan hicabın,
Əldən sənəmin qapan kitabın.
Girən çü dilənçi hər qapudan,
Görməz gözün ə'ma tək səbudan.
Yüzündə savux, qoxunda nikbət,
Hər dəmdə sözün yalanü ğeybət.
Bir parə ağacları yıxarsan,
Mərdüm gözünə tütün tıxarsan.
Damular odunu yandıransan,
Sirlərni açub utandıransan.
Yaman gün olur dəm ol qiyamət,
Sən olasısan ana əlamət.
Əz ziri-zəmin qılasısan cuş,
Aləmni qılıb xərabü mənquş.
Çox eyləmə hərzə yerə küf-küf,
Şəm' ilə çirağı qılma püf-püf.
Savux toxunub, səbük qaçarsan,
Örtülü eyibləri açarsan.
Gəh məbrəz ara qəbih olursan,
Gəh məq'əd içində rih olursan.
Gəh saiqələr turur tozundan,
Gəh fəlsəfə dersən öz-özündən.
Hərzə yerə laflər urursan,
Toprağ ilə külü savurursan.
Yüz eybilə kim, bu şöhrətin var,

Bu şəhvət ilən nə hörmətin var,
Tez yeri, var ol gədayə söylə,
Məndən təmə' etmə vayə söylə.
Ol göndərənün sanadurur xas,
Kim, ə'mayə ə'ma xas ba xas.
Yoxsa səni mən bir işə saləm,
Fəryadın ünilə dola aləm.
Məndən yeri var, qılma çox toz,
Sürgil eşəgivü satmagil qoz.
Bir zərrə odu salıb cahanə,
Odlarsan ulusu yanə-yanə.
Dəryadə gəmilər azıdarsan,
Görər gözə tozu tozudarsan.
Ünün çıxar əz vücudi-bican,
Səndən dolu əşgimə cuyistan.
Çox söyləmə, ey yalançı göftar,
Vardır bu dəmində buyi-murdar.
Hər nikbət ağız ki, sözün açar,
Iman gedərü firiştə qaçar.
Əsmə gəhi solda, gah sağda,
Təzmə gəhi yolda, gah dağda.
Mən səncələyin yalançı sürmən,
El ğarət edər talançı sürmən.

Təhsin kərdəne-mə'şuq xişra
*(Mə'şuqənin özünü öyməsi)*

Olam ki, mənim cəhanda həmtam,
Nə gördü zəmanə, nə xud əyyam.
Kim gördü yüzüm bəğeyri-güzgu?
Kim dutdu saçım bəğeyri-giysu?
Zənəqdə qomən səvayi-yaşmaq.
Geymən əyağa be ğeyri-başmaq.
Könlüm tənim üstə məhrəm ancaq,
Özüm mən özümə həmdəm ancaq.
Kim dutdu saçımni ğeyri-şanə?
Cüz sayə qomən ki, kimsə yanə.

Qədr etmən aya ki, var hilalın,
Baxman günəşə ki, var zəvalın.
Pürxun deyə baxmazam be lalə,
Nərgisdən alurmiyəm piyalə?
Baxman qədi-sərvə nazlığdan,
Dərya suyun içmən azlığdan.
Müşk iyləmənəm, yüzü qaradır,
Güldəstələmən, yüzü paradır.
Dadman şəkəri ki, əsli neydir,
Mey içmən əz an ki, fe'li qeydir.
Çəng alman ələ ki, bulhəvəsdir,
Ney dinləmənəm ki, əz nəfəsdir.
Nərgisni görəndə xəstə dermən,
Reyhanü bəövşə dəstə dərmən.
Şəhlər eşigimdə qul qamusi,
Gül yaprağı hücleyi-ərusi.
Nə itdir o kim, özün der adəm,
Kuyimə sanur özüni məhrəm.
Neyçün sanuram mən ani insan?
Dərbanım iti itinə dərban.
Neyçün sanır ol özünü şeydən?
Ədd eyləməzəm mən ani heydən.
Bu xissət ilən həm ol münafiq,
Andan der imiş özüni aşiq.
Xurşid isəm, ani zərrə bilmən,
Əflak isəm, ani tərrə bilmən.
Yüz var isə eşqimin bəlasi,
Qılman birisində mübtəlasi.
Bu vəchilə kim, bolubdur övsaf,
Qul oldu qapuma Qaf ta Qaf.
Yüz min kişi aşiqim cəhanda,
Aşiq nə ki, sadiqim cəhanda.
Gəlməz biridən mana şikayət,
Bilür qamu qılmazam himayət.
Bu cümlədən ol nədəndürür piş?
Kim, məndən apara nuşi-biniş?
Kəmtərdən ani ki, kəm demişmən,
Layiq bu cəfayə həm demişicən.

Bilməz nədən ol kəmali-həddin?
Kimdir tanımazmı əslü cəddin?
Qatımda çü hiç keçməz ərki,
Övlatər ana bu işdə tərki.
Yoxsa ki, qaşım yayın qururmən,
Yüz navəki bağrına ururmən.
Bu bir neçə beyti söylə ana,
Olmaya dəxi ki, adım ana.

Şe'r əz zəbane-mə'şuq be təriqe-həzl
*(Mə'şuqənin dilindən istehza yolu ilə şe'r)*

Sən biədəbin nə həddidir hey,
Kim, sanamazam səni mən əz şey.

Açman sana mən kitabi-mehrim,
Övraqi-ümidin eyləgil tey.

Mən sana kəminə qul deməzmən,
Gər Kavus isən bu gün, əgər Key.

Dərd ilə əgər yüz il ölürsən,
Bir bus ilə qılmanam səni hey.

Bağrın kimi səd hezar dillər,
Çəngimdə mənim dəlindi çün ney.

Məndən sana, ey şikəstə məhrum,
Dərman xaçan ola, ya dəva key?

Eşqimdə Xətayi bəndəvandır,
Hər bab ilə xalis ərdürür vey.

Nameye-dovvom. Amədəne-Səba
əz zəbane-mə'şuq be aşeq
(*İkinci məktub. Səbanın mə'şuqənin sözləri
ilə aşiqin yanına gəlməsi*)

Qayıtdı Səba zi dərgəhi-şah,
Ğəmnakü məlul düşdü bər rah.

Bivayə şikəstə, könlü zəbzəb,
Ğəmdən sürəməzdi yolda mərkəb.
Ğəm yox dilinin dutulduğundan,
Kim, razıdurur qutulduğundan.
Deri kim, necə varım ol fəqirə,
Biçarəvü xəstədil həqirə?
Dəxi nə yüz ilə varım anda,
Ümmid ilə qasid etdi munda.
Ya anda neçük verim cəvabi?
Göndərdi itab ilən xitabi.
Bu işdə qılurdu didəm ahi,
Mən gözlər idim həmişə rahi.
Sərf etmiş idim ola bəsər mən,
Heç yanıma qılmadın nəzər mən.
Gah örtər idi yaşım gözümni,
Heç bilməz idim nəyəm özümni.
Hər ləhzə həvəsdən uymaz idim,
Gündüzlə gecəmni duymaz idim.
Görməgə Səbanı dildə tə’cil,
Hər gündə mana keçirdi bir il.
Nagah bu bağə düşdü bir saz,
Gəldi şəcərin başından avaz.
Titrəşdi bənövşə, bərgi-lalə,
Gül yarpağından töküldü jalə.
Bildim ki, irişdi nik canım,
Sönmüşdü rəvan dilim, rəvanım.
Gəlməxdə vəleyk səxt süst ol,
Dedim ki, cəfa qılıbdurur yol.
Kim, yolda sitəm çəkibdürür bəs,
Batmış ayağına xar ilən xəs.
Ya ana itab edibdir ol yar,
Yari gəlişində bir nəzər var.
Çün yetdi, dedim ki, nikuxah,
Halın necədir zi zəhməti-rah.
Həm söylə nigar sağ, əsənmi?
Ol fitnəli yar sağ, əsənmi?
Der: – Sağdır, əsəndir ol pəriru,

Səndən vəli eyləmiş bəri ru.
Əhvalın ana ərzə qıldum,
Ərzinə yetürməgini bildim.
Xişm etdi haman dəm əz səri-naz,
Çox ərbədə naz qıldı ağaz.
Yırtdı aluban yazan kitabi,
Biş etdi itab ilən xitabi.
Qıldı məni-xəstəni məlamət,
Başuma qopardı yüz qiyamət.
Qətl eyləməginə fikr qıldım,
Qurtulmağa sağ şükr qıldım.
Bəs ol qəzəb ilə türki-tənnaz
Xişm etdi sana be işvəvü naz.
Der: – Kimdürür ol xəsisü kəmtər,
Ögdi özünü qılıb mükərrər.
Dil munu eşitdi, narə düşdü,
Fəryadü fəğanü zarə düşdü.
Yaş etdi ümid evini parə,
Sögdüm yenə bəxti-nabəkarə.

Şe’r berəsme-şekayət əz bəxte-bəd və tale’e-xiş
*(Öz yaman bəxt və taleyindən şikayət yolu ilə şe’r)*

Ey bəxt, dedim ki olmagil şad,
Ğəmdən məni qılmadın sən azad.

Könlümni ğəm eylədin, gözüm nəm,
Olmağni fəğan, işimni fəryad.

Sən dadi-dilimni vermədin heç,
Munca ki, əlindən eylədim dad.

Hər yanə dönərsə çərxi-kəcrov,
Sən andan irağə bir qədəm ad.

Xandan sana bu bəlavü bid’ət?
Nerdən sana bu sitəmlə bidad?

Mö'minləri xürrəm etmədin heç,
Kafər beçəsənmi, yoxsa müğzad?

Bir gəz nola, ey bəlalı gümrah,
Qılsan mana rahi-vəslin irşad?

Yarəb, olasan ğəm ilə viran,
Viranə əlindən olmaz abad.

Eşq ilə, görüm ki, bəndə düşgil,
Olsun bu Xətayi səndən azad.

Ozr xastəne-aşeq əz Səba
*(Aşiqin Səbadan üzr istəməsi)*

Dedim ki, əya Səba, usandün,
Asudə otur çözüb kəməndün.
Daim bu cahanda var olasan,
Eşq əhlinə ğəmgüsar olasan.
Bir dəm sən otur betərfi-gülşən,
Bir qasidi dəxi istəyim mən.
Kim, səbrü qərarə çarə yoxdur,
Bağrımda nə dürlü yare yoxdur.
Bir dəxi qılım cahanda tədbir,
Ya ayəti mən tələb bulum bir.
Ol durdu çəməndə, mən yeridim,
Bir elçi dəxi bulum der idim.
Ərvahım uçurdu fikr teyrin,
Bir dəmdə cəhanın etdi seyrin.
Qayıtdı yerinə, qıldı pərvaz,
Der: – Elçi Səbadən özgə yox baz.
Bir çarə var isə, ol qılur həm,
Ondan ola bu yürəgə mərhəm.
Aldım tutuqi-həyani əz dil,
Dedim yenə Badə k-ey müzəmmil,
Qədd innə ərakə müstəinən,
Sə'fihi bekülli müqtərinən.

Ən lütfikə in qət’ətə səbrən.
Yö’tikə iləh əlfü əcrən.[1]
Səndən dəxi özgə çarə bilmən,
Mən durub ayağə varə bilmən.
Bir dəxi kərəmlər et mənimlən,
Canım yoluna fəda tənimlən.
Qalmışlara çün müavin oldin,
Məqsudə yetürüb alxış aldin.

Tə’rif kərdəne-aşeq Səbara
*(Aşiqin Səbanı əyməsi)*

Qalmışlara gər məməd bolansan,
Xızri-nəbi tək yetüb gələnsən.
Həm çar ənasirin birisən,
Çox mürdəni eylədin diri sən.
Hey qaldı dəminlə ibni-Məryəm,
Ənfasın edər behişti xürrəm.
Ol şey ki, ölüdür anda yoxsan,
Ol tən ki, diridir, anda çoxsan.
Oldun nəfəs ilə ətsi-Adəm,
Həm mərkəbi-sahibani-Xatəm.
Ey mö’tədil əlvücud bikövn,
Xoş dəmsənü həm məzaci-bilövn.
Dəryadə sürən çü Nuh kəşti,
Pür buyi-əbir edən behişti.
Əhməd dəmin ilə yari buldu.
Üşşaq sənin ilə yari buldu.
Aşiq kimi sübh cuş edərsən,
Dəryaləri pür nüquş edərsən.
Nəsrinlə sənin, e qüdrətullah,
Fərq oldu həmişədanədən kah.
Ruhül-qüdsün ki, həmdəmisən,
Həm türreyi-yar məhrəmisən.
Girən qapularə bitəkəllüf,

[1] Mən kömək istəyəndə səni gördüm, bütün yaxınlaşanlara köməyə səy et. Lütf edib geri qayıtmaq istəsən, Allah sənə min əcr verər.

Qılmaz sana heç kişi təxəllüf.
Çün Xızr həmişə dər həyati,
Kim, bolmaya ta əbəd məmati.
Bu yedi yerin qərari sənsən,
Həm yedi dəniz buxari sənsən.
Gülləri açan zi bəhri-bülbül,
Gülzarə salan şəmayim əz gül.
Adın sənin oldu ruhə təcnis,
Həmmali-rəvani-təxti-Bilqeys.
Yox vəsfinə hədd ilən nəhayət,
Ey həddi-kəmal ilən beğayət.
Görsət mana bir dəxi vəfa sən,
Lütf əhlivü mə’dəni-səfasən.
Bir dəxi var ol nigarə məndən,
Rəf’ ola məgər bu yarə məndən.
Ol ğönçə ləbin cəvabın algil,
Həq dərgəhinin səvabın algil.
Aydır ki, xoş ola, qılmazam ar,
Ya dutavü öldürə məni yar.
Gedim du hezar barə dersən,
Olam du hezar parə dersən.
Hərçənd ad ilə mən Səbayəm,
Üşşaq yoluna can fədayəm.
Əhsənt, dedim, əya vəfadar,
Mən Müntəzirəm, oturma, dur, var.
Verdim çü Səbayə neçə pəndi,
Dur indi, dedim, sözüm tükəndi.
Aldım əlümə dəvatü xamə,
Der: – Yazma dəxi sən ana namə.
Ol şux anı yenə parə qılur,
Ağ yüzini dəxi qarə qılur.
Yalğuz mən olam, əgər qıla ədl,
Tənha mən olam əgər qıla bəzl.
Izzət kim, edər hücumi-kəsrət,
Məqbuli-dua olur bu vəhdət.
Dedim: – Kərəm etdin, ey müvafiq,
Məhfuz olasan zi hər münafiq.

Yetür yerə anda hər ədəb var,
Yetməz işi xanda biədəb var.
Qatında sözün degil ki, ey şah,
Ol bəndə gərəklidir be dərgah.
Sən şahsən, ol ğulami-kəmtər,
Baxmazmı ğulamə şahi-kişvər.
Zülfin ki, bənövşədir, yüzün gül,
Güllər diləməzmi sövti-bülbül?
Gər lə'lin isə çü Şirin, ey yar,
Fərhad gərəkdir ana bir zar.
Gər zülfi-siyahın oldu Leyli,
Məcnun ona gər qılursa meyli,
Gər şəm'i-rüxündür ataş əfruz,
Pərvanə gərəkdir ana dilsuz,
Gər ləblərin oldu şəkkər əfşan,
Bir tuti gərək yanında xoşxan.
Zülfin isə dami-pür bəladır,
Olmazmı o damə mübtəladır.
Ol ğəmzə ki, tir edər fəşanə,
Bir sinə gərək ana nişanə.
Gər Yusif isən be Misri-dil şah,
Yə'qub gədək ğəmində pür ah.
Ol mur misali, sən Suleyman!
Bir mur gərək çü bəndə fərman!

Şe'r əz zəbane-aşeq
*(Aşiqin dilindən şe'r)*

Şah şahlığ edər çü nökər olsa,
Eşikdə ğulami-kəmtək olsa.
Xoşdur fələk üstə mahi-dilcu,
Amma ki, yanında ülkər olsa.
Xurşid önündə zərrə xoşdur,
Göglərdə müzəyyən əxtər olsa.
Daim yaşım ayağına damsun,
Sərv ayağı xub olur tər olsa.

Hüsni sifətin yazım kitabə,
Vəsfində xoş ola dəftər olsa.

Çövkan kimi zülfi var eşitdim,
Top olmağa ana bir sər olsa.

Alsun qulağa Xətayi şe'rin,
Şahlar qulağında gövhər olsa.

Be təşbih quyəd
*(Bənzətmə üçün deyir)*

Bəs söyləgil, ey Səba, İsara,
Ol mürdəni zində qıl, xudara.
Var anda münasibət sizinlə,
Təşbihi-mütabiət sizinlə.
Zülfin kimi qəddi xəm bolubdur,
Türrən ğəmidən behəm bolubdur.
Könlü dəhənin misalidir təng,
Bağrın təkidir məqam ana səng.
Çeşmin kimidir əlilü rəncur,
Xəttin kimidir vücudi bir mur.
Lə'lin təki çeşmi gövhər əfşan,
Zülfin kimi fikridir pərişan.
Ğəmzən kimi cismi tir ilən pür
Dişin kimi çeşmi dopdolu dür.
Müjən kimi könlü səhm içində,
Ağzın kimi zatı vəhm içində.
Muyin təki muyədən çü mudur,
Tiğin kimi çeşmi dolu sudur.
Hicrin təki vəslə çox ümidi,
Mehrin kimi fikri naümidi.
Türrən kimi bağlu biqərar ol,
Əksin kimi xəlqə mehrdar ol.
Kəfşin tək işi ayağa düşmək,
Saçın kimi solü sağə düşmək.
Qoy pirəhənin tək ola məhrəm,
Tərlik tək ola boyunla həmdəm.

Uzun saçınız təki ricası,
Cüz ğəm dəxi yoxdur aşinası.
Yaman gün içində xuyiniz tək,
Olmuş təni incə muyiniz tək.
Qucmaq dilər ol belin kəmərvar,
Yolunda anın təki kim ər var.
Saçın təki qəddi dalə dönmüş,
Lə'lin kimi yaşı alə dönmüş.
Dür kimi sözün dutub qulağə,
Düşmüş çü vəfan özü irağə.
Belin təkidir zəif avaz,
Işin təki halı müxtəlif saz.
Gözü yüzünüzdə zəngulun tək,
Pür lərzə vücudu mərğulun tək,
Düşmüş zənəxin misali çahə,
Baxar yüzüni ananda mahə.
Cə'din kimi əgri qəddi anın,
Mehrin təki yox da həddi anın.
Gözün təki cismi sayruluğda,
Qaşın kimi taği ayruluğda.
Güzgün tək özin dilər müqabil,
Irməz çü rəqib rəncə qabil.
Saçın təki başı payə düşmüş,
Fəryad ilə çəngü nayə düşmüş.
Alətləri mehr ola günüz tək,
Ğərqə yaşına çü səfiniz tək.
Var hümməti boyunuz tək ə'la,
Zülfin təki başı pür zi sevda.
Doğru yoluna misal balan,
Pürxun cigəri besani-lalan.
Çün səndə nə vardır anda dəx var,
Ağlatma yetər ki, xəndə dəx var.

Nameye-sevvom. Rəftəne-Səba be suye-mə'şuq
*(Üçüncü məktub. Səbanın mə'şuqənin yanına getməsi)*

Ol peyk Səba çü mindi atı,
Xoş sürdü iradət ilə qatı.

Gəh gerdə bulaşdı, gəh ğubarə,
İrişdi məqami-gül'üzarə.
Gördü ki, çəmən yenə münəvvər,
Zülfindən anın cahan müəttər.
Gördü anı bağbani-məhrəm,
Kim, gözlər idi yolunu hər dəm.
Yanına gəlib dedi ki, ey Bad,
Qıldınmı yenə bu kari bünyad?
Qayıt ki, bu işə çarə yoxdur,
Mundan nə cigərdə yarə yoxdur?
Anın təki iti var hezaran,
Fəryad konan, qəm ilə nalan.
Qılmaz birisi anın şikayət,
Olmaz, qamusu bilür, inayət.
Növ aşiq olubdurur o miskin,
Ol dəxi dapar son ucu təskin.
Qayıt, yenə bizni qılma bədnam,
Nagah özüni salma dər dam.
Söylədi Səba ki, əbsəm, əbsəm.
Öldürsə dəxi ki, çəkməzəm ğəm.
Sən varmaz isən varuram özüm,
Ərz eylərəm ana cümlə sözüm.
Mehr etsə, nə ğəm olu himayət,
Qəhr eyləsə, bəs degil kifayət.

Rəftəne-Səba tənha be bidare-mə'şuq
*(Səbanın tək mə'şuqənin görüşünə getməsi)*

Yeridi Səba çü bargahə,
Bağladı təvəkkülin ilahə.
Qıldı yer öpüb dua səlamı,
Ərz eylədi ol şaha kəlamı.
Çün gördü Səbanı Hüsn ilən Key,
Der: – Yenə nişə gəlibdürür hey.
Əl urdu, yapışdı yaxəsinə,
Saldı anı bəndi-türrəsinə.
Bağladı cəmii-tarəsilən,

Tar etdi günün sitarəsilən.
Bəs kari-Səba budur müdami,
Zülfi-sənəm ola bəndü dami.
Gördü anı huş rəfte əz tən,
Baxırdı ana zi ruyi-rövzən.
Bəs qıldı mənim sarı səfərni,
Der aşiqə verəyim xəbərni.
Qıldı qəlibən iraxdan avaz,
Bənd etdi Səbanı türki-tənnaz.
Getdi bu sözü deyib rəvani,
Göndərdim ana rəvani cani.
Ol huş nigarə getməsün baz,
Bədxudurur ol nigari-tənnaz.
Nagah bir işdə keyd edər yar,
Ol elçi tək anı qeyd edər yar.
Demiş ki, var ol fəqirə söylə,
Ğəm ləşkərinə əsirə söylə
Kim, oldu yerim bedərgəhi-şah,
Gəlmən mən ana məgər ki, nagah.
Bu söz yenə məni saldı narə,
Ağlıb yenə düşdüm ahü zarə.
Oldu yerim od çün səməndər,
Oldum yaxa yırtubən qələndər.
Çox şikvə qılubzi gərdişi-bəd,
Həm dəxi zi bəxtü taleyi-xəd,
Bixud qılubən fəğanü fəryad,
Bu şe’ri özümdən eylədim yad.

Şe’r berəsme-şekayət əz tale’
*(Taledən şikayət yolu ilə şe’r)*

Vaveyla ki, yar getdi əldən,
Ol sevgi nigar getdi əldən.

Yandım ğəm oduna sərbəsər, ah,
Dəstimdə nə var, getdi əldən.

Şad olma, könül, çək imdi ğəmlər,
Ğəm həmdəmi yar getdi əldən.

Neysan kimi tək gil, ey gözüm, yaş,
Ol tazə bəhar getdi əldən.

Bülbül təki dil fəğanə düşgil,
Güldəstə üzar getdi əldən.

Bu səbrü qərar getdi məndən,
Namus ilə ar getdi əldən.

Canım diləgi, rəfiqü yarım,
Hər nəstə ki, var getdi əldən.

Düş ayağa kölgə tək, Xətayi,
Ol sərvi-çinar getdi əldən.

*Məsnəvi*

Gəh zari, gəhi dilimdə nalə,
Düşdüm yenə mən şikəstə halə.
Yandım ğəm oduna sərbəsər mən,
Oldum yenə məstü bixəbər mən.
Dildən yenə atəş etdi cuşi,
Həm dərdi-dərun edib xüruşi.
Gördüm ki, kim isə yox rəfiqim,
Bu işdə ənisü həm şəfiqim.
Səbr etmək idim dedim behər hal,
Faş olmaya xəlqə sirri-əf’al.
Heç səbrü təhəmmülüm yox idi,
Dərdim yüküşü ğəmim çox idi.
Bir yar idi var mənə qədimi
Kim, könlümün ol idi nədimi.
Qılmışdı mənimlə elmi təhsil,
Çox ay rəfiqim idi, çox il.
Həm dərs oxur idi bir səbəqdə,
Ancaq nə səbəqdə, bir vərəqdə.
Görüş yox idi dər mədaris,
Qəmxanə bolub ana məcalis.

Olmuş məni istəyə müsafir,
Tərk olmuş ana zi ğəm dəfatir.
Mənsiz bu cahan ana daralmış,
Rüxsarı mənim təki saralmış.
Gəldi məni istəyə begülzar,
Gördü məni munda ağlaram zar.
Olmuş bu ğəm ilə didə giryan,
Der: – Noldu sana, e munisi-can?
Dedim: – Nə sorarsan, ey bəradər?
Kim, yuddu rəfiqi eşqi-əjdər.
Sataşdı gözümə yari-məhvəş,
Gül yüzlü pəri, nigari-məhvəş
Qalmadı qərar, usum tükəndi,
Ol nəng ilə namusum tükəndi.
Dərs imdi fəğanü dadə döndü,
Biliş mana qamu yadə döndü.
Uş peyki-Səbanı bəndə saldı,
Mən xanda idim ki, xanda saldı.
Məktubimi aldı parə qıldı,
Ağ yüzüni dəxi qarə qıldı.
Halım budurur, e həmdəmi-dil,
Tədbir nədir, mana dəva qıl,
Leykin demə səbr edim, təhəmmül.
Canım tükənir dəmi-təəllül.
Der bir dəxi göndər ana məktub,
Meyl edə məgər görəndə məhbub.
Amma biləsincə kişi qoşun,
Hər xansı xoş isə əqlü huşun.
Dedim ki, bu qatla huş varsun,
Bu naməyə pərdəpuş varsun.
Yondum yenə ba həvəs qələmni,
Qirtas üzə çəkib rəqəmni.
Dil yazdı mühəqqəq ol nişanı,
Nəsx etməyə xətti-reyhan anı.
Allahın adını yardım əvvəl,
Söz xətmi kəlamə boldu əkməl.
Qıldım anı sərbəsər xəmidə,

Bolmaya hava görüb dəmidə.
Ey namə, dedim ki, var ana sən,
Yanında məgər məni anasən.
Naməmdə qılıb bu şe'ri məktub,
Ünvani içində nami-məhbub.

Şe'r əz zəbane-aşeq be təriqe-elhah
*(Xahiş yolu ilə aşiqin dilindən şe'r)*

Ey naz məkani, sərvi-rə'na,
Ey didə məqami, hüsni-ziba!

Hicran oxu birlə yürəgimdən
Axıtmaq isə yetər hüveyda.

Ol zülfi-siyəh ğəmində hər dəm
Başımda qəti yer etdi sevda.

Yusif təki gördü göz cəmalın,
Dil düşdü zəvalə çün Züleyxa.

Lalə kimi çəkdi bağrıma dağ,
Ol zülfi-kəlaleyi-səmənsa.

Sevdayi-saçın şikəncü bəndi
Başımni çəkib yetirdi bər pa.

Qurtulmadı hicrdən Xətayi,
Munca ki, vüsal edər təmənna.

*Məsnəvi*

Büкdüm çü tamam edib kitabi,
Kəs dedim işimdə xurdü xabi.
Der dutunuz imdi hümməti-düz,
Mə'zulü şikəstə gəlməyə yüz.
Dedim ki, biləncə lütfi-mərdan,

Tən qaldı, səninlə getdi bu can.
Ol imdi rəvanə sağlığ ilən,
Gəl munda yenə yüz ağlığ ilən.

Nameyi-çəharom. Rəftən be suye-mə'şuq
*(Dördüncü məktub. Mə'şuqənin yanına getməsi)*

Huşimni çü mərkab etdi namə,
Əzm etdi ki, varə dilrübamə.
Götürdü anı həvayə ol huş,
Pər çaldı gedər çü namə bir quş.
Gəh pay ilə getdi, gah bər sər,
Gəh bəhr keçərdi, gah bər bər.
Saxlardı özüni cayi-xəmdən,
E'raz qılurdu abü nəmdən.
Gəh yazı kəsib gedirdi yola,
Gəh yel aparırdı anı kola.
Yetürdü özüni hər neçük var,
Ol bağə ki, mənzil etdi dildar.
Gördü yenə bağbani nagah,
Bir namə yenə be huş həmrah.
Gəldi yanına nihani ol dəm.
Ta qıla məlamət ani ol dəm.
Görgəc ani namə boldu lərzan,
Çün bid bevəqti-badü baran.
Der, yenə gəlibsən, ey həyasız,
Əldən bu işi nola qoyasız.
Bu sözü dəxi demə yanında,
Çox acığı var anın canında.
Namə dedi key mürəbbiyi-bağ,
Qoy mən oluram bu yerdə toprağ.
Sən eylər isən əgər müdarə,
Mən yetürərəm sözümni yarə.
Namə çü varub yükündi yarə,
Mədh etdi nigari-gül'üzarə.
Çün baxuban ani gördü məhru,
Dedi: – Yenə gəldin, ey siyəh ru.

Qorxu bilə namə düşdü lərzə,
Olmaya dedi sözümdə hərzə.
Şükr etdi başında hu görəndə,
Öz adimə qıldı tu görəndə.
Sər ta qədəm oxudu kitabi,
Başladı itab ilən xitabi.

Həzl kərdəne-mə’şuq namera
*(Mə’şuqənin məktuba istehza etməsi)*

Ey yüzü qara, füzul, ədəbsiz,
Heç bilimədiniz nədir ədəb siz.
Ari su toxunsa tər bolursan.
Yeldən dəxi dərbədər bolursan,
Əslindürür ol çürük ləvatə
Kim, dirələr ani əz sibatə.
Gərçi səni əhli-mə’ni derlər,
Çox sözüni bülməəni derlər.
Yüzün ikidir, biri siyəhdir,
Hər ruyi-siyah pür günəhdir.
Qəddini qılur yazan kişi xəm,
Ta olmayasan hava görüb nəm.
Kim sən təki sudan eyləsə bak,
Nabak derəm ki, olmaz ol pak.
Nə suyə giricisən, nə oda,
Daim sən olasan uş bu xuda.
Gər zahirinizdə nəstə yoxdur,
Leyk alacalığ içində çoxdur.
Salus kimi əridübən daş,
Bir barmağ açub sirin qılur faş.
Görən kişi səndə bu səbati,
Sürtər yüzinə gəhi dəvati.
Hey beylə cəvanü hərzə gusən,
Ğeybətçi, yalançı tubetusən.
Çox yerdə yüzünə xak edərlər,
Çox suda yaxanı çak edərlər.
Biəqlü zəbanü bibəsərsən,

Anın içün çü xaki-sərsən.
Qılsam səni parə-parə şimdi,
Etsəm yüzüni qarə şimdi,
Heyfa ki, başında nami-həqdir
Kim, əksük işin təmami həqdir.
Məndən hələ var o xamə söylə,
Çox elçi uyurma, namə söylə.
Hər ləhzə xəyali-fasid etmə,
Özin tanımazni qasid etmə.
Çox etmə dəxi bu fikri-xami,
Bir çöpə degil yanımda nami.
Sevdayi-əbəs dəxi bişürmə,
Ol mərtəbədən özün düşürmə.
Dutma dəxivəslimə ümidi,
Gün adətim oldu naümidi.
Demə dəxi möhməlü əbəslər,
Söylər əbəs işi bulhəvəslər.
De məndən ana bu neçə sözni,
Dutmayə dəxi vüsalə gözni.

Şe’r əz zəbane-mə’şuq be təriqe-naomidi
*(Mə’şuqənin dilindən ümidsizlik tərzində şe’r)*

Ey bülhəvəsü şikəstə ğəmnak,
Yüz sən tək olursa, eyləmən bak.

Kur olsa be giryə hər du çeşmin,
Nə sürmə verəm, nə bir ovuc xak.

Əlin kəsərəm bu damənimdən,
Gər yaxən olursa yüz gəz çak.

Gər bəhri-cəvahir olsa şe’rin,
Sallam bekənar həmçu xaşak.

Sən adəm isən, firiştəyəm mən,
Pak ilə hərim olurmi napak?

Mən yerdə ününi dinləməzmən,
Fəryadın əgər yetər be əflak.

Vəslümə Xətayi şad bolmaz,
Ğəmnak dil olsa, didə nəmnak.

Nameye-pəncom. Əz tərəfe-mə'şuq be aşeq
*(Beşinci məktub. Mə'şuqdan aşiqə)*

Bu sözü çü Namə guş qıldı,
Sərtasər özüni puş qıldı.
Çox oldu məlul, piçə düşdü,
Kim, lafi bu yolda hiçə düşdü.
Der: – Necə varım mən ol fəqirə?
Biçarəyə, dərd ilən əsirə.
Mindi yenə huş atını Namə,
Yüz ğəm ki, irişmədim məramə.
Mən anda şikəstə, zarü giryan,
Yola baxuban cigər çü büryan.
Müştaq rəsulə gecə bixab,
Tökürdü rəfiq didədən ab.
Nagah göründü, Namə gəldi,
Dedim ki, işim nizamə gəldi.
Verdi gəlübən mana səlami,
Sordum: – Necədir yarın kəlami?
Dil bəstəvü xəstə görünürsən,
Ğəmginü şikəstə görünürsən,
Der: – Sorma, əya zəlilü məhrum,
Verməz sana yari taleyi-şum.
Olmadı sözüm qəbul yarə,
Qəsd etdi qıla tənimni parə.
Ünvanimə hörmət etdi bari,
Həqq adına qıldı e'tibari.
Andan səni andı, qıldı bidad,
Mən qılamazam o sözləri yad.
Çün yenə bu sözü eylədim guş,
San ağu şərabin eylədim nuş.

Axdı yenə qanlı yaş gözümdən,
Getdim bixud oluban özümdən.
Dildən yenə atəş etdi cuşi,
Həm dərdi-dərun edib xüruşi,
Bəxtim əlidən şikayət etdim,
Ucundan anın çü canə yetdim.

Şe’r əz zəbane-aşeq berəsme-şekayət əz tale
*(Aşiqin dilindən taledən şikayət tərzində şe’r)*

Dedim ki, ilahi, bəxti-bədkar,
Görim ki, həmişə ola bidar.

Qurtulmadı can bu dərdü ğəmdən,
Ta necə bolam şikəstə bimar?

Ta key qılasan gədani məhrum,
Gəlmə dəxi yanimə, yeri var.

Həq qatda şikayət edəsimən,
Cövründən, əya nügunü bədkar.

Dil pür ğəmü can işində rəncur,
Göz qan ilə dolu, canım əfkar.

Dövründə sənin bu xəstə halın
Gəh zaridir işi, gah bizar.

Ey tazə güli-bəhari-xubi,
Ta key qılasan cigərni pür xar?

Ta necə Xətayi dərdməndin,
Rövşən gününi sən edəsən tar?

Məşvərət kərdəne-aşeq ba rəfiq
*(Aşiqin dostu ilə məsləhətləşməsi)*

Yenə dedim ol rəfiqə halım,
Artırdı qatı ğəmü məlalım.

Bu işə həq içün eylə tədbir,
Əldən gələn işi qılma təqsir.
Bu dərdilə mən həmişə zarəm,
Ğəmxar beh əz tu kəs nədarəm.
Fikr etdi başın çəkib becamə,
Der: – Bir dəxi göndər ana namə.
Əvvəl göricək şəfi olur kəs,
Çox görsə sözü qəbul edər bəs.
Həm aləmin oldurur rəsuli,
Kəs söz deyən eyləməz üduli.
Şahdan gedər ol həmişə şahə,
Girər biicazə bargahə.
Çindən yazılıb Xətayə namə,
Gəh Rumdən elçi getdi Şamə.
Hökm etdi anın bilə qəyasir,
Qalmışlar ol çox oldu nasir.
Ol yaxşı-yamandan eləməz xovf,
Saxlar qamunun sirini dər cövf.
Hər söz desən anda ani söylər,
Nə özgə kimi yalani söylər.
Saxlarlar anı baş üstə daim,
Qoyarlar öpüb qaş üstə daim,
Söylər sözü, gərçi dili yoxdur,
Avaz ilə qalü qili yoxdur.
Yazılı başında nitqi-Allah,
Hər yerdə var ana mənzilü cah.
Cahil kişi birlə yox səfası,
Aləmlərin oldur aşinası.
Gəh dili əcəm, gəhi ərəbdir,
Pür rəsmü üsul, ba ədəbdir.
Qılurlar ana çox ehtirami,
Xətmində görəndə vəssəlami.
Andandurur adı pak damən,
Yaman deməz ana yaxşı-yamən.
Mən dəxi yonub rəvani xamə,
Yazdım be həvəs fəraqnamə.
Yazdım başı üstə nami-cəbbar,

Sonunda hezar barə zinhar.
Kim, sana ğulamü çakərəm mən,
Əz cümlə kəminə kəmtərəm mən.
Çox yalvaruban çü yazdım ani,
Dedim: – Aparıcı şimdi xani?
Der: – Qoşgil anınla peyki-ahın,
Varmaya yüzinə padşahın.
Kim, bəddir anın nəfəs məqali,
Tünd etməyə ayinə cəmali.
Söylə xunu olsun ol şəfiqi,
Yandırmaya yolda ta rəfiqi.
Çün Ahimə verdim uş bu pəndi,
Dur indi dedim, sözüm tükəndi.
Çün Ahilə gögə çıxdı Namə,
Əzm etdi gedər o dilrübamə.
Dedim ki, rəsulə yari-ğarım,
Tez gəl ki, gedibdir ixtiyarım.
Hər işdə çü ittifaq xoşdur,
Ağacda pərü budağ xoşdur.
Puş etmə yüzüni, aç gözüni,
Bəs ərzə qıl anda hər sözüni.
Bu şe'rimi yarə söyləgil sən,
Ol lalə üzarə söyləgil sən.

Şe'r əz zəbane-aşeqe-sadeq
*(Sədaqətli aşiqin dilindən şe'r)*

Ey sevgi nigar böyləmolur?
Üşşaqinə yar böyləmolur?

Hicran qışı birlə zar qaldım,
Ey tazə bahar, böyləmolur?

Gülzari-rüxün ğəmindən oldu
Bağrum dolu xar, böyləmolur?

Ol nuri-rüxündən ayru, ey mah,
Yaxdı məni nar, böyləmolur?

Zülfinlə üzarın aldı canım,
Hər leylü nahar, böyləmolur?

Oxunla Xətayi boldu məcruh,
Hər oxa şikar böyləmolur?

Nameye-şəşşom. Rəftəne-name
Behəmrahiye-ah Besuye-mə'şuq
*(Altıncı məktub. Məktubun Ahın yoldaşlığı ilə Mə'şuqənin yanına getməsi.)*

Qıldı sözümü qəbul məktub,
Əzm etdi, yeridi suyi-məhbub.
Mindi yenə Ahımın rikabın,
Tərk etdi bu yolda xurdü xabın.
Yetürdü özin be kuyi-dildar,
Çün aldı dimağə buyi-dildar.
Uğraşdı yenə o bağbanə,
Sordu: – Nişə gəldin, ey fəsanə?
Dün munca məlamət etdi ol yar,
Yox səndə, nə onda ğeyrətü ar.
Mindin niyə neyçün atəşin at,
Gəldin çü piyadə, qaldı şah mat.
Ol sözlə səni çü göndəribdir,
Bir söylə ki, nişə döndəribdir?
Der Nanə ki, ana söylədim çox,
Dutmaz sözümü, qərarı heç yox.
Zinhar qılur ki, tanriçün var,
Ta rəhm edə mən fəqirə ol yar.
Ya qıla səni bu yolda parə,
Ya dəxi qılam bir özgə çarə.
Bir dəxi var anda, ey vəfalu,
Xeyr olur işin əgər xətalu.
De müshəfi-ruyiniz həqiçün,
De heykəli-muyiniz həqiçün,
Gəlmiş yenə ol rəsuli-aşiq,
Ol pak nəzər ğulami-sadiq.

Bir neçə pəyami var qatında,
Ərz eyləyə anı həzrətində.
Vardı yenə yarə bağbani,
Təşviş oduna əridi cani.
Toxuşdu dili gəlib kəlamə,
Aydır: – Yenə gəldi dünki Namə.
Miskin yenə fikri-xam bişürmiş,
Ol bihudəni yola düşürmüş.
Eşitdi bu sözni, cuş qıldı,
Peymaneyi-qəhri nuş qıldı.
Der var gətir ki, kimdürür ol,
Munca nə gəlür beqovli-mahövl,
Qorxmadı məgər zi kari-mazi?
Qurtulduğuna degilmi razi?

Amədəne-bağban pişe-name. Be xedməte-mə'şuq bordən
*(Bağbanın məktubun yanına gəlməsi*
*və onu Mə'şuqənin xidmətinə aparması)*

Ol dəxi gəlib edir ki, dur, dur.
Gəlsin dedi munda yari-məşhur.
Leyk etdi itabilən xitabi,
Der anlamadımı dün cəvabi.
Yüz qaralığilə vardı Namə,
Irişmədigin bilirdi kamə.
Çün gördü onu nigari-məhru,
Der: – Yenə nə gəldin, ey əbəsgu?
Heç söyləmədin alıb əlinə,
Baxdı açıb anın əvvəlinə.
Qazıdı, götürdü nami-cəbbar,
Pəs eylədi naməni du səd par.
Çün gördü anın bu halını huş,
Gəldi mana biqərarü bihuş.
Gəldivü iraxdan etdi avaz:
– Qəhr etdi rəsulə türki-tənnaz.
Səd parə qılıbdır ol sitəmkar,
Gəlməz dəxi var, özünə qıl çar.

Bu söz yenə qıldı canı büryan,
Ğəmnak könülni, çeşm giryan.
Vardım yenə ol rəfiq qatına,
Ol munisü dil şəfiq qatına.
Çox etdi mənimçün ahü vayi,
Gözündən axıtdı dürlü çayi.
Der: – Xanda bulam əlacın, ey yar,
Kimdən bitə ehtiyacın, ey yar,
– Sən bil, – dedim, – ey mana mürəffəq,
Öldüm bu ğübar ilən mühəqqəq.
Fikr edüb aşağə saldı başin,
Der: – Göndər ol ayə çeşm Yaşin.
Mərdümzədələrcə möhtərəmdir,
Kim möhtərəm olsa, ol hərəmdir,
Dilbər qapusuna ol səpər su,
Qoymaz gözünə beğəflət uyxu.
Axar sənəm ayağına çün çay,
Dürdanə bilən səni qılur bay
Xüşk olsa damağ, edər tər ol yaş,
Pür qıldı gözün zi gövhər ol yaş.
Həm dəmbədəm ol yüzün aridür,
Hiç olmaz anın təki arı dür.
Dür töksün önünə danə-danə,
Yar andan edər qulağə tanə.
Eynindən olur rəvan çü zəmzəm,
Oldur sənin ilə doğru həmdəm.
Boldum çü vüquf bu xəbərdən,
Qan doldu iki gözüm cigərdən.
Mərdümə dedim ki, nuri-eynim
Kim, səndən alur bu nuri eynim.
Bu gün mənim ilə bir iş işlən,
Fərzəndinizi mana bağışlan.
Kim, elçi qılam o dilrübayə,
Şayəd ki, bulam anınla vayə.
Gözüm bu sözüm dutub dedi: – Al,
Fərzəndi-əziz, caməsi al.
Çox sərzəniş etdi ana kirpük,

Ta ola mənim işimdə çabük.
Mərdümdən alub betöhfə gövhər,
Axdı, yeridi besuyi-dilbər.
Dedim ki, nigarə ver səlami,
Sonunda oxu bu qaç kəlami.
Ol səxt dili məgər ola nərm,
Sərd ikən ola bizimlən ol gərm.
Bəs oxu bu şe'ri yar qatında,
Ağla bəsi zar-zar qatında.

Şe'r əzzəbane-aşeq be təriqe-elhah
*(Aşiqin dilindən yalvarış tərzində şe'r)*

Ey tuba budağı, sərvi-dilcu,
Ey bağça nihalı, yari-niku.

Sən şad olasan cahanda daim,
Öldürdü məni yolunda qayğu.

Bir mu mana vermədin saçından,
Ey hüsnü pəri, nə xudurur bu?

Hicrin məni uştə dağə saldı,
Sən nerdəsən, ey ğəzalə ahu?

Ülkər kimi yolda qaldı çeşmim,
Görsət yüzün; ey nigari-məhru.

Döndərdi ğəmin tənim hilalə,
Bir gəz mana görsət axir əbru.

Ol incə miyanınız ğəmindən
Hicr ilə vücudum oldu bir mu.

Çox yaşimi didədən bu dəm al,
Gəl abi-vüsal ilən məni yu.

Sən necə sitarəsən ki, hər şəb
Apardı ğəmin gözümdən uyxu?

Dərd ilə Xətayi oldu bimar,
Tiryaki-ləbindən eylə daru.

Nameye-həftom. Rəftəne-əşq besuye-mə'şuq
(*Yeddinci məktub. Göz yaşının Mə'şuqun yanına getməsi)*

Çün yola düzəldi, Yaş getdi,
Əql ilə rəvanü baş getdi.
Axdı, yeridi besuyi-dildar,
Mərdümək adı, özü göhərbar.
Qılmadı bu yolda bir dəm aram,
Sidq ilə işimə qıldı ehram.
Xub sürdü rikabın ol vəfadar,
Ol gülşənə yetdi k-ondadır yar.
Görgəc anı çəkdi atı başin,
Səncidə qılurdu içü daşin.
Heyrət gözü birlə baxar idi,
Yar suyinə könlü axar idi.
Qılmaqda tamaşa gülstanə
Oldu gözü tuş bağbanə.
Çün gəldi yanına bağbanın,
Sordu xəbərin nədir nişanın.
Der: – Qasidəm ol şikəstə zarə
Kim, aşiq olubdur ol nigarə.
Lütf eylə yeri, bu bəndədən var,
Ərz eylə ana dilimdən əsrar.
Degil yenə gəldi özgə qasid,
Təhqiq gəlibdir ol nə qasid.
Bir töhfə əlində gövhəri var,
Arizdir özüvü cövhəri var.
Gər mehr qılursa sərvi-dilcu,
Bağına həmişə bağlayım su.
Çün ona bu növ'i rüşvə verdi.
Naziklik işinə işvə verdi.
Tez vardı, nigarə söylədi ol.
Ol sevgili yarə söylədi ol.
Der: – Yenə sizə rəsul gəlmiş.

Ba tövrəvü ba üsul gəlmiş.
Pak eyləmiş ol üyuni-zati,
Bənzər kişi oğluna sifati.
Bir töhfə əlində gövhəri var,
Özü əvəz əldə cövhəri var.
Dedim: – Nerədən gəlürsən, ey yar?
Aydır ki, zi aşiqi-cigərxar.
Dildar yenə itabə düşdü,
Zülfi təki piçü tabə düşdü.
Der: – Var, degil ki, getsin anı,
Algil mana əldə tərcümanı.
Var de, desin ol cəfagüzinə
Qatımda özü nədir, sözü nə?
Çox etmə şikayə firqətimdən,
Qurtarmanam anı hirqətimdən.
Məndən apar ana naümidi,
Ta dutmuya vəslimə ümidi.
Bu şe'rimi qılsun anda ağaz,
Dutmaya ümidi mehrimə saz.

Şe'r əz zəbane-mə'şuq betəriqe-naomidi
*(Mə'şuqənin dilindən ümidsizlik tərzində şe'r)*

Ey əbləhü bimuradü bihuş,
Peyğamına dəxi dutmanam guş.

Alman səni mən fəraq əlindən,
Qılgil bu xəyali sən fəramuş.

Meydanda başını top çalman,
Çövkani-saçım yüz olsa bər duş.

Min qatla səni mən eyləmən yad,
Gər qılmaz isən məni fəramuş.

Yüz sən təki huşyar könlü
Eşqim anı qıldı məstü mədhuş.

Yetərmi əlin, e dəsti-kutah,
Mən sidreyi-sərvəmü qəbapuş.

Bu nəqşi-üzarımın ğəmindən
Yüz lövhi-könüllər oldu mənquş.

Niş oldu Xətayiyə bu ən'am,
Çün şəhdü şəkər sən eyləgil nuş.

Amədəne-bağban be suye-əşk. Xəbəre-naomidi
(*Bağbanın göz yaşının yanına gəlməsi.
Ümidsizlik xəbəri)*

Gətirdi çü bağban xəbərni,
Der: – Qıldı qəbul ol gəhərni.
Leykin sana şah verdi dəstur,
Getsün dedi tez, oturma, dur, dur!
Göz yaşı bulandı, oldu meygun,
Könlü bu xəbərdən oldu məhzun.
Ğayətdə məlul, halı zəbzəb.
Bu fikr ilə sürməz idi mərkəb.
Aydır: – Necə varım ol cəvanə?
Eşidə bu sözü, odə yanə.
Hər fikr ilə, hər ğəm ilə yetdi,
Gülşən yörəsini ab dutdi.
Şad oldu könül ki, gəldi Yaşıim,
Titrər zi həvəs içimlə daşim.
Çün gəldi mənim yanuma yetdi,
Sordum ana kim, nigar netdi?
Ğəm könlünə xeyli kar qılmış,
Ya cövrü cəfami yar qılmış?
Der: – Sorma, əya ğəribü məhrum,
Verməz sana vayə taleyi-şum.
Gər qıldı qəbul töhfəmizni,
Görmədi vəli çü töhfə bizni.
Çün yenə bu sözni eylədim cəm',
Ah oduna can tutuşdu çün şam'.

Dedim yenə ol rəfiqi-halə,
Yaşdan dəxi yetmədim vüsalə.
Bəs dəxi nedim, nəsihət eylə,
Əltafü kərəm, mürüvvət eylə.
Aydır: – Yenə göndərin ana Yaş,
Ğəmxardurur sana o qəllaş.
Dərdi-dilini o yaxşı bilür.
Əldən gələni yolunda qılur.
Çün töhfəni eyləmiş qəbul ol,
Mehr etməginə ümidvar ol.
Bir ləhzə fəğanü zari qıldım,
Yaşı yüzüm üstə cari qıldım.
Əhlən, – dedim – ey gözüm çırağı,
Dur yenə sən eyləgil yarağı.
Ğeyr əz tu bu işdə piş görmən,
Hər yadı özümə xiş görmən.
Sən vargil, əya cigər parası,
Məskən sanadır gözüm arası.
Mərdümlik edib söz etdi qəbul,
Almış nəfəsi xəsisü məchul.
Durdu yenə aldı ərməğani,
Ol sərvə saru gedər rəvani.
Dedim ki, səna qıl ol həbibə,
Bəs halımı ərzə qıl həbibə.
Bəs oxu bu şe’ri yarə qarşu,
Bülbül kimi gül’üzarə qarşu.
Ta yad edə bu şikəstə halı,
Az edə məgər ğəmü məlalı.

Şe’r əzzəbane-aşeq
*(Aşiqin dilindən şe’r)*

Ey yar, noleydi dilbər olsan,
Ey mah, noleydi mehtər olsan.
Bədtərdir işim, ləbim dəxi xüşk,
Tər qılsan oları behtər olsan.

Qəhr ilə cəfanı xeyrə döndər,
Kim dutar əlin əgər şər olsan?

Rəhm eyləgil imdi bər müsəlman,
Bütsən, nə əcəb ki, kafər olsan.

Gümrahdurur könül ğəmindən,
Vəslin saru ana rəhbər olsan.

Rəhm eylər idin Xətayiyə sən,
Bir qatla ana bərabər olsan?

Nameye-həştom. Rəftəne-əşk
Bare-dovvom besuye-mə'şuq
*(Səkkizinci məktub. Göz yaşının ikinci dəfə Mə'şuqənin yanına getməsi)*

Çün yola düzəldi. Yaş getdi,
Əqlü dilü didə, baş getdi.
Bulandıvü daşdı, çayə döndü,
Gəh suyəvü gəh həvayə döndü.
Ol sərvi rəvan saru yeridi,
Irişməgə yarə yürür idi.
Ol bağə irişdi hər neçük var,
Etmişdi məqamin anda dildar.
Istib yenə bağibani buldu,
Bir cism idi ol ki, cani buldu.
Dedi ki, həm ol fəqirü bimar
Göndərdi məni sana digər bar.
Var bir dəxi lütf edüb nigarə,
Rəhm edə məgər o dilfikarə.
Ol rüşvə ki, demişəm, bər anəm,
Əz qofte xelaf mən nədanəm.
Mehr etsə, sənindir anda minnət,
Mən mərdüm isəm, sən eylə hörmət.
Almağa cəvabi yeri, var tez,
Al get göhəri bedəst aviz.

Çün bağban aldı ol göhərni,
Vardı ki, ala nədir xəbərni.
Yetürdü nigarə töhfəni çün,
Gördü pərirüx o töhfəni çün,
Der: – Söylə ki, gəlsün ol rəsulə,
Varmı görəli sözü qəbulə.
Gər qabil olursa həzrətimdə,
Xas eyləyəm anı xidmətimdə.
Çün gəldivü bağban dedi: – Dur.
Xas etdi səni o yari-məşhur.
Yaş getdi rəvani həzrətinə,
Mədh etdi duayi-dövlətinə.
Yar aydır ana ki, ey cigərxun,
Çox etmə bu yolda sən cigər xun,
Derlər səni çünki zadi-mərdüm,
Olmuş vətənin səvadi-mərdüm.
Hər yerdə ki var, hörmətin var,
Hər xanda ki olsa, izzətin var.
Çün əslilə mərdüməklisən sən,
Gəlgil mana kim, gərəklisən sən.
Sərvəm, dilərəm yanımda bir cu,
Gülzari-cəmalimə gərək su.
Bir çeşmə gərək önümdə pür ab,
Ta bola ləbim anınla sirab.
Şirin ləb isəm xoş ola gülgun,
Xunxarə isəm, mana gərək xun.
Leyliyə gərək səbuyi-pür ab,
Ta naqə bola səfərdə sirab.
Həna xoş ola bu mən nigarə,
Ta hər dəm əlim dutam nigarə.
Çün hüsn iləyəm şəhi-Xorasan,
Həm Xosrovi-mülkü təxti-Iran.
Mülkimdə gərəkdir abi-Ceyhun,
Sürxab gərək kim, ola dəmgun.
Şiraz şəhi mənəm, ləbim xəmr,
Bağdad məhi mənəm, ləbim səmr.
Axsun vətənimdə şətti-Bağdad,

Gəzsün çəmənimdə Rükniabad.
Mərdüm çü səni oxur dürəfşan,
Xaki-dərim üstünə dür əfşan.
Çün muca gərəklüsən mana sən,
Neyçün varasan dəxi ana sən?
Gər beylə səni irağə salur,
Yüzdən sürübən ayağə salur,
Qoyman dəxi anda gedəsən sən,
Qasidliğin anın edəsən sən.
Yaşım dedi ki, əya pəri ru,
Səndən xaçan eylərəm bəri ru?
Çün sana gərəklüyəm, mana sən,
Bir xidmət edər qulam sana mən.
Ondan dəxi səndən ötrü gəldim,
Gördüm çü yüzüni, baxa qaldım.
Amma diləröm ki, ey pəri ru,
Bir dəxi varam o xəstə saru.
Dəsturun olursa, varayım bir,
Olan xəbərini verəyim bir.
Mərdümdən alam yenə iradət,
Xoşdur oğul işi ba icazət.
Aydır: – Yeri var, zud gəlgil,
Od kimi varub çü dud gəlgil.
Məndən dəxi aparma naümidi,
Nə ümid apar, nə naümidi.
Degil dəxi kəsməsün ricayi,
Şayəd qılam ana mən vəfayi.
Degil çü yanımda kəşfin oldu,
Vəslim diləmək bəs işin oldu.
Şəh qatda kimin ki, adəmi var,
Əz cövrü sitəm nədən ğəmi var?
Göz yaşı sevindi, düşdü bər rah,
Der bəndəyə mürvət etdi ol şah.
Tə’cil ilə axdı ol axar su,
Nurkən yügürür misali-ahu.
Gördüm ki, gəlür, rəvan yügürdüm,
Baxdım yüzünə qılıb təbəssüm.
Aydır ki, ver imdi müjdəgani.

Meyl etdi sana nigari-cani.
Nomid oturma gəl vüsalə,
Şayəd səni hicr əlindən alə.
Çün bu xəbəri eşitdi guşim,
Gəldi yerinə qərarü huşim.
Əql ilə könül birər barışdı,
Aram ilə səbrü dil qarışdı.
Əltafi-xudayə şükr qıldım,
Bu şe'ri o dəmdə fikr qıldım.

Şe'r əz zəbane-aşeq betəriqe-şokr
*(Aşiqin dilindən razılıq tərzində şe'r)*

Meyl eylədi yar, həmdülillah,
Dil tapdı qərar, həmdülillah.

Demiş ki, vüsalə qabil oldu,
Ol sevgi nigar, həmdülillah!

Mərhəm edəsi cigərdə dağə,
Ol lalə üzar, həmdülillah!

Qılsun eşigimdə demiş ol sərv
Yaşımni nisar, həmdülillah!

Hər ləhzədə səd hezar bər həq,
Hər gündə hezar həmdülillah!

Nəsx olmağı bilmişəm mühəqqəq
Dildən bu ğübar, həmdülillah!

Vəslinə həbibinin Xətayi
Ümmid dutar, həmdülillah!

Tə'rif kərdəne-aşeq əşkra
*(Aşiqin göz yaşını öyməsi)*

Ol Yaşə dedim ki, nuri-didəm,
Kim, səndən alur bu nuri didəm.

Qıldin mənim ilə mərdümi sən.
Çün çeşmim içində mərdümisən.
Yerin ola təxti-didə daim
Kim, gözüm önündəsən mülayim.
Mərdümlə həmişə aşinasən,
Gözlərdə müdam rövşənasən.
Bu saru yüzümni al edənsən,
Öz cismini paymal edənsən.
Bir dəxi mənimlə mərdümi qıl,
Var yarə yenə yeni xəbər bil.
Gör kim, bu ümid ta be keydir,
Vəslilə xaçan bu mürdə heydir?
Ta ki, dəmi-və'də olmaya fovt,
"Əlmontəzirü əşəd minəl movt".
Bu şe'ri nigarə söyləgil sən,
Mehr edici yarə söyləgil sən.

Şe'r əz zəbane-aşeq berəsme-tə'rife-mə'şuq
*(Aşiqin dilindən Mə'şuqəni tə'rif tərzində şe'r)*

Ey şux, həmişə olsan şad,
Hər sərv misali ğəmdən azad.

Şəhla bola ol du çeşmi-nərgis,
Rüx tazəvü tər çü bərgi-şümşad.

Bünyadi-cəmalın ola qaim,
Qıldın bu xərab evimni abad.

Hörutdan ol be fitnə fəttan,
Həm sehr ilə Samiridən ustad.

Görməyə cəhan içində nöqsan,
Ol hüsni mələk, rüxü pərizad.

Hər dəm yaşım, ey Əzizi-Misri,
Yanında axar çü şətti-Bağdad.

Çün sana Xətayi aşinadır,
Olmuşsan ana nə mə'nidən yad?

Nameye-nohhom. Rəftəne-əşk
bare seyyom besuye-mə'şuq
*(Doqquzuncu məktub. Göz yaşının üçüncü dəfə*
*Mə'şuqənin yanına getməsi)*

Ol əşk yenə çü mindi atı,
Ümmid ilə atı sürdü qatı.
Çox lö'lö götürdü ərməğani,
Ol sərv saru gedər rəvani.
Çün yetdi bekuyi-kaxi-dilbər,
Gördü sənəmi-firiştə peykər.
Bər səhni-sərirü tac bər sər,
Durmuş ayağ üstə sərvi-ər'ər.
Yaşım çü irişdi həzrətinə,
Ol yari-vəfalu xidmətinə.
Məndən çox ana qılıb dualar,
Kəşf etdi dua ilən sənalar.

Şe'r əz zəbane-aşeq betəriqe-dua və səna
(*Aşiqin dilindən dua və alqış tərzində şe'r)*

Yarəb, sana həq bola nigəhdar,
Üşşaqinə bol ğəmində ğəmxar.

Bimarə vüsalın oldu şərbət,
Hər işdə sana həq edə timar.

Hafizliğ içün du zülfi-zəngi
Ol Rumi rüxündə ola dəvvar.

Gülzari-cəmalınız ğəmindən
Bülbül təki eyləsün məni zar.

Gənci-rüxün üstə hafiz etsün
Bir həlqə saçını həmçü şəhmar.

Mən kimi hezar aşiq olsun
Ol mehri-rüxün ğəmindən əfkar.

Gül kimi üzarınız cəfası
Qılsun dilü canları pür əz xar.

Hicrində Xətayi xəstə halə
Vəslin qıla çələb nigəhdar.

Nərm şodəne-dele-mə'şuq və həvadariye-əşk
və tə'rif kərdəne-ura
*(Mə'şuqənin ürəyinin yumşalması, göz yaşına havadarlığı və onu öyməsi)*

Eşitdi bu sözni sərvi-dilcum,
Oldu dili-səxti nərm çün mum.
Çox eylədi Yaşə mədhü təhsin,
Təhsin ilə qıldı sözni təzyin.
Aydır ki, əya düri-məani,
Kim mərdüm ola budur nişani.
Qıldın çü mənimlə əhdinə cəhd.
Bəs mərdüm olan dürüst edər əhd.
Bəs sordu neçükdürür bu miskin,
Hicran qəfəsində mürği-ğəmgin?

Şe'r berəsme-porsidəne-mə'şuq hale-aşeq
(*Mə'şuqənin Aşiqin vəziyyətini soruşması tərzində şe'r)*

Der söylə ki, ol ğəmin əsənmi?
Hicrində gözü nəmin əsənmi?

Ol eşqimə sadiqim nə işdə?
Ol könlü arı zi kin əsənmi?

Kafir gözüm anı çox qınadı,
Mehrim təki əhli-din əsənmi?

Ayrıldı cəmali-Yusifimdən,
Yə'qubi-dili-həzin əsənmi?

Ğəm yükün o mur çəkdi çün fil,
Səbr ancaq ola həmin, əsənmi?

Çox etdi Xətayiyə cəfa hicr,
Ol əhdü vəfayə çin əsənmi?

Rəha kərdəne-mə’şuq səbara
və ozr xastəno ferestadən be aşeq
*(Mə’şuqənin Səbanı azada etməsi,
ondan üzr istəməsi və Aşiqin yanına göndərməsi)*

Dilbər çü oxudu bu sənanı,
Dağıtdı kəməndi-dilfəşanı.
Ol peyk Səbanı qıldı azad,
Şirinə yürütdü mehri Fərhad.
Çox verdi ana nəsihətü pənd,
Aydır ki, əya şikəstə dər bənd,
Laf edər idin zi danişü kar,
Bala ilə zirdənəm xəbərdar.
Isa nəfəsilə həmdəməm mən,
Hər türreyi-yarə məhrəməm mən.
Afaqi-cahanda uraram laf,
Olur səfərim zi Qaf ta Qaf.
Bəs nişə zi bəhri-aşiqi-nov
Bənd olasan, ey həmiqi-kəcrov.
Xaçan ələ girə nuş biniş?
Mərhəm qılunur həmişə bər riş.
Bilməz çü vəfayi kim cəfalər,
Bilür çü cəfa görən vəfalər.
Həm qədri-behişti ol bilür kim,
Kim yanmış ola o dər cəhənnəm.
Kim çəkməsə rahi-Kə’bəni həm,
Rahət nə bilür zi abi-zəmzəm?
Kim çəkməsə zəhməti-müğilan,
Hənnanə yetər, nə xud be Mənnan.
Çünki dura-dura xeyr olur şər,
Səbr eyləmək ilə nəf’ olur zər.
Gər çəkməsə mur qəhri-divan,
Yetməzdi be dərgəhi-Süleyman.
Əyyub çü dərdə sabir oldu,
Gör, şə’ninə “nə’m” sadir oldu.
Səbr eyləməsəydi piri-Kən’an,
Yusif yüzüni görərdi xandan?

Qıldı çü Züleyxa səbri-muxtar,
Verdi Əziz ana Misri ba yar.
Səbr ilən olur zi ğurə mey dəx,
Səbr ilən yetər muradə şey dəx.
Tut yaprağı səbr ilən olur ğəz,
Səbr ilən olur şərab əz rəz.
Səbr ilən açıldı ğönçeyi-təng,
Həm səbr ilən oldu lə'l əz səng.
Həm səbr ilə dutdu çini zəngi,
Səbr ilən alur çətük pələngi.
Səbr ilə kişi mərامə yetdi,
Həm səbr ilə təşnə camə yetdi.
Məcnun be səbr buldu Leyla,
Səbr ilə çıxar zi sər bu sevda.
Səbr ilə dutar cahan nizamı,
Səbr ilə yetər könül məramı.
Səbr ilə tapar cahan vüqarı,
Qul səbr ilə buldu kirdigarı.
Səbr ilə zəmin verür nəbatat,
Səbr ilə yetər gögə münacat.
Səbri yox olana çox xərəcdir.
Çün səbr fütuhi-hər fərəcdir.
Əksükligini budur yəqin bil,
Bəs qılma işində dəxi tə'cil.
Məndən yeri vargil ol fəqirə,
Ol higrim əlidə dil əsirə.
Çox etdi əgərçi ol şikayət,
Çəkdi vəli cövri-binəhayət.
Ğəm yükünə qıldı fil təki zur,
Oldu ğəm ilən vücudu cün mur.
Içdi yüküş ol fəraq zəhrin,
Andan götürüm bu zəhr qəhrin.
Zəxm etdi ana sinani-ğəmzəm,
Lə'limdən edim o zəxmə mərhəm.
Tükəndi qərarü səbrü huşi,
Rahət meyi ola şimdi nuşi.
Tökdü qanını bu ğəmzeyi-tiz,

Verim diyət əz ləbi-şəkər riz.
Verdim ana cövr ilən məmatı,
Bir bus ilə bəxş edim həyatı.
Boynuna qılım qolum həmayil,
Heyrət bilə ola əqli zayil.
Vəslimə qılım bu gecə vasil
Kim, ola muradı cümlə hasil.
Bu şe'ri degil o xəstə halə,
Bilsün ki, qəbul olur vüsalə.

Şe'r əz zəbane-mə'şuq betəriqe-də'vəte-vosal
(*Mə'şuqənin dilindən qovuşmağa çağırış tərzində şe'r)*

Gəl, gəl bəri, ey görən cəfalər,
Kim, yar sana qılur vəfalər.

Gəl, gəl ki, əgərçi pür xətasən,
Çin oldu yanımda hər xətalər.

Gəl, gəl bəri, ey pür əz bəla dil,
İmşəb bulasan şəfa bəlalər.

Gəl, gəl bərü, ey ğəmimdə bimar
Kim, bu gecə yar edir dəvalər.

Ey Xəstə Xətayi, gəl ki, yarın
Könlün aluban qılur vəfalər.

Amədəne-səba besuye-aşeq ba xəbəre-mojde
(*Səbanın muştuluq xəbəri ilə Aşiqin yanına gəlməsi)*

Əzm etdi Səba beşadkami
Kim, tapdı o dilşikəstə kami.
Sürdü atını rəvan rəvani,
Istərdi kim, alə müjdəgani.
Çün gəldi, irişdi tərfi-bağə,
Peyki-fərəh irdi bağü rağə.

Gizləndi betərfi-gülsitan ol,
Eşqimni qılırdı imtahan ol.
Mən dutmuş idim du çeşmi bər rah,
Ta kim, gələ əz təriqi-dərgah.
Nagah Səbayi-nikxahim
Qapdı gəlübən zi sər külahim.
Aydır: – Di ver imdi müjdəgani,
Gəlsün dedi ol nigari-cani.
Kim, bu gecədir zəmani-vəslət,
Vəqti-tərəbü hüzurü işrət.
Bu sözün anın çü guş qıldım,
Xızr abı idi ki, nuş qıldım.
Bu mürdə tənim bulub həyati,
Tapdı dilü can zi ğəm nicati.
Rəqs eylər idi tənimdə canım,
Bu şe'ri oxur idi zəbanım.

Şe'r əz zəbane-aşeq betəriqe-kamran
*(Aşiqin dilindən şadlıq bildirmək tərzində şe'r*)

Pəh, pəh ki, mənəm o cismi-bican
Kim, nagah ona ulaşdı bir can.

Pəh, pəh ki, mənəm o Xızra nisbət
Kim, ana yoluxdu abi-heyvan.

Pəh, pəh ki, mənəm səqimi-möhlik,
Hatifdən ana irişdi dərman.

Pəh, pəh ki, mənəm şikəstə Yə'qub
Kim, buldu vüsali-xubi-Kən'an.

Pəh, pəh ki, mənəm əzizi-Kə'bə,
Hənnanə irişdi, buldu Mənnan.

Pəh, pəh ki, mənəm o muri-pamal
Kim, verdi ana nigin Süleyman.

Ey Xəstə Xətayi şakir ol kim,
Mehr ilə vüsalə döndü hicran.

Afərin kərdəne-aşeq besəba
və ferestadəne-pişe-mə'şuq
(*Aşiqin Səbanı öyməsi
və Mə'şuqənin yanına göndərməsi)*

Dedim ki, Səbayə şad bolgil,
Bər kami-dilü murad bolgil.
Xoş zindədilü rəvan fərəssən,
Pür müşk sözün, qəbul nəfəssən.
Qıldın bu vəfalığı mənimlən,
Can ola fəda sana tənimlən.
Dur bir dəxi var ol həbibə,
Ol dərdə düşənlərə təbibə.
Söylə ki, dedi o mehribanın,
Layiq nə gətirsin ərməğanın?
Şəhlər nəzərnidə töhfə xoşdur,
Yazıq anadır ki, dəsti boşdur.
Gözdən düri-şahvar aparsam,
Ya cani-pür əz ğübar aparsam,
Can nəstə degil bərayi-canan,
Dür qədri nədir be pişi-sultan.
Gövhər kişinin öz ərməğani,
Öz qədrimisali-tərcümani.
Kim, muri-fəqir ba Süleyman
Payi-mələxi apardı bürhan.

Nameye-dəhhom. Rəftəne-Səba be
pişe-mə'şuq cəhəte-ərməğano hədiyye
(*Onuncu məktub. Səbanın hədiyyə ilə bağlı
Mə'şuqənin yanına getməsi)*

Çün yetdi Səba o yar qatına,
Ol türki-vəfagüzar qatına,
Söyləşdi, cəvabın aldı, gəldi,
Hər sözdə səvabın aldı, gəldi,
Başdan diləmiş ki, dür gətürsün,
Bir damən anınla pür gətürsün.

Həm bilə əqiqi-pür bəhalər,
Yüzdən dəxi dürlü kəhrübalər.
Qılsın yenə neçə nəzmi-əbyat,
Fikr etsin ana hezar kərrat.
Bu qəsd ilə kim, qavuşdu həsrət,
Dəf' oldu ğəmü bəlavü möhnət.
Bir vəchilə nəzmin eyləsin der,
Dürtək qulağımda eyləsin yer.
Bu sözləri çün eşitdi guşim,
Qalmadı qərarü səbrü huşim.
Daldım gözüm içrə həmçü qəvvas,
Aldım düri-pakü gövhəri xas.
Yaşımdan alub əqiqi-gülgun,
Yüzüm təbəqin pür etdim əz xun.
Nəzm etdim o dəmdə neçə əbyat,
Fikr etdim ana hezar kərrat.

Şe'r əz zəbane-aşeq nəhce-tələbe-mə'şuq
*(Mə'şuqənin istəyi ilə Aşiqin dilindən şe'r)*

Xoş dəm ki, bu cismü canqavışdı,
Canan ilə həm cahan qavışdı.

Bu gündürür ol ki, xəstə Yə'qub
Yusifdən azub rəvan qavışdı.

Bu gecədir ol ki, təşnə Xızra
Heyvan suyu nagəhan qavışdı.

Bu dün odurur ki, fəxri-aləm
Ba həzrəti-laməkan qavışdı.

Adəmlə bu gün buluşdu Həvva,
Yüz cəhd ilə dər cahan qavışdı.

Oldur bu gecə ki, əhli-iman
Uçmağ ilə cavidan qavışdı.

Fərxəndə zəman ki, dilbərinə
Ölmüş tən ilə bu can qavışdı.

Şükr eylə Xətayi, kim səninlə
Ol şahidi-mehriban qavışdı.

Təvəccoh kərdəne-aşeq besuye-vəsle-mə’şuq
*(Aşiqin Mə’şuqənin vəslinə diqqət yetirməsi)*

Qıldım yazuban sözü vərəquş,
Biəql yeridim anda, bihuş.
Şad idim vücudum, oynar idi,
Can həsrət odunda göynər idi.
Səbr etmək idi tənimdə canım,
Axmazdı həvəslə rəgdə qanım.
Varmazdı ayaqlarım zi həsrət,
Görməzdi gözüm yolu zi heyrət.
Xoş yoldur o kim, ulaşa ba yar,
Mənzur ola ana ruyi-dildar.
Xoş varə qədəm be suyi-dilbər,
Mənzil ana bola kuyi-dilbər.
Bixud yerir idim edib əfğan,
Əz buyi-şərabi-vəsli-canan.
Tən canı yetirdi hər neçük var,
Gördüm çü pəri besəhni-gülzar.
Bir şəkl göründü, bir şəmayil,
Əqlim ilə huşum oldu zayil.
Bisəbrü qərarü huş düşdüm,
Qıldım meyi-vəsli nuş, düşdüm.
Dilbər yanıma gəlib oturmuş,
Nazik dizinə başım götürmüş.
Vermiş ləbin ağzıma çü sordum,
Açdım gözümü, yüzüni gördüm.
Başdan yenə getdi ah edib əql,
Həm huş yerindən eylədi nəql.
Əmzirdi ləbi-pür əz həyati,
Tapdı yenə dil bər əz nicati.

Şirin dodağilə toxdadı can,
Ölürmi içənlər abi-heyvan?
Açdım yenə çün gözümni nagah,
Görəndə dedim ki, həmdülillah.
Bu sənmisən, ey nigari-məhru?
Ta xeyli-xəyalım olmasun bu?
Vəslin anuban ola könül xoş,
Mə’nidə xəyal ola əlim boş.
Bihuş könül çü gəldi ba huş,
Aldım anı can kimi dər ağuş.
Kam aldı bu dil be buseyi-çənd,
Lə’lindən əmirdi şəkkərü qənd.
Gəh yüzün öpüb, gəhi ləbanın,
Gəh lə’lin əmib, gəhi zəbanın,
Gəh zülfin edirdim əldə dəstə,
Gəh said olub, gəhi xocəstə.
Gəh ağzım ilən dutub dilini,
Gəh qolum ilən qucub belini.
Gəh hüsni təki vüsalə məğrur,
Gəh çeşmi misalı məstü məxmur.
Gəh payinə döşəyib yüzümni,
Gəh heyrət ilən görüb özümni.
Gəh sinə qoyub bu sinəsinə,
Ikram edər idi sinə-sinə.
Gəh zülfi təki öpüb ayağın,
Dişlib çü məgəs gəhi dodağın,
Gəh qucar idim belin kəmərvar,
Gəh dişlər idim dilin səmərvar.
Gəh kəfşinə can olurdu qurban,
Gəh yaşım ana gedirdi ğəltan.
Gəh boynuna qolum eyləyib piç,
Lə’lin qıc edib, dəhanını miç.
Gəh qaşına can olurdu qurban,
Gəh oxuna cism olurdu qalxan.
Gəh tökər idi du didə Ceyhun
Dişlib dodağın olurdu pür xun.
Gəh ruzi-fəraqi fikr edirdim,

Gəh vəsl güninə şükr edirdim.
Gəh zülfi təki boyundan aslu,
Gəh kəfşi təki ayağda yaslu.
Gəh hali-dilim qılıb təfəkkür,
Derdim neçə beyti dər təhəyyür.

Şe’r əz zəbane-aşeq bər
vəche-təhəyyore-məqame-vəslət
(*Qovuşma çağının heyrəti münasibətilə*
*Aşiqin dilindən şe’r)*

Can xoşdur əgər buluna canan,
Qul xoşdur əgər yetər be sultan.

Aşiq nə xoş ola hicr əlindən
Qurtulavü yarə ola mehman.

Gər dönsə fərağə vəslət, eyvay,
Xoşdur ki, vüsalə dönsə hicran!

Xoşdur ğəm içində piri-məhzun,
Ta ki, yetə ana xubi-Kən’an.

Xoş bola qaranğu gecələrdə
Görünə tülui-mahi-taban.

Ya zülmət ara qalan Sekəndər
Xoş buldu zülali-abi-heyvan.

Ğəm yemə, Xətayi, şad bol kim,
Mehr ilə vüsalə döndü hicran.

*Məcnəvi*

Ol gül kim, ana dil oldu bülbül,
Gülzari-rüxündə verə nur gül
Ol şuxə ki, can olurdu Fərhad,

Şirin dodağından aldı yüz dad.
Ol yarə ki əql olurdu Məcnun,
Uş Leyli saçına oldu məqrun.
Pərvanə idi o şəm’ə bu can,
Bir tabi-rüxündən oldu büryan.
Ol mahə ki, can müştəridi,
Vəslət gecəsində xoştər idi.

Təhsin kərdəne-mə’şuq
səbre-aşeqra. Hecran və fəraq
*(Mə’şuqənin Aşiqin dözümünü öyməsi.
Ayrılıq)*

Təhsinim edərdi ol pəri ru,
Çəkdinmi fəraqü dərdü qayğu.
Zar etdi səni bu ruyi-çün gül,
Gül görməsə, səbr edərmi bülbül?
Bir badə qurur, zi tabi-hicran
Gər içməsə səbzə abi-baran.
Halın nə ləbimdən ayru miskin?
Fərhad ölür zi dərdi-Şirin.
Pərvərdə bolurmu cismi-biruh?
Olmasa gəmisi, ğərq olur Nuh.
Zar oldu be dərdi-eşq Əyyub,
Səbr eyləmədi fəraqə Yə’qub.
Gər hicr yüki düşər bəirə,
Kafir xaçan uğraşur səirə?
Gər yükləsə hicr odun cibalə,
Çovğundan olur zühur nalə.
Gər firqəti salsan asimanə,
Göglərdə mələk cəmii yanə.
Hicran odu gər düşər zəminə,
Yandıra zəmini-həftüminə.
Gər hicrin odu düşərsə bəhrə,
Bəhr ola çü bər düşüb be qəhrə.
Gər olmasa firqətü bəla, bil,
Olmazdı həzar nitqə qabil.

Pərvanə əgər fəraqə yanmaz,
Ğəltan oluban oda boyanmaz.
Eşq əhli fəraqə düşməsəydi,
Mə'şuqə pəri qarışmasaydı.
Məndən sorar idi yari-cani,
Sevməkdə qılırdı imtahani.
Derdim mən anı neçük qılımədd,
Sevməkdə səni qılamazam hədd.
Yanımda hezar hur olursa,
Yüz işvəvü naz əgər qılursa,
Hər biridə səd girişmə bolsa,
Alışma ilən verişmə bolsa.
Bir dərdü xəyalın olsa dildə,
Ya mehri-cəmalın olsa dildə,
Qılmayam olarə könlü mayil,
Olmaya yüzün xəyalı zayil.
Hər gözüm əgər olursa yüz göz,
Bir yüzüm əgər oleydi yüz yüz,
Səndən kəsəmən o gözlərimni,
Sallam ayağına yüzlərimni.
Hər əldə hezar barmağ olsa,
Birində hezar dırnağ olsa,
Yazar sifətin hezar barmağ,
Pak edə qələmni nuki-dırnağ.
Hər payım içün gər olsa yüznam,
Səd dəst ola gər bu dəsti-yektam,
Eşqinlə oları basmasaydım,
Daməndən əlimni kəsməsəydim.
Bir ağzıma gər oleydi yüz dil,
Bir qəlbim əgər oleydi min dil,
Bular sifətin sözün deyeydi,
Olar ğəmi-eşqiniz yeyeydi.
Hər başda hezar başım olsa,
Hər gözdə hezar yaşım olsa,
Başları yolunda oynadaydım,
Yaşları sana nisar edəydim.
Bir təndə hezar ruhum olsa,

Hər birinə ömri-Nuhum olsa,
Ruhumu qılam qaşına qurban,
Cismimi qılam türabə yeksan.
Bir dişdə hezar dişim olsa,
Hər dəmdə hezar işim olsa,
Dutam ləbini o diş ilən mən,
Hökmində olam hər iş ilən mən,
Ol gecə nə boldu yar ilən hal,
Dilim deyəməz sifati-əf’al.
Zövqü tərəbü hüzurü vəhdət,
Əfsaneyi-hicrü qövli-həsrət,
Qorxardı bu könlüm əz səhərgah,
Pozmaya gəlib hüzüru nagah.
Gözüm baxar idi suyi-rövzən,
Daim siyəh ola ruyi-rövzən.
Yarəb, uzun eylə leyli-vəsli,
Üşşaqə budur muradi-əsli.
Faş eylə müdam ruyi-kövkəb,
Rəf’etmə həmişə pərdeyi-şəb.
Xurşidi müdam dər hicab et,
Ğəmmaz gözünü dər niqab et.
Əşya gözidin götürmə tabi,
Aşiq qılur andan ictinabi.
Bu sözdə idim nigar dər bər,
Oxudu müəzzin “Allah əkbər”.
Dedim ki, diriğ, gecə keçdi,
Heç biləmədim ki, necə keçdi.
Baz oldu fəraq ruzi-vəslət,
Kam almadı dil bevəqti-fürsət.
Ah eylər idim ki, düşməyim dur,
Uyxudan oyandı çeşmi-məxmur.
Aydır: – Nədir ey vüsalə məhrəm,
Ahın nədir, ey yanımda həmdəm?
Xud vəslə səni hərəm qılıbmən,
Bağrın qanilən gözün silibmən.
Dedim: – Nə sorarsan, ey pəri çöhr,
Anla gün irişdi dər şəbi-mehr.
Gündüz nə bilir bu sirri xali,
Əğyarə zühur edir xəyali.

Gecə irişür həbibə məhbub,
Talib gecə buldu kamü mətlub.
Ol fəxri-cahanü nuri-fürqan
Həm gecə irişdi nəzdi-sübhan.
Şəb çıxdı be kuyi-Tur Musa,
Şəb axdı fələk yüzünə Isa.
Vəh, vəh ki, tükəndi və’deyi-vəsl,
Göründü mana bu ruzi-biəsl.
Üstümə lihafi eyləyib puş,
Aldım yarı bir dəxi də ağuş.
Qoydum ləb-ləb, besinə sinə,
Qucdum qamu ruz kinəsinə.
Matəmdə idim ki, ayrılam, ah,
Görsətdi yüzün gün əz nəzərgah.
Xavər şahı yaxə çak qıldı,
Göglər təbəqini pak qıldı.
Pak etdi günəş yüzüni əz xun,
Qoşdu atını bu çərxi-gərdun.
Göglər qədəmində rəqsə düşdü,
Səyyarə şüayi nəqsə düşdü.
Çin ləşgərini dağıtdı zülmət,
Islam çərisini etdi də’vət.
Hər Müştəri boldu ana Zöhrə,
Rəqs etdi bu bəzmə çərxi-möhrə.
Gər gündüzə xəlq müştəriydi,
Amma mana gecə xoştəriydi.
Çün gün doğuşu buraxdı təl’ət,
Mən xəstəyə düşdü yenə firqət.
Həzl eylədim ol dəm afitabı
Kim, nişə götürdü bu niqabı?

Şe’r dər bade-həzle-Afetab
(*Günəşi tənqid tərzində şe’r)*

Çıxdı yenə mana zur edən gün,
Məsturləri zühur edən gün.
Bu sirri cahanə söyləməzmi,
Bir zərrəni pür zi nur edən gün.

Xəffaşi-şikəstə ruzə aşiq,
Çeşmin həsəd ilə kur edən gün.

Gər düşməz arayə şəb niqabi,
Hər qatda vücudə zur edən gün.

Olmuşdu Xətayi yarə vasil,
Yardan yenə anı dur edən gün.

Dəstur dadəne-mə’şuq Aşeqra
*(Mə’şuqənin Aşiqə buyruq verməsi)*

Düşmən – dedi dust – dər kəmindir.
Vəslim günü bu idi, həmindir.
Bir busə mana verib pərizad,
Dedi bu, sana yetər, yeri rad.
Yar, etmə dedim bizi fəramuş,
Durdum ki, gedəm nizarü bihuş,
Gög qübbəsindən asıldı qəndil,
Yüzündən alub niqabü məndil.

Şe’r dər babe-vedae-mə’şuq
(*Mə’şuqə ilə vidalaşma mövzusunda şe’r)*

Ey sevgi nigar, sən qal imdi,
Ey işvəli yar, sən qal imdi.

Vəslindən irağ ah-vaylı,
Dil xəstəvü zar, sən qal imdi.

Hicranın odunda gecə-gündüz
Dil yenə yanar, sən qal imdi.

Ğəm qışı mana cəfalər eylər,
Ey tazə bahar, sən qal imdi.

Umar bu Xətayi yadigari,
Ta tuta qərar, sən qal imdi.

Şe’re-yadeqar dadəne-mə’şuq Aşeqra
(*Mə’şuqənin Aşiqə yadigar şe’r verməsi*)

Der var bilədir səninlə qayğu,
Qan yaş iləruyi-rəngi saru.

Bəd halətə düşmə, çünki vardır
Biləncə xəyali-ruyi-niku.

Tiği-ələm iki bölsə cismin,
Yarusu mənimlə, səndə yaru.

Qılma məni cüstcu ki, bəsdir
Çeşmində xəyali-yari-dilcu.

Bu ahu gözümdən ayru düşsən,
Var həmnəfəsin ğəm ilə yahu.

Bu incə belim ğəmi, Xətayi,
Etməzmi tənin misali-yek mu?

Şe’r dər babe-həlali xastəne-aşeq əz mə’şuq
*(Aşiqin Mə’şuqədən halallıq istəməsi mövzusunda şe’r)*

Xoş qal – dedim – ey həbib canan,
Bu mürdə tənim içində çün can.

Çox tökdün isə həlal bolsun,
Afət bıçağilə didədən qan.

Cəm’ olmadı dil ğəmində, vəh, vəh!
Ey zülfi mənim təki pərişan.

Sən min yaşagil be kamrani,
Mən ölür isəm, nə ğəmdir, ey can!

Su səpdi yüküş qapunda hər dəm
Eşqin yoluna bu çeşmi-giryan.

Bağrımla gözüm yaşı evində
Çox odlu gözün nəmək yedi, nan.

Bu xəstə Xətayi yad qılma,
Zinhar, unutma əhdü peyman!

Dəp mofareqət əz vosale-duste-cani
*(Könül dostunun vüsalından ayrılmaq barədə)*

Çün oldu tamam nəzm təkmil,
Vəsl oldu həman fəslə təbdil.
Səndən necə kim, can ayru düşdü,
Tən ya çürüdü, ya sayru düşdü.
Ölüncə unutman ol həbibi,
Gül bəs unudarmı əndəlibi?
Təqdirə var isə ola tədbir,
Yox isə nə çarədir be təqdir.
Hicrində çü zadü nun keçdi,
Sindən dəxi bir füzun keçdi.[1]
Çün sərvəri-Çin irişdi Şamə,
Xətmində mükəmməl oldu namə.
Xətm oldu bu namə ruzi-şənbə,
Eşq ilə həmişə suz şənbə.

Şe'r dər xatəmeye-ketab və səbəbe-tə'lif
*(Kitabın bitməsi və yazılmasının səbəbi barədə şe'r)*

Yarəb, irağ etmə cismü cani,
Heç bəndəyə verməgil sən ani.

Sanma bu sözü bəyani-vaqe,
Sözdür qamusu be sərzəbani.

Vəslin dilərəm vəfalı yarın
Kim, fanidürür məcaz, fani.

---

[1] Bu beytdə poemanın yazılma tarixi bildirilmişdir: zad – 800, nun – 50, sin – 60. Bu rəqəmləri toplayıb üstünə bir gəlsək (bir füzun sözünə görə), poemanın hicri 911-ci, miladi 1506-cı ildə yazıldığı müəyyənləşər.

Çox məstə sifətdə zahir, ey dust,
Görsət yüzünü bizə nihani.

Bu fani ömür cahanda qalmaz,
Bəxş et bizə ömri-cavidani.

Bu dari-cəhan çü bir fənadır,
Vergil bizə xaneyi-bəqani.

Üç nəstədürür səbəb bu namə
Kim, boldu zəruri qılamğ ani.

Əvvəl səbəb oldu nəzmi-tövhid
Kim, bəndəligin odur nişani.

İkinci bu kim, olanda ğəmgin
Bu könlünün ola mehribani.

Üçüncü bu kim, qalursa xoşdur
Bu dünyadə hər kimin nişani.

Ta deyə ani görən mühüblər,
Rəhmətlik ola anın rəvani.

Hər kim ki, bizi anarsa bolsun
Dər bürci-səadət aşiyani.

Kiməm ki, deyəm Xətayiyəm mən,
Əhsəntü təbarək, ey filani.

Kim muni oxur, yazarü dinlər,
Həq lütf ilə yarlığasun ani.

# *Qoşmalar. Gəraylılar. Varsağılar. Bayatılar*

## QOŞMALAR

***

Könül, nə gəzirsən seyran yerində,
Aləmdə hər şeyin var olmayınca?!
Olura-olmaza dost deyib gəzmə,
Bir əhdinə bütün yar olmayınca.

Yürü, sufi, yürü, yolundan azma,
Elin qeybətinə quyular qazma,
Yorulma bihudə, boşuna gəzmə,
Yanında mürşidin var olmayınca.

Qalxdı, havalandı könlün quşu,
Qovğa, qeybət etmək kötünün işi,
Ustadın tanımaz bunda hər kişi,
Onun kim mürşüdü ər olmayınca.

Varub bir kötüyə sən olma nökər,
Çərxinə dəgər də, dolunu dögər,
Nə xudadan qorxar, nə hicab çəkər,
Bir kötüdə namus, ar olmayınca.

Şah Xətayim edim bu sirri bəyan,
Kamilmidir cahil sözünə uyan?
Bir başdan ağlamaq ömrədir ziyan,
iki başdan mühibb, yar olmayınca.

***

Qarşıdakı qarlıca dağı gördünmi?
Yoldurmuş əyyamın, əriyib gedər.

Axan sulardan sən ibrət aldınmı?
Yüzünü yerlərə sürüyüb gedər.

Qadirsən, ey ulu şahım, qadirsən,
Hər nerəyə baxsan, onda hazirsən.
Üstümüzdə dörd guşəli çadirsən,
Cümləmizi birdən bürüyüb gedər.

Sıra-sıra gələn ol ulu quşlar,
Sirli olur, yaxmaz onu günəşlər,
Əvvəl-əzəl meyvə verən ağaclar,
Onlar da qalmayıb çürüyüb gedər.

Dərindir bizim dəryamız, boylanmaz,
Min bir kəlam desəm, biri anlanmaz.
Kişi iqrarsız yollara yollanmaz,
Yolları qoynunda yürüyüb gedər.

Şəh Xətayim söylər sözü özündən,
Dərvişlərin sağınıbdır gözündən,
Olur-olmaz münkirlərin sözündən,
Əsriyib könlümüz, farıyıb gedər.

***

Batinimdə dedi mənə bir əziz:
– Məhəbbətdən keçən haqdan da keçər.
Vermən nəsibini, kəsin qidasın,
Məhəbbətdən keçən haqdan da keçər.

Məhəbbət adəmi haqqa yardır,
Məhəbbət etməyən can murdardır,
Dünyavü axirət yüzü qaradır,
Məhəbbətdən keçən haqdan da keçər.

Gerçək olan bir nəfəsə inana,
Canımız veririz qurban canana,
Lə’nət olsun iqrarından dönənə,
Məhəbbətdən keçən haqdan da keçər.

Dörd qapu, qırx məkan, yetmiş iki qat,
Məhəbbət dedigin təcəlliyi-zat,
Mö'minə, müslümə, xeyir, nəsihət,
Məhəbbətdən keçən haqdan da keçər.

Məhəbbət dedigin xaslar xasıdır,
Məhəbbət olmayan haqqın nəsidir?
Dost Xətayinin bu, haqq nəfəsidir:
Məhəbbətdən keçən haqdan da keçər.

***

Gəl öyüd verəyim, öyüd alırsan,
Xidmət eylə genə gülü bulunca.
Karvan gedər, sağın, geri qalırsan,
Haman əldən qoyma yolu bulunca.

Öldürsə də, çıxmaz yoldan yol əri,
Gerçəklərin əlindədir yuləri,
Göründü, seyr eylə axan suları,
Qarışır ümmana seli bulunca.

Arı oldun, hər çiçəkdən alırsan,
Balın damızlığın qanda bulursan,
Yetmiş min ayətə dəlil olursan,
Anlayıb da bu dəlili bulunca.

Dinləyib də bu mə'nayi yazmalı,
Hər kişi halınca quyu qazmalı,
Yeddi padşahlıq yeri gəzməli,
Halına münasib yeri bulunca.

Sil-süpür qəlbini, süddən bəyaz et,
Öldür nəfisini, şeytandan arıt,
Doxsan doqquz yerə çıxdı Bayəzid,
Halına münasib yeri bulunca.

Şah Xətayim aydur: – Baxma bu halə,
Könlümüzdə vardır bir ulu qala,
Əlif gələ, ayin gələ, mim gələ,
Dərdli qullar dərmanını bulunca.

***

Gəl, a könül, xoş görəlim bu dəmi,
Bu da böylə qalmaya bir gün ola.
Kişi çəkmək gərək qüssəyi, qəmi,
Haqdan gəlir, hər nə gəlsə bir qula.

Ər odur e’tiqad edə pirinə,
Nəzər edə əvvəlü axirinə.
Əlbət, yol qədimdir iltər yerinə,
Sana kim neylərsə, sala gör yola.

Biz də bilirik ki, dostu, qardaşı,
Bulamadım bir qara gün yoldaşı.
Dost keçinib yüzə gülən qəllaşı,
Bahasıdır, satmaq gərək bir pula.

Hər kişi bir xəyal ilə əglənir,
Daim onun könlündə ol əglənir.
Böylə olur sevdigim gah ağlanır,
Kimi gördük qiyamətə dək gülə.

Qarunu gör bunadı, ya bulduqca,
İnandı fələk yüzünə güldükcə.
Sən eylik et, durma əldən gəldikcə,
Dedilər: – Xalq bilməzsə, xaliq bilə.

Gerçək olan kişi dostdan ayrılmaz,
Dəgmə kişidə həqiqət bulunmaz,
Sən səni satsan, yedirsən, bilinməz,
Bu zamanda kimsə yaramaz elə.

Xətayi, dünyanın ötəsi fani,
Bizdən əvvəl bunda gələnlər qani?
Sanma daim şad yürüyə düşməni,
Bir gün olur növbət ona da gələ.

***

Gəlib ixlas ilə yola gedənin
Zərrəcə könlündə güman gərəkməz.
Sil-süpür qəlbini, evin pak eylə,
Mö'minin aynası duman gərəkməz.

Birnin iki yerdə gər əli olsa,
Faydası olmaz ol gər Əli olsa.
Müsahibdən gizli dal yeri olsa,
Ondan sana hələn iman gərəkməz.

Müsahib, mürəbbi yolda bir kişi,
Dili söylər, amma degildir işi,
Çünki baş etməzsən tutduğun işi,
Ər yükü gövhərdir, saman gərəkməz.

Can Xətayim aydır: – Düşürdün dərdə,
Zavallı sufidən qalxmayır pərdə,
Gördün ki, bir loğma gəldi bir yerdə,
O loğma cig isə, yemən gərəkməz.

***

Mürşidlikdən sizə budur, ərənlər,
Hər nə istər, mənzil nərə buluna.
Günəş kimi tülu edə bürcündən,
Ay ilə gün doğub onda doluna.

Mürşid oldur talibini bişirə,
Əlin alıb azmaqlıqdan devşirə,

Gündə min gəz təbər vursa başinə,
“La” deməyə ver nəsibin alana.

“La” der isə nəsibini verməgil,
Nəfsi yamandır, yanında durmagil,
Ölür isə namazını qılmagil,
Səd hezaran lə’nət onun canına.

Talib demə pir yanında utana,
Talib dönməz pir yanında ötənə.
Güman ilə yatur olsa sitəmə,
Yuma onda murdar göndər sininə.

Pir oldur ki, pir yurdunda otura,
Talibin nöqsan yerini yetirə,
Təsəlli verübən yola gətirə,
İrişdirə dörd qapunun cəminə.

Xətayiyəm, çar guşəyi gəzərəm,
Eşq kitabın oxuyuban yazaram,
Mürşidinə kəc baxandan bezaram,
Nə çağıram, nə xud varam yanına.

***

Bu yolun yolçusu olayım dersən,
Əldə iki qarpız tutmalı degil.
Dərviş olub şalvar geyəyim dersən,
Gahi geyib, gahi atmalı degil.

Namərd bağçasında qönçə gül olmaz,
Kamil ilə yoldaş olan yorulmaz,
İki məxluq vardır, haqqa qul olmaz,
Məğrurluq, kibirlik etməli degil.

Məğrurlar orada olurlar yalan,
Kibr imiş yorulub yollarda qalan,

Əgər yolçu isən, körpünü dolan,
Göz görə çamura batmalı degil.

Qoyun quzusuna nasıl mələdi?
Öküzün qulağın kimlər ənədi?
Qərib bülbül gül dalında tünədi,
Hər çalı başında ötməli degil.

Şah Xətayim imam Cəfər müxbiri,
Haqqın yaranıdır Veysül-Qərəni,
Haqqın xəznəsindən gələn gövhəri
Müştəri olmadan satmalı degil.

***

İqrar verdim, dönmən ələst bəzmindən,
Verdiyim iqrarı imandan aldım.
Başqa seyran gördüm, kəndi özümdən,
Bu məhəbbəti mən Mərdandan aldım.

Narü badü xakdan bilin xəlq oldum,
Kəndi-kəndim ana rəhmində buldum,
Müddət tamam oldu, dünyayə gəldim,
Bu ibrətnümayi cahandan aldım.

Bildiyim unutdum, eylərəm fəryad,
Dərdim budur: dil yox istəyəm imdad,
Təkrar yenə tə'lim etdi bir ustad,
Dərsimi məktəbi-ürfandan aldım.

Can gözü qəflətdən açıla düşdü,
İkilik pərdəsi seçilə düşdü,
Qüdrət xəzinəsi açıla düşdü,
Cəvahiri kani-mərcandan aldım.

Bu bir gizli sirdir, hər can duyamaz,
Əhli-eşqin qatarına uyamaz,

Dəgmə cöhərfüruş baha qoyamaz,
Bu dürri-yektadır, ümmandan aldım.

Gəl düşünmə, ağla sığmaz bu elim,
Qüdrət xəznəsinin miftahi dilim,
Bir ulu dərgaha ulaşdı yolum,
Bilməyən sanır ki, dükkandan aldım.

Ah edib utandım kəndi sözümdən,
Məst olub türabə düşdüm özümdən,
Qanlı yaş axıtdım iki gözümdən,
Macərayi çeşmi-giryandan aldım.

***

Musayə təsəlli göründi Turdən,
Məst olub ağlını şaşırdı sirdən,
Ənəlhəq sirrini aldım Mənsurdən,
Məhəbbət kəmərin ərkandan aldım.

Həq bilir, sözümə hiylə qatmazam,
Hər kəsə bu siri əyan etməzəm,
Qiyməti bilinməz yerdə satmazam,
Mən bu nəsihəti bir candan aldım.

Çalış bu girdabın çıx yörəsinə,
Dərman gizlənibdir dərd arasına,
Məlhəm sarılarmı eşq yarasına?
Bu elmi, hikməti Loğmandan aldım.

Aləm başdan-başa bir seyrangahdır,
Gir könül şəhrinə, gör nə dərgahdır.
Bir gizlicə sirdir, qüdrətüllahdır,
Yazılmış dəftərü divandan aldım.

Tərkü təcrid oldum, tökdüm qəbayi,
Əynimə geyindim şalü əbayi,

Mana sorun kimdən aldım yasayi?
İsmayıl a enən qurbandan aldım.

Dünyadan əl çəkdim, ərkandır işim,
Çeşmilə, bürhandır, tökülür yaşım,
Sizlərə hədiyyə, eldədir başım,
Ol yaşıl yaprağı Salmandan aldım.

***

Bir qəndildən bir qəndilə taxıldım,
Türab olub yer üzünə yaxıldım,
Bir zaman da çaxmaq ilə çaxıldım,
Könlümə od düşdü, yandım da gəldim.

Əzəldən əvvəli biz haqqı bildik,
Haqdan nida gəldi, haqqa haqq dedik,
Qırxlar meydanında yunduq, pak olduq,
İstəmən təharət, yundum da gəldim.

Şunda bir qardaşla qeydə düşmüşəm,
Pirlər məqamında yanıb bişmişəm,
Qırxlar meydanında həm görüşmüşəm,
İstəmən yanmağı, yandım da gəldim.

Şah Xətayi aydır: – Sənindir fərman,
Olursan hər qulun dərdinə dərman.
Gözəl şahım, sənə min canım qurban,
İstəməz qurbanı, kəsdim də gəldim.

***

Qəhrinə, küfrinə cümlə dayandım,
Əvvəl iqrar verib dönən gəlməsin.
Rəngi, boyasına cümlə boyandım,
Bu rənglərə boyanmayan gəlməsin.

Rənginə boyandım, mən camdan içdim,
Neçə canlar ilə qondum, qonuşdum,
Məhəbbət eylədim, candan sevişdim,
Məhəbbəti küfür sayan gəlməsin.

Məhəbbət eylədim, sevdim yarımı,
Xərc eylədim əldə olan varımı.
Bir əsilzadəylə et bazarını,
Etdigi bazardan dönən gəlməsin.

Gerçək imiş sərsəriyə gəlməyən,
Ər odur ki, iqrarından dönməyən,
Qəlbində, könlündə riya bilməyən,
İkilik kömləgin geyən gəlməsin.

Günahkara təriq sitəm qodular,
Meydana gələndə qırxlar dedilər,
Dostu dostdan seçi verin dedilər,
Əfsanə sözlərə uyan gəlməsin.

Şah Xətayi aydır: – Bu doğru yoldır,
Doğru yoldır, bu həm eşq məqamıdır,
Əksigə qalmayan pirim Əlidir,
Qəlbində şübhəsi olan gəlməsin.[1]

Gəl könül, pirlərin nəsihətini
Biz tutalım, tutmayanda nəmiz var?
Dost məhəbbətini məhəbbətmizə
Biz qatalım, qatmayanda nəmiz var?

Bizə bunu deyən böylə demişlər,
Bir loğmayi min can ilə yemişdir,

---

[1] Bizə elə gəlir ki, bir çox bəndlərdə olduğu kimi, bu bənddə də katiblər təhrifə yol vermişlər. Həmin bəndi aşağıdakı kimi bərpa etmək mümkündür:

Şah Xətayi aydır: – Bu həq yolidir,
Doğru yoldir, bu həm eşq mənzilidir,
Əksigə qalmayan pirim Əlidir,
Qəlbində şübhəsi olan gəlməsin.

Ərəmlər bir doğru yoldur, qomuşdur,
Biz gedəlim, getməyəndə nəmiz var?

Yenə haq səndədir sən sənə baxa,
Sən sənə baxıb da sən səndən qorxa,
İxlas ilə niyazımızı haqqa
Biz edəlim, etməyəndə nəmiz var?

Gəl, Xətayi, iqrarımız güdəlim,
Biz bizi görəlim, qeyri nedəlim?
Yıxıq könülləri mə'mur edəlim,
Biz edəlim, etməyəndə nəmiz var?

***

Ərənlərin ərkanına, yoluna,
Ta əzəldən talib oldum, ərənlər.
Can ilə könüldən durdum, düşündüm,
Bu gün mürşüdümü buldum, ərənlər.

Can ilə könüldən gəzdim, aradım,
Həqqin didarını görmək muradım,
Didar ilə məhəbbətdir tələbim,
Ya bu gün, ya yarın öldüm, ərənlər.

Keçmişəm sərimdən, qorxmam ölümdən,
Münkir bilməz övliyanın halindən,
Yəzid oğlu bir xarici əlindən
Çox dəmdir didardan qaldım, ərənlər.

Sən haqqı yabanda arama, sağın,
Uyduysan qəlbinə, həq sana yaxın,
Adəmə xor baxma, kəndini saqın,
Cümləsin adəmdə buldum, ərənlər.

Şah Xətayiyəm, ərz edəyim halimi,
Xərc edəyim əldə olan varimi,
Sürə-sürə şaha gedəm yüzimi,
Mürvət qəbul eylə, gəldim, ərənlər.

***

Mən dərvişəm deyə köksün gərərsən,
Həqqi zikr etməyə dilin varmıdır?
Kəndini görsənə, eldə ararsan,
Halın hal etməyə halın varmıdır?

Bir gün balıq kimi ağa sararlar,
Mürşiddən, rəhbərdən xəbər sorarlar,
Tüstü yaxıb guşə-guşə ararlar,
Mən arıyam dersən, balın varmıdır?

Dərdli olmayanlar dərdə yanarmı?
Sadiq dərviş iqrarından dönərmi?
Hər bir uçan gül dalına qonarmı?
Mən bülbüləm dersən, gülün varmıdır?

Şah Xətayi, sənin dərdin deşilməz,
Dərdi olmayanlar dərdə tuş olmaz,
Mürşidsiz, rəhbərsiz yollar açılmaz,[1]
Mürşid ətəgində əlin varmıdır?

***

Ərənlər bu yolda hazırdır, hazır,
Müsahib lövhini dəftərdən qazır,
Gərəksə, eyləsin min kərrə üzür,
Onlar ilə yeyib-içənə lə'nət.

Ağlını bəyənib, iqrarın qoyub,
Qalxıb havalanıb, nəfsinə uyub,
Təbərra kömləgin əyninə geyib,
Əzazil yurduna keçənə lə'nət.

---

[1] Bizcə, "açılmaz" sözü yerinə burada "aşılmaz" sözü daha doğru olardı. Çox güman ki, orijinalda bu söz aşılmaz şəklində olmuşdur. Qaynaqlarda bu söz "açılmaz" şəklində olduğundan biz də eləcə saxladıq.

Bəyənməyib ərənlərin sözünü,
Mənlik yurduna qondurmuş özünü,
Haqq qapıdan döndərmişdir yüzünü,
Əzazil donunu biçənə lə'nət.

Ariflər beylə dedilər uluya,
Əzazil neyləsin qəlbi doluya,
Təbərra oxundu yanlış biliyə,
Kəndi biləsinə uçana lə'nət.

Xətayim der: – Birvəliyəm yol ilə,
Sultanın töhfəsi hər dəm qul ilə,
Könüldə kibr olub soyuq dil ilə
Özün məhəbbətdən seçənə lə'nət.

***

Bu gün ələ almaz oldum mən sazım,
Ərşə dirək-dirək çıxar avazım,
Dörd şey vardır bir qarındaşa lazım,
Bir elim, bir kəlam, bir nəfəs, bir saz.

Gözəl əlim çıxsa, çıxsa salınsa,
Bədir aylar kimi doğsa, dolunsa,
Dörd şey vardır bir qarındaşa lazım:[1]
Bir xeyir, bir şər bir ibadət, bir niyaz.

Yaz olunca çəmən-çayır üstünə
Ərməğan sunarlar dostu dostuna,
Dörd şey vardır ovu almış dəstinə.
Bir şahin, bir toğan, bir əspir, bir baz.

Cahil olan söylər, sözünü bilməz,
Meydana gəlincə özünü bilməz,
Dörd şey vardır cənnət yüzünü bilməz:
Bir münkir, münafiq, bir Yezid, qanmaz.

---

[1]Bu misra birinci bəndin üçüncü misrası ilə eynidir.

Şah Xətayim aydır: – Sən qulun nedər?
Gözəl dünyasını tərk edər, gedər,
Dörd şey vardır ildən-ilə dövr edər:
Bir aydır, bir gündür, bir qışdır, bir yaz.

***

Baharın gəldiyin nədən biləyim,
Gül dikəndə bitər, bülbül taldadır.
Əyyubun tənində iki qurd qaldı,
Biri ipək sarar, biri baldadır.

Könlünə gətirmə şəkk ilə güman,
Seyid Nəsimiyə de ol oldu şan,
Tanrı ilə min bir kəlam söyləşən
Əli Mədinədə, Musa Turdadır.

Şəriət yolunu Məhəmməd açdı,
Təriqət gülünü Şah Əli seçdi,
Şu dünyadan neçə yüz min ər keçdi,
Onlar ittifaqda, Mehdi yoldadır.

Adəmin, Hatəmin zati Fəzlullah,
Əşyayi qərq etmiş bu, bir sirrullah.
Şahənşahi-qütbi-aləm zillullah
Qüdrəti-nəzəri mö'min quldadır.

Şah Xətayi aydır: – Sirrini yayma,
Qıla gör namazın, qəzayə qoyma,
Şu yalan dünyada heç sağam deymə,
Tənin tənaşirdə, sirrin saldadır.

## GƏRAYLILAR

***

Dil ilə dərvişlik olmaz,
Halı gərək yol əhlinin.
Arıların hər çiçəkdən,
Balı gərək yol əhlinin.

Keçmək gərək dörd qapıdan,
Qurtulasan mürəbbidən,
Mürəbbidən, müsahibdən
Əli gərək yol əhlinin.

Mən gəzərəm dərdli-dərdli,
Ötər firqətli-firqətli,
Bülbül kimi ünü dadlı
Dili gərək yol əhlinin.

Mən gəzərəm ayıq-ayıq,
Dəryalarda olur qayıq,
Bülbülləri şaha layıq,
Gülü gərək yol əhlinin.

Xətayim der: – Quşaq quşan,
Toz olur türaba düşən,
Budur dərvişliyə nişan;
Yolu gərək yol əhlinin.

***

Bir nəfəscik söyləyəyim,
Dinləməzsən, neyləyəyim?
Eşq dəryasın boylayayım,
Ümmana dalmağa gəldim.

Eşq xərmənində sovruldum,
Həm ələndim, həm yoğruldum,
Qazana girdim, qovruldum,
Meydana yenməgə gəldim.

Mən haqqa oldum aşina,
Qalmadı könlümdə nəsnə,
Pərvanəyəm ataşına,
Şəm'inə yanmağa gəldim.

Şah Xətayidir özümdə,
Heç xilaf yoxdur sözümdə,
Əskiklik kəndi özümdə,
Darına durmağa gəldim.

***

Könül seyranda gəzərkən,
Şah gəldi, qondu saraya.
Haqqa niyaz eylər ikən
Bir əngəl düşdü araya.

Haqqın qapısından girdim,
Kəndi vücudumu gördüm,
Mə'rifət qazanın qurdum,
Eşqi qaynadan kürəyə.

Məhəbbət xaslar xasıymış,
Etməyən haqqın nəsiymiş,
Sevgi haqqın sevgisiymiş,
Ərənlər nə der buraya?

Hilə quşadın, düşürdün,
Firqət qazanın daşırdın,
Mə'rifət aşın bişirdin,
Duzun daddırdın hərəyə.

Xətayi der ixtiyarsız:
Neyləyim dünyanı yarsız.
Oldur aləmdən xəbərsiz,
Duz tökmək istər yaraya.

***

Gövhərin keçməyən yerdə,
Satma, qardaş, kərəm eylə.
Lə'l daşını çay daşına
Qatma, qardaş, kərəm eylə.

Gördün bir yerdə aşina,
Hər nə dersən öz başına,
Yol daşını yol quşuna
Atma, qardaş, kərəm eylə.

Gördünsə bir yerdə rəqib,
Neylərsən yüzünə baxıb,
Münkiri qatara çəkib
Getmə, qardaş, kərəm eylə.

Xətayim çağırır, ərə,
Dünya belə gəlmiş zira,
Arif oxun əbəs yerə,
Atma, qardaş, kərəm eylə.

***

Aqil, gəl bəri, gəl bəri,
Gir könülə nəzər eylə.
Görür göz, eşidir qulaq,
Söylər dilə nəzər eylə.

Başdır gövdəyi götürən,
Ayaq mənzilə yetirən,
Dürlü məsləhət bitirən
İki ələ nəzər eylə.

Sufi isən, alıb satma,
Hilalına haram qatma,
Yolun əyrisinə getmə,
Doğru yola nəzər eylə.

İki əlin qızıl qanda,
Çox günahlar vardır məndə,
Ya ilahi, kərəm səndə,
Düşgün qula nəzər eylə.

Xətayi aydır: – Ya ğəni,
Verən mövla alır canı,
Əvvəl kəndi-kəndin tanı,
Sonra elə nəzər eylə.

***

Gəl bir pirə xidmət eylə,
Əmək zaye olmaz ola.
Mürşid ətəgin möhkəm tut,
Kimsəlindən almaz ola.

Bir işi bitirmək gərək,
Əksigin yetirmək gərək,
Yar ilə oturmaq gərək,
Heç bir şəmmə gəlməz ola.

Bir soyu soylamaq gərək,
Bir acı doylamaq gərək,
Bir dildən söyləmək gərək,
Firiştələr bilməz ola.

Ğayət çabuq olmaq gərək,
Dəryalara dalmaq gərək,
Bir gövhəri bulmaq gərək,
Dəgmə sərraf bulmaz ola.

Gerçək aşiq olmaq gərək,
Mə’şuqini bulmaq gərək,
Ölməzdən ön ölmək gərək,
Varıb onda ölməz ola.

Bir quş olub uçmaq gərək,
Bu mə’nanı seçmək gərək,
Bir qədəhdən içmək gərək,
İçənlər ayılmaz ola.

Bir baxçaya gəlmək gərək,
Xub təfərrüc qılmaq gərək,
Bir gül ələ almaq gərək,
Hərgiz ol gül solmaz ola.

Gəl, Xətayi, sən keç otur,
Də’vani mə’nayə yetür,
Söhbətinə bir ər götür.
Cana, başa qalmaz ola.

***

Sözünü bir söyləyənin
Sözünü edər sağ bir söz.
Pir nəfəsin dinləyənin
Yüzünü edər ağ bir söz.

Bir söz vardır xalq içində,
Dəxi söz var xülq içində,
Olmaya ki, dəlq içində
Deyəsən çarqadağ bir söz.

Söz vardır, kəsdirər başı,
Söz vardır, kəsər savaşı,
Söz vardır ağulu aşı,
Bal ilən edər yağ bir söz.

Sözünü yaxşı bişirgil,
Yaxşı us ilə düşürgil,
Yaramazını şaşırgil,
Canına olur dağ bir söz.

İstərəm görəyim yarı,
Bu rəmzi anlagil barı,
Hezaran əhli-iqrarı
Elər qara torpağ bir söz.

Şah Xətayi ayatından,
Sözün söylə öz zatından,
Olmaya kim, pir qatından
Səni edə irağ bir söz.

***

Sərsəri, girmə meydana,
Aşiq, səndən yol istərlər.
Qəllaş ilə oturmadan
İman əhli pul istərlər.

Bu yola girən oturmaz,
Haqq sözə hiylə qatılmaz,
Bunda heç hiylə satılmaz,
Gövhərindən qul istərlər.

Bir qılı min para edər,
Bu yolu ixtiyar edər,
Şahım bir yol qurmuş gedər,
Yol içində yol istərlər.

Şah Xətayi der: – Neylərsən?
Hər müşkülü həll eylərsən.
Arısan, çiçək iylərsən,
Yarın səndən gül istərlər.

***

Qırxlar meydanına vardım,
Gəl bəri, ey can, dedilər.
İzzət ilə salam verdim,
Gəl uş də meydan dedilər.

Qırxlar bir yerdə durdular,
Otur deyə yer verdilər,
Önümə surba sərdilər,
Əl loğmaya sun dedilər.

Qırxların qəlbi durudur,
Gələnin qəlbin arıdır,
Gəlişin hardan bəridir,
Söylə, sən kimsən? – dedilər.

Gir simayə, belə oyna,
Silinsin, açılsın ayna,
Qırx il qazanda dur, qayna,
Daha çiy bu tən dedilər.

Gördüyünü gözün ilə
Söyləmə sən sözün ilə,
Ondan sonra bizim ilə
Olasan mehman dedilər.

Düşmə dünya möhnətinə,
Talib ol haqq həzrətinə,
Abi-Zəmzəm şərbətinə
Barmağını bən dedilər.

Şeyx Xətayi, nədir halın?
Haqqa şükr et, qaldır əlin.
Qeybətdən kəsə gör dilin,
Hər qula yeysən dedilər.

## VARSAĞILAR

***

Vücudim şəhrin seyr edib gəzərim,
Didar ilə məhəbbətə eşq olsun.
Həmən bir nəsnədə qaldı nəzərim,
Didar ilə məhəbbətə eşq olsun.

Eşqin cuş eylədi, keçdi sərimdən,
Artıb gəlir məhəbbətin nurindən,
Niyazımız budur cani-kərimdən:
Didar ilə məhəbbətə eşq olsun.

Qüdrət qəndilindən atdı danəyi,
Endi lövhi üzrə tutdu binayi,
Cünbüşə gətirən çərxi-fənayi
Didar ilə məhəbbətə eşq olsun.

Fil yükün yüklətmə, qarınca çəkməz,
Dürlü reyhan çoxdur, gül kimi qoxmaz,
Dünya malın versən, bizə gərəkməz,
Didar ilə məhəbbətə eşq olsun.

Yucalarda olur ol hüma quşu,
Dostum, məhəbbətdir aşiqə işi,
Pirim Xətayidir cümlənin başi,
Didar ilə məhəbbətə eşq olsun.

***

Bir gözəlin vücudunun şəhrinə,
Bax, nəzər eylə də həmən arif ol.
Dükanında dedigin mətaına
Bax, nəzər eylə də həmən arif ol.

Seyr et özgə ərənləri görəsin,
Təbib sarar yürəgimin yarəsin.
Çərb eyləmə məhəbbətin çırasin,
Bax, nəzər eylə də həmən arif ol.

Hərcayi gözələ qoşma başını,
Hərcayilik edib atar daşını,
Müştəri bulunsa söz qumaşını,
Bax, nəzər eylə də həmən arif ol.

Xətayim der: – Rəhm etməzəm yalana,
Özün təslim edər kəndi gələnə,
Ay Əlidir, gün Məhəmməd bilənə,
Bax, nəzər eylə də həmən arif ol.

***

Biz də xanədanə gedər der idik,
Mehman canlar, bizə səfa gəldiniz.
Hər sabah, hər sabah yüzüm üstünə,
Mehman canlar, bizə səfa gəldiniz.

Bəli dedik bir gerçəgin dəstinə,
Canım qurban olsun haqqın dostuna,
Hər sabah, hər sabah yüzüm üstünə,
Mehman canlar, bizə səfa gəldiniz.

Getdi yoldaşlarım, qaldım yalınız,
Bağçada açılır qönçə gülünüz,
Şəkər məhəbbətiz, dadlı diliniz,
Mehman canlar, bizə səfa gəldiniz.

Bayquş kimi nə bəklərsən viranı,
Şükür olsun səni bizə verəni,
Sultan Xətayinin işi, yörəni,
Mehman canlar, bizə səfa gəldiniz.

***

İçmişəm bir dolu, olmuşam ayıq,
Düşmüşəm dağlara, olmuşam geyik,
Sənə derəm, sənə, sürməli keyik,
Qaçma məndən, qaçma, avçı deyiləm.

Avçı deyiləm ki, düşəm izinə,
Qaça-qaça qanlar endi dizinə.
Sürmələr hey çəkdin qonur gözünə,
Qaçma məndən, qaçma, avçı deyiləm.

Sənə derəm, sənə, geyik ərənlər,
Bizə sevda, sənə dalğa verənlər,
Dilərəm mövladan yenməz vuranlar,
Qaçma məndən, qaçma, avçı deyiləm.

Aydır Şah Xətayim: – Uçan-qaçandan,
Zərrəcə qorxmarıq bu dadlı candan,
Gedib də'vaçı olma atana məndən,
Qaçma məndən, qaçma, avçı deyiləm.

***

Qaibdən dəlil göründün,
Dədəm, xoş gəldin, xoş gəldin.
Bizi sevib sevindirdin,
Dədəm, xoş gəldin, xoş gəldin.

İki can idik, birləşdik,
Məhəbbət qapısın açdıq,
Şükür didara irişdik,
Dədəm, xoş gəldin, xoş gəldin.

Üstümüzə yol uğratdın,
Gövhər aldın, gövhər satdın,
Ərliyni isbat etdin,
Dədəm, xoş gəldin, xoş gəldin.

Bir ağacda güllər bitər,
Dalında bülbüllər ötər,
Şahıma bərgüzar gedər,
Dədəm, xoş gəldin, xoş gəldin.

Böylə, Şah Xətayim, böylə,
Pirim dəstur versin, söylə.
Şaha məndən niyaz eylə,
Dədəm, xoş gəldin, xoş gəldin.

***

Allah-Allah den, qazilər,
Ğazilər deyən şah mənəm,
Qarşu gəlin, səcdə qılın,
Ğazilər deyən şah mənəm.

Uçmaqda tuti quşuyam,
Ağır ləşgər ər başıyam,
Mən sufilər yoldaşıyam,
Ğazilər deyən şah mənəm.

Nerdə əkərsən, bitərəm,
Xanda çağırsan, yetərəm,
Sufilər əlin tutaram,
Ğazilər deyən şah mənəm.

Mənsur ilə darda idim,
Xəlil ilə narda idim,
Musa ilə Turda idim,
Ğazilər deyən şah mənəm.

Qırmızı taclı, boz atlı,
Ağır (bir) ləşgər nisbətli,
Yusif peyğəmbər sifətli,
Ğazilər deyən şah mənəm.

Xətayiyəm, al atlıyam,
Sözü şəkərdən datlıyam,
Murtuza Əli zatlıyam,
Ğazilər deyən şah mənəm.

***

Gəl, könül, incimə bizdən,
Qalsın könül, yol qalmasın.
Əvvəl-axır yol qədimdir,
Qalsın könül, yol qalmasın.

Ərənlər bizə busudur,
Yalan söyləyən asıdır,
Bu, gerçəklər nəfəsidir,
Qalsın könül, yol qalmasın.

Baxçada açılan güldür,
Mə'nayi söyləyən dildir,
Pəs əzəldən qədim yoldur,
Qalsın könül, yol qalmasın.

Başındadır altun tacı,
Budur ərənlər me'racı,
Kəskindir yolun qılıcı,
Qalsın könül, yol qalmasın.

Ey divanə, ey divanə,
Aşiq olan qıyar canə,
Xətayi der Taclı xanə:
– Qalsın könül, yol qalmasın.

**BAYATILAR**

Xətayi, can arxına,
Əhli-ürfan arxına.
Mə’rifətdən su gəlib,
Tökülür can arxına.

Könül vermə nadana,
Haqqı inkar edənə,
Müridəm, haqq demişəm
Məhəbbət xanadana.

Xətayim der bayağı,
Atılandır bayağı,
Quşlarda nə quşu var,
Təpəsində ayağı?

Xətayiyə han gəldi,
Mürdə cismə can gəldi,
Yə’qubi-zar olmuşam,
Yusifi-Kən’an gəldi.

Xətayiyəm, xəttaram,
Həq sirrinə səttaram,
Həkimlərin dərmanı,
Təbiblərə əttaram.

Xətayiyəm bir halım,
Əlif üstündə dalam.
Sufiyəm təriqətdə,
Həqiqətdə abdalam.

Xətayim, ver cəvablən,
Qırmızı gül gülablən,
Səndən can əsirgəməm,
Zira kim, bir hesablən.

Xətayi Mehdi oldu.
İmamlar cəhdi oldu,
Gətir, getdi qəm-qüssə,
Şadilik vaxtı oldu.

Xətayi, işin düşər,
Gəlib-gedişin düşər,
Dişləmə çiy löqməni,
Yerinə dişin düşər.

# LÜĞƏT

A

*Abi-baran* – yağış suyu
*Abi-həyat* – dirilik suyu
*Afət* – bəla, gözəl
*Aftab* – günəş
*Ağaz* – başlama
*Ariz* – yanaq
*Asi* – yağı, düşmən
*Asitan* – eşik, astana, hökmdar qapısı
*Aşub* – qarışıqlıq, həyəcan
*Aşyanə* – yuva, məskən
*Ayaq* – qədəh, piyalə
*Ayat* – ayələr
*Aytmaq* – demək
A*zürdə* – incimiş, əziyyət görmüş

B

*Bab* – qapı, fəsil
*Bad* – külək
*Badeyi-həmra* – qırmızı şərab
*Badi-fəna* – fəna yeli
*Bal* – qanad
*Bala* – yüksək, yuxarı
*Baran* – yağış
*Başəd* – olsun
*Baz* – qızıl quş
*Behtər* – yaxşı
*Beytülhərəm* – Kə'bə
*Beytülhəzən* – qəm-qüssə evi
*Bədr* – bütöv ay
*Bədru* – pis üzlü

*Bəğayət* – olduqca, son dərəcədə
*Bəha* – qiymət, dəyər
*Bəhr* – dəniz
*Bəid* – uzaq, yad
*Bəir* – dəvə
*Bəkləmək* – gözləmək
*Bənaguş* – sırğa
*Bəndəkirdar* – tutulmuş qul
*Bərgi-lalə* – lalə yarpağı
*Bərhəm* – qarışıq, dağınıq
*Bərxurdar* – faydalanmaq
*Bərk* – yarpaq
*Bərlu* – bəri
*Bərr* – çöl, səhra
*Bəsi* – çox
*Bəşarət* – xoş xəbər, muştuluq
*Bəzm* – kef məclisi
*Bid* – söyüd ağacı
*Bida*r – oyaq
*Bihəmdüllah* – Allaha şükür
*Bimar* – xəstə
*Bolmaq* – olmaq
*Bulmaq* – tapmaq
*Busudur* – pusquda yatır
*Buy* – qoxu, iy
*Bünyad* – özül, kök
*Bünyan* – özül, bünövrə
*Bürhan* – dəlil-sübut
*Bürhanə* – çılpaq
*Bürqə* – üz örtüyü

C
*Camə* – paltar
*Canib* – tərəf, yön
*Canşikar* – yırtıcı, gözəl, can alan

*Cari* – axan, axıcı
*Castğu* – axtarmaq
*Cavidan* – əbədi
*Cay* – yer
*Cəmil* – gözəl
*Cənnətül-mə'va* – behişti mənzili
*Cibal* – dağlar
*Cinan* – cənnətlər
C*övf* – iç, içəri, oyuq, içi boş
*Cövr* – zülm
*Cu* – arx
*Cuş* – qaynamaq, coşma
*Cüda* – ayrı
*Cünbüş* – hərəkət

Ç

*Çabuq* – qıvraq, iti, yeyin
*Çah* – quyu
*Çak* – yırtıq
*Çakər* – nökər
*Çar* – dörd
Ç*arqadaq* – yalan, mənasız
*Çarşu* – iki tərəfi dükan olan bazar
*Çeşm* – göz
*Çeşmeyi-heyvan* – dirilik bulağı
*Çeşmi-fəttan* – cazibəli göz, fitnəli göz
*Çeşmi-giryan* – ağlar göz
*Çələb* – Tanrı
*Çəng* – musiqi aləti
*Çərxi-kəcrov* – əyri dolanan zəmanə
*Çin* – düz, doğru, qıvrım
*Çisinki* – yağış çisələməsi
*Çub* – çubuq, ağac, çöp
*Çunü çəra* – niyə, nə üçün
*Çü* – indi ki, kimi

D

*Dal* – budaq, hərf adı
*Dam* – tor, tələ
*Damən* – ətək
D*amızlıq* – şirə
*Damu* – cəhənnəm
*Darüssəlam* – dinclik evi, cənnət; Nəcəf şəhərinin adı
D*arüşşəfa* – şəfa evi, xəstəxana
*Dersən* – deyirsən
*Dəgmə* – təsadüfi, hər yetən
*Dəhan* – ağız
*Dəlq* – dərviş paltarı, yoxsul geyim
*Dəqq* – üzülmə, vərəm
*Dəndan* – diş
*Dərban* – qapıçı
*Dərdəm* – dərhal
*Dərun* – iç, ürək
*Dəst* – əl
*Dəstar* – çalma, sarıq, əmmamə
*Dəstgir* – əldən tutan, köməkçi
*Dəşt* – çöl
*Dəvvar* – dövr edən
*Didar* – görüş, üz
*Didə* – göz
D*il* – ürək
*Dilaram* – ürək dincliyi, gözəl
*Dilbəstə* – vurğun, aşiq
*Dilfikar* – ürəyi yaralı
D*ilgüşa* – ürəkaçan
*Dilxun* – ürəyi qan
*Dili-şeyda* – vurğun ürək, sevən könül
*Dilrüb*a – gözəl, könülalan
*Dilstan* – ürək alan
*Dilşikəstə* – ürəyi sınıq
*Dimağ* – burun, beyin

*Diriğ* – heyf
*Dişra* – xaric
*Doxtər* – qız
*Dozan* – ov quşunun bir növü
*Du* – iki
*Dud* – tüstü
*Dun* – alçaq
*Dur* – uzaq
*Dün* – dünən, gecə
*Dürəfşan* – inci saçan
*Dürr* – inci
*Düş* – yuxu, röya

E

*Ehtiraz* – çəkinmə, ehtiyat
*Espir* – ov quşunun bir növü
*Eşik* – qapı, həyət
*Eyd* – bayram
*Eyn* – göz, hərf adı

Ə

*Əbabil* – dağ qaranquşu
*Əbr* – bulud
*Əbri-neysan* – yağmurlu bulud
*Əbru* – qaş
*Əbsəm* – lal, danışmamaq
*Ədd* – say, sayma
*Ədna* – alçaq
*Əfkar* – yaralı
*Əflak* – fələklər
*Əfşan* – saçan, səpən
*Əhmər* – qırmızı
*Əxtər* – ulduz
*Əxzər* – yaşıl

*Əkməl* – çox yetkin, ən kamallı
*Əqiq* – dəyərli qırmızı daş
*Əqval* – sözlər, danışıqlar
*Əlddəvam* – daimi olaraq
*Ələm* – dərd, qəm
*Ələst* – ilk gün, insanların ilk yaradılış günü
*Əltaf* – lütflər
*Ə'ma* – kor
*Ənar* – nar
*Ənban* – yol dağarcığı, dəri
*Ənbiya* – nəbilər, peyğəmbərlər
*Əndəlib* – bülbül
*Əndişə* – fikir
*Ənədi* – axta etdi
*Ənəlhəq* – haq mənəm, gerçək mənəm
Ə*r'ər* – ardıc, sərv ağacı
*Ərkan* – qaydalar, rüknlər
*Ərus* – gəlin
*Əsən* – sağ
*Əsəndi* – sağlamı, ağıllısı
*Əspir* – quş adı
*Əsrar* – sirlər
*Əsriyib* – qızıb, qızışıb, azıb
*Əsrük* – sərxoş
*Əşk* – göz yaşı
*Əts* – asqırmaq
*Əttar* – ətir satan
*Əzazil* – şeytan
*Əzm* – bir işə girişmək üçün edilən qəsd, qərar

F

*Faxtə* – qumru, çöl göyərçini
*Farıyıb* – usanıb, zəifləyib
F*ariqülbal* – asudə, dinc
*Fasid* – araqarışdıran, pozğun

*Fəəramuş* – unudulmuş, unutmaq
*Fəraqnamə* – ayrılıq məktubu
*Fərda* – sabah
*Fərəs* – at
*Fərxəndə* – uğurlu
*Fərraşi-sün'*– yaradanın xidmətçisi
*Fərrux* – mübarək, uğurlu
*Fərzənd* – övlad
*Fəttan* – fitnəkar, cazibəli
*Fəzl-fəzilət* – dəyər, üstünlük, bilik
*Filcümlə* – sözün qısası, xülasə
*Firdov*s – behişt
*Firiştə* – mələk, çox gözəl
*Firqət* – ayrılıq
*Fitva* – qərar, hökm
*Fovt* – ölmək
*Fürqət* – ayrılıq
*Füzul* – uzunçu, yersiz danışan

G

*Gənc* – xəzinə
*Gərdiş* – dolanma, gəzinti
*Gərm* – isti
*Gəşt* – gəzinti, gəzmə
*Gird* – çevrə, dolanma
*Giriftar* – tutulmuş
*Giryə* – ağlama
*Guş* – qulaq
*Guş qılmaq* – eşitmək, qulaq asmaq
*Guy* – söz, danışıq
*Güftar* – danışıq
*Gühərbar* – gövhərsaçan
*Gülrux* – gül üzlü
*Gümrah* – yoldan azmış
*Güvah* – şahid

H

*Haşəllah* – Allah göstərməsin
*Hatif* – qeybdən gələn səs, qışqıran, səslənən
*Hezar* – min
*Həbib* – dost
*Həmil* – dözümlü
*Həml* – yük
*Həmra* – qırmızı, al
*Həmsayə* – qonşu
*Həmta* – bənzər, oxşar
*Hərgiz* – heç vaxt
*Hərim* – məhrəm yer
*Həyy* – diri
*Həyyi-baqi* – əbədi dirilik
*Həzl* – həcv
*Hicab* – örtük, pərdə, utanma
*Hic*r – ayrılıq
*Hilal* – aypara
*Höqqə* – kiçik qutu
*Hübab* – su qabarcığı
*Hüllə* – geyim, ipək paltar
*Hümay* – cənnət quşu, dövlət quşu
*Hümayun* – uğurlu, mübarək, padşaha məxsus
*Hüsn* – gözəllik
*Hüveyda* – bəlli, aşkar

X

*Xab* – yuxu
*Xak* – torpaq
*Xamə* – qələm
*Xamuş* – susmaq, sönmək
*Xancaru* – hansı tərəfə
*Xarə* – çaxmaq daşı, bərk daş
*Xarü xəs* – tikan və çöp

*Xas* – seçilmiş
*Xatəm* – üzük
*Xədəng* – ox
*Xəffaş* – yarasa
*Xəm* – əyri, əyilmiş, bükülmüş
*Xəmidə* – əyri, bükülmüş
*Xəmr* – şərab
*Xəndan* – gülən
*Xərguş* – dovşan
*Xəsm* – düşmən
*Xətt* – yanaq, yazı
*Xəyyat* – dərzi
*Xirədmənd* – ağıllı
*Xiş* – yaxın, qohum
*Xişm* – acıq
*Xod* – öz
*Xub* – yaxşı
*Xublar* – gözəllər
*Xocəstə* – xoşbəxt
*Xoşgüvar* – ləzzətli, dadlı
*Xu* – xasiyyət
*Xum* – küp
*Xun* – qan
*Xunbar* – qan yağdıran
*Xunbəha* – qan bahası
*Xunxar* – qaniçən
*Xurşid* – günəş
*Xülq* – təbiət, xasiyyət
*Xürrəm* – şad
*Xüşk* – quru

İ

*İctinab* – çəkinmək
*İxlas* – sevgi, səmimiyyət
*İkram* – hörmət, təzim

*İqlim* – ölkə
*İlla* – ancaq, savayı, başqa
*İltər* – yetər, çatar
*İmruz* – bu gün
*İnan* – cilov
*İnfial* – utanmaq
*İradət* – istək, dilək
*İrişmək* – çatmaq, yetmək
*İrşad* – doğru yol göstərmə, öyüd vermə
*İsar* – bəxşiş, bəyənmə, seçmə
*İsqat* – düşürmə, aşağı atma
*İştiyaq* – istək, arzu
*İtab* – acıq, danlama

K

*Kah* – saman
*Kax* – qəsr, saray
*Kan* – mədən
*Kar* – iş
*Katibi-təqdiri-ləmyəzl* – Allahın qismət yazan katibi
*Keyik* – maral
*Keyvan* – Zühəl ulduzu, Saturn ulduzu
*Kəfş* – başmaq
*Kəminə* – aciz, ən kiçik
*Kəmtər* – lap az, azacıq, etibarsız
*Kəmtərin* – ən həqir, ən kiçik, ən əskik
*Kəndi* – özü
*Kərim* – səxavətli
*Kəşti* – gəmi, qayıq
*Kibr* – məğrurluq, qürurluq
*Kirdar* – iş, əməl
*Kişvər* – ölkə
*Kömlək* – köynək

*Kövkəb* – ulduz
*Kövn* – varlıq, əmələ gəlmə, var olma
*Kuh* – dağ
*Kuy* – yaşayış yeri
*Küfr* – inamsızlıq, kafirlik
*Külbə* – daxma, kasıb evi
*Külxan* – hamamın od qalanan yeri, tulanbar
*Kün-fəkan* – dünya, aləm

Q

*Qaim* – möhkəm, bərk
*Qal* – danışıq, mübahisə
*Qalə* – söz, demək
*Qamu* – hamı
*Qanda* – harada
*Qaranqu* – qaranlıq
*Qatında* – yanında
*Qəba* – üst paltarı, qaba
*Qəbih* – çirkin
*Qəhr* – acıq, kədər
*Qəllaş* – əliaçıq, müflis
*Qəmər* – ay
*Qəmküsar* – qəm dağıdan
*Qəndil* – çilçıraq
*Qəramət* – cərimə, zərəri, ödəmə
*Qərz* – borc
*Qətreyi-baran* – yağış damcısı
*Qəvvas* – üzgüçü
*Qəzal* – ceyran
*Qəzənfər* – şir, igid
*Qırtas* – ağ kağız
*Qondum-qanuldum* – məskən saldım, qonaq olub danışdım
*Qutlu* – mübarək, uğurlu
*Qüllab* – qarmaq, çəngəl

L

*La* – yox
*Lacərəm* – yəqin, şübhəsiz
*Laf* – söz, danışıq
*Lala* – parlaq, cilalı
*Laləüzar* – lalə yanaq
*Layəzal* – əbədi, həmişəlik
*Leylətül-əsra* – əsra gecəsi, dini rəvayətə görə Məhəmmədin meraca getdiyi gecə
*Leylətül-qədir* – qədir gecəsi
*Leyli-yelda* – qışın ən uzun gecəsi
*Leylü-nəhar* – gecə-gündüz
*Ləb* – dodaq
*Lə'l* – qırmızı qiymətli daş
*Ləm'ə* – parıltılı
*Ləntərani* – görə bilməzsən
*Lərzan* – titrək
*Ləşkər* – qoşun
*Lö'löyi-həmra* – qırmızı inci

M

*Mah* – ay
*Manənd* – bənzər, tay
*Mar* – ilan
*Mehr* – günəş
*Mehrab* – məsciddə qiblənin istiqamətini göstərən dairəvi yer
*Meyku*n – şərab kimi qırmızı
*Məal* – məna, məfhum
*Məani* – mənalar
*Mə'bud* – büt, Tanrı
*Mədəd* – kömək
*Mədh* – tərif
*Mədyun* – borcu olan, minnətdar
*Məğbun* – yarımamaq

*Məh* – ay
*Məhcur* – unudulmuş, uzaqlaşmış
*Məhfuz* – qorunmuş
*Məhin* – böyük, gözəl
*Məhluqa* – ay üzlü
*Məhru* – ayüzlü
*Məhtab* – ay işığı
*Məxzən* – xəzinə, anbar
*Məqal* – söz
*Məqrun* – yaxın
*Məlamət* – danlaq, qaxınc
*Məmat* – ölüm
*Məmnun* – gizli, qapalı
*Mə'mu*r – abad
*Mən'* – qadağan etmə
*Məndil* – yaylıq
*Mənqul* – köçürülmüş, yayılmış
*Mənquş* – nəqşlənmiş
*Mənqəbə* – mədh, tə'rif
*Mənna* – mərhəmət
*Mərdud* – rədd edilmiş
*Mərdüm* – xalq, göz bəbəyi
*Mərdümi* – kişilik
*Mərğ* – çəmən
*Mərkəb* – minik
*Mərz* – sərhəd, hüdud, yer
*Məsturə* – bakirə
*Məşam* – burun, iy bilmə üzvü
*Məşşatə* – zinət verən, gəlini bəzəyən qadın
*Mətali-raykani* – ucuz əmtəə
*Mə'va* – yurd
*Məvali* – sahiblər, hamilər, dostlar
*Məyub* – nöqsanlı, şikəst
*Məzhər* – təzahür, yetişmə
*Mə'zul* – işdən qovulmuş
*Mə'zur* – üzürlü

*Minu* – cənnət
*Mir'at* – güzgü
*Möhriq* – yandıran
*Mövla* – ağa, yiyə
*Mu* – saç, tük
*Mur* – qarışqa
*Mübərra* – xalis, saf, təmiz
*Müdam* – davamlı, həmişə
*Müddəl* – iddiaçı, rəqib
*Müənbər* – ətirli
*Müəttər* – ətirli
*Müəzzin* – azançı
*Müftah* – qəsrin açarı
*Mühəddis* – hədis söyləyən
*Mühəqqəq* – doğru, gerçək
*Mükərrər* – dəfələrlə
*Müqim* – oturan, yaşayan
*Mül* – şərab, çaxır
*Münafat* – əkslik, ayrılıq, uyğunsuzluq
*Münafiq* – günahkar, düşmən
*Münəvvər* – işıqlı
*Münəzzəh* – günahsız, xatasız
*Münzil* – endirən
*Münkir* – inkar edən, danan
*Mürdə* – ölü
*Mürəbbi* – tərbiyəçi
*Mürəffəq* – yaxın yoldaş
*Mürəssə* – qiymətli daş-qaşla bəzədilmiş
*Mürğ* – quş
*Mürği-dil* – könül quşu
*Mürği-hərim* – məhrəm quşu
*Mürüvvət* – mərdlik, insanlıq
*Müsəffa* – saflaşdırılmış
*Müsəxxər* – alınmış, zəbt olunmuş
*Müsəlla-dua* – yeri, mərasim yeri
*Müsənna* – ikili, iki hissə

*Müshəf* – Quran
*Müstəmənd* – yazıq, dərdli
*Müşəvvəş* – qarışıq, həyəcanlı
*Müşkəfşan* – ətir, saçan
*Müşt* – yumruq
*Müştaq* – istəyən, arzulayan
*Müzəyyən* – bəzəkli, zinətli

N

*Nabak* – qorxusuz
*Nabina* – kor
*Naciz* – azacıq, dəyərsiz
*Nafə* – ahunun göbəyi
*Nahid* – Zöhrə ulduzu
*Nam* – ad
*Naseh* –nəsihət verən
*Na*r – od
*Nari-səqər* – cəhənnəm odu
*Natəvan* – gücsüz
*Navək* – ox
*Neşə* – necə
*Nə xab dər çeşm* – nə gözdə yuxu
*Nəcük* – necə
*Nəfx* – üfürmə
*Nəqşi-üzar* – üzün nəqşi
*Nəmitəvanəm* – bacarmıram
*Nəsnə* – şey
*Nəstərən* – itburnu, ağ rəngli çiçək
*Nəzar* – dərdli, qəmli
*Nigar* – sevgili, bəzəkli
*Nigari*-məhru – ay üzlü sevgili
*Nigari-tənnaz* – gözəl sevgili, nazlı gözəl
*Nigəhban* – gözətçi
*Nigəhdar* – gözətçi, qoruyan
*Nihan* – gizli

*Nik* – yaxşı
*Nikbət* – fəlakət, bədbəxtlik
*Nikuxah* – yaxşılıq istəyən
*Niqab* – üz örtüyü
*Nisar* – saçma, dağıtma
*Niş* – iynə, tikan
*Nizul* – enmək
*Noh fələk* – doqquz fələk, doqquz göy
*No*v – təzə, yeni
*Novcəvan* – yeniyetmə
*Nuri-didə* – göz işığı
*Nuri-rəhman* – ilahi nur
*Nüzul* – düşmə, enmə

O

*Oldum çü vüquf* – elə ki, xəbərdar oldum
*Ovraq* – vərəqlər
*Ovsaf* – vəsflər, tariflər

P

*Pasiban* – gözətçi
*Pay* – ayaq
*Payan* – son
*Payəndə* – əbədi
*Peyda* – aşkar, tapılmış
*Peyğam* – sifariş
*Peyk* – qasid, xəbər aparan
*Peykan* – oxun ucu
*Peymanə* – qədəh, piyalə
*Peyvəstə* – daimi, bitişik
*Pənd* – nəsihət
*Pərdəpuş* – örtülü, gizli
*Pəripeykə*r – bədəni pəri kimi, gözəl bədənli
*Pərtov* – işıq, parlaqlıq

*Pərva* – qorxu, rəğbət
*Pərvərda* – bəslənmiş
*Pərvərdiga*r – yaradan
*Pəyam* – sifariş
*Piçidə* – əymək, dolaşdırmaq
*Piçü tab* – qarmaqarışıqlıq, qıvrımlıq
*Pir* – qoca
*Pirahən* – köynək
*Piş* – qabaq
*Pitik* – yazı
*Piyaləgir* – piyalə tutan
*Puş* – geymək, örtmək
*Pür* – dolu
*Pürbəha* – dəyərli, qiymətli
*Pürxun* – qanla dolu
*Püşt* – arxa, dal, geri

R

*Rahin* – axıcı, gedən
*Raygan* – ucuz, müftə
*Raz* – sirr
*Razi-dil* – ürək sirri
*Rəhman* – şəfqətli, rəhmli
*Rəhn* – girov
*Rəhnüm*a – yol göstərən
*Rəxşan* – parlaq
*Rəxt* – paltar
*Rək* – damar
*Rə'na* – gözəl
*Rənc* – əziyyət
*Rəncur* – incimiş
*Rəvan* – həyat, diri, axan, gedən, ruh, can
*Rəz* – tənək, meynə
*Rəzm* – döyüş
*Rih* – yel, yel ağrısı

*Rikab* – minik, üzəngi
*Rind* – xərabət əhli, kefcil adam
*Riştə* – sap, tel, əlaqə
*Rizvan* – behişt, behişt qapısı
*Rövzeyi-darüssəlam* – cənnət bağı
*Ruhülqüds* – müqəddəs ruh, Isa peyğəmbərin ləqəbi
*Ruxsar* – yanaq, üz
*Ruy, ru* – üz
*Ruzü şəb* – gecə-gündüz
*Rüx* – üz

S

*Saiqə* – ildırım
*Saqın* – qorun
*Salus* – hiyləgər
*Savlu* – gözəl
*Savul* – çəkil, get
*Sayə* – kölgə
*Sayru* – xəstə
*Salagər yola* – başa sal, yola gətir
*Seyd* – ov
*Səbəq* – dərs, yarışda mükafat
*Səbu* – bardaq, kuzə
*Səbük* – yüngül
*Səbül-məsani* – Qur'anın fatihə surəsinin yeddi ayəsi
*Səd* – yüz
*Səd hezar* – yüz min
*Səddəq* – düz demişdir, düzdür
*Səhn* – səhnə, həyat, meydan
*Səxt* – bərk, möhkəm
*Səqər* – cəhənnəm
*Səlavat* – namaz, dua, dəfn günü oxunan münacat
*Səlasil* – zəncir
*Səm* – eşitmə, qulaq asmaq
*Səna* – dua

*Sənciləyin* – sənin kimi
*Səng* – daş
*Sərbaz* – əsgər
*Sərbəsər* – başdan-başa
*Sərd* – soyuq
*Sərfərz* – başıuca, başqalarından seçilən
*Sərgərdan* – avara, sərsəri
*Sərgəştə* – çaşmış, başını itirmiş
*Sərkar* – başçı, böyük
*Sərzəniş* – danlaq, qaxınc
*Səttar* – eyibləri örtən
*Səvadi-mərdüm* – göz qorası
*Sibi-zənəxdan* – alma, çənə
*Sim* – gümüş
*Simtən* – gümüş bədən
*Sirab* – doymuş
*Sirri-əf'al* – işlərin sirri
*Sitarə* – ulduz
*Sitr* – örtü, pərdə, utancaqlıq
*Siyah* – qara
*Siyahkar* – günahkar
*Sövt* – səs
*Su* – yön, tərəf
*Suç* – günah
*Sud* – fayda
*Sufi-səqərlat* – sufilərin geydiyi yun paltar
*Sunma*q – əl vurmaq, təqdim etmək
S*uz* – yanma
*Sübhan* – Allah
*Sübhan əlləzi üsri beəbdöh-zəlil* – qulu olduğum Allaha şükür olsun
*Süfat* – tərif, keyfiyyət
*Süxən* – söz
*Süxəndan* – danışığını bilən
*Sün'* – yaratmaq
*Sürahi* – uzun boğazlı şərab şüşəsi

Ş

*Şahbaz* – tərlan, şahin
*Şahid* – gözəl
*Şanə* – daraq
*Şar* – şəhər, qəsəbə
*Şayəd* – ola bilsin ki
*Şeyda* – vurğun
*Şəb* – gecə
*Şəbistan* – yataq otağı, hərəmxana
*Şəbnəm* – şeh
*Şəcər* – ağac
*Şəfiq* – ürək-dirək verən
*Şəhvar* – şaha layiq
*Şəmayi*l – surət, təbiət
*Şəmal* – surət, şəkil
*Şəmsi-xavəri* – Şərq günəşi
*Şərməndə* – utanan, xəcalət
*Şərmsar* – utancaq
*Şol* – o
*Şöhrə* – şöhrət
*Şu* – bu
*Şux* – gözəl
*Şuridə* – qarışıq, vurğun
*Şükufə* – çiçək
*Şümar* – say

T

*Tab* – güc, qüvvət, işıq
*Taban* – parlaq
*Tahir* – saf, təmiz
*Tal* – budaq
*Talib* – tələb edən, istəyən
*Tanə* – sırğa
*Tapança* – şillə

*Tar* – qaranlıq
*Teyr* – quş, uçan
*Təalallah* – Allah yüksəkdir
*Təbah* – puç
*Təbərra* – uzaqlaşmaq, uzaq durmaq
*Təbdil* – dəyişdirmək
*Təcəlla* – görünmə, üzə çıxma
*Təcəlliyi-zat* – Allahın görünməsi
T*əfərrüc* – gəzinti, qəm-qüssəni dağıtma
*Təhəyyü*r – heyrətlənmək
*Təhrir* – yazmaq
*Təxəllüf* – boyun qaçırmaq
*Təqrir* – söyləyib anlatma, yerləşdirmə
*Təlx* – acı
*T*ən – bədən
*Təngə* – pul
*Tərəb* – şadlıq, sevinc
*Tərəhhüm* – rəhm etmək, birisinə acımaq
*Tərh* – atmaq, qaralama, layihə
*Təriq* – yol, cığır
*Təşnə* – susuz
*Təvəccöh* – qayğı, rəğbət
*Tə'viz* – nəzər duası, gözmuncuğu, tilsim
*Təzərv* – qırqovul
*Təzyin* – zinətli
*Tiğ* – qılınc
*Timar* – xəstəyə baxmaq
*Tin* – palçıq
*Tir* – ox
*Tirə* – qaranlıq
*Tirəndaz* – oxatan
*Tiz* – iti
*Tovfiq* – kömək, uyğunlaşdırma
*Tovhid* – Allahın birliyi
*Tovsən* – yaxşı yeriyən, başıbərk at
Törə – qayda-qanun

*Tuba* – cənnət ağacı
*Tuğra* – gerb, dövlət nişanı
*Tutuq* – örtük, pərdə
*Türab* – torpaq
*Türrə* – birçək, tel

U

*Uçmaq* – behişt
*Uğraşmaq* – çatmaq, sataşmaq
*Ulaşmaq* – yetişmək, çatmaq
*Urmaq* – vurmaq
*Us* – ağıl, zəka
*U*ş – belə
*Uşatmaq* – sındırmaq
*Uyxu* – yuxu

Ü

*Üqab* – qartal
*Üqba* – axirət, o biri dünya
*Ümmət* – kütlə, xalq
*Ümmül-kitab* – kitab anası
*Ürfan* – mistika, bilik, Allahı anma
*Üryan* – çılpaq
*Üstiva* – orta xətt
*Üstüxan* – sümük
*Üyu*b – eyblər
*Üza*r – yanaq

V

*Vallah* – Allaha and olsun
*Vayə* – nəsib, pay, məqsəd
*Vey* – o

*Vəch* – səbəb, üz
*Vəhşət* – qorxma, vəhşilik
*Vəhy* – bir fikrin, hökmün Allah tərəfindən xəbər verilməsi
*Vəli* – ancaq, lakin
*Vərd* – gül, ağac çiçəyi
*Vərdi-əhmər* – qırmızı gül
*Vərtə* – təhlükə
*Vəsl* – qovuşmaq
*Vird* – bir duanı həmişə söyləmək

Y

*Yağı* – çöl, səhra
*Yahu* – ay Allah, ey bura bax
*Yaqut* – qırmızı rəngli daş
*Yaran* – yoldaşlar, köməkçilər
*Yasayi* – qanun-qaydanı
*Yek* – tək, bir
*Yeksa*n – bərabər, düz
*Yekta* – yalnız, misilsiz
*Yelda* – qışın ən uzun gecəsi
*Yerən, yermək* – xoşa gəlməz, xoşlanmamaq
*Yey* – yaxşı, gözəl
*Yəd* – əl, kömək
*Yoldurmu*ş – başa çatdırmış
*Yular* – yüyən
*Yüküş* – çox, bol

Z

*Zad* – doğulmuş
*Zağ* – qara qarğa
*Zehi* – nə yaxşı, nə gözəl
*Zəbun* – zəif, əldən-ayaqdan düşmüş
*Zəcr* – əziyyət, əzab

*Zəxm* – yara
*Zənbur* – arı
*Zənəxdan* – çənə çuxuru, buxaq
*Zənəx* – çənə
*Zəval* – bəla, məhv olma
*Ziba* – gözəl
*Zikr* – anma, söyləmə
*Zill* – kölgə
*Zilli-sübhan* – Allah kölgəsi
*Zillullah* – Allahın kölgəsi
*Zilü bəm* – yüksək və alçaq
*Zində* – yaşayan, diri
*Zindəganlıq* – yaşayış, həyat
*Zinəq* – yanaqda olan çuxur
*Zinhar* – saqın, aman
*Zöhd* – pəhrizkarlıq
*Zud* – tez
*Zurəğ* – qayıq
*Zülal* – saf su, sağlam, təmiz
*Zülcəlal* – əzəmətli, cəlallı

# MÜNDƏRİCAT

| | |
|---|---|
| Buraxılışa məsul: | *Əziz Güləliyev* |
| Texniki redaktor: | *Rövşən Ağayev* |
| Tərtibatçı-rəssam: | *Nərgiz Əliyeva* |
| Kompyuter səhifələyicisi: | *Aslan Almasov* |
| Korrektor: | *Pərinaz Səmədova* |

Yığılmağa verilmişdir 18.08.2004. Çapa imzalanmışdır 23.01.2005.
Formatı 60x90 $^{1}/_{16}$. Fiziki çap vərəqi 24. Ofset çap üsulu.
Tirajı 25000. Sifariş 13.

Kitab “PROMAT” mətbəəsində çap olunmuşdur.